# BÖYÜK ŞİRKDƏ CƏHALƏT

## MƏSƏLƏSİNDƏ DƏVƏT İMAMLARININ SÖZLƏRİNƏ ƏLAVƏ

ŞEYX ALİ İBNİ XUDAYR ƏL-XUDAYR

Tərcümə etdi: MAHMUD TALİB

# BÖYÜK ŞİRKDƏ CƏHALƏT

## MƏSƏLƏSİNDƏ DƏVƏT İMAMLARININ SÖZLƏRİNƏ ƏLAVƏ


**HAZIRLADI:**

**ŞEYX ALİ İBNİ XUDAYR ƏL-XUDAYR**


Allah onu, valideynlərini, əhlini və şeyxlərini, tələbələrini və bütün müsəlmanları əfv etsin!


**əl-Qasim – Bureydə**

*Tərcümə etdi:*

**MAHMUD TALİB**

# Tərcüməçinin ön sözü

Qiyamət günü ***“Biz budan qafil idik”*** deməmələrindən ötrü Adəm övladlarının bellərindən zürriyyətlərini çıxardıb öz nəfslərinə şahid tutaraq ***“Mən sizin Rəbbiniz deyiləmmi”***[1] deyərək onlardan əhd alan Allaha sonsuz həmdlər olsun. ***“Kim Allaha heç bir şeyi şərik qoşmadan ölərsə cənnətə girər, kim də Allaha şərik qoşduğu halda ölərsə cəhənnəmə girər”***[2] deyən, rəsulların sonuncusu Muhəmməd səllallahu aleyhi və səlləmə salat və salam olsun!

Allah azzə və cəllə müqəddəs kitabında insanları və cinləri yalnız Ona ibadət etsinlər deyə yaratdığını bildirmişdir:

***“Mən cinləri və insanları yalnız mənə ibadət etsinlər deyə yaratdım”*** **(Zariyat, 56)**

Əziz və hikmət sahibi olan Uca Allah hələ insanlar dünyaya gəlməzdən öncə, atalarının bellərində ikən onların ruhlarından Onun rəbliyinə şahid tutaraq əhd almışdır.

***“Bir vaxt Rəbbin Adəm övladlarının bellərindən zürriyyətlərini çıxardıb öz nəfslərinə şahid tutaraq soruşmuşdur: “Mən sizin Rəbbiniz deyiləmmi” Onlar da demişdilər: “Bəli, Rəbbimizsən!” (Biz bunu) qiyamət günü “Bundan qafil idik!” və ya “Daha öncə atalarımız (Allaha) şərik qoşdu və biz də onlardan sonra gələn bir nəsil idik. Bizi batil əhlinin etdiklərinə görəmi həlak edəcksən?” deməməyiniz üçün etdik.”*** **(Əraf, 172-173)**

Misaq ayəsi adlanan bu ayələrdə Allahu təala insan övladının dünyada ikən Allaha şərik qoşduğu əməllərdə cahil olmalarının onlar üçün qiyamət günü üzr sayılmayacağını açıq şəkildə bildirmişdir. Burada Allahu təala nə onların qafil (yəni cahil) olmalarını, nə də öz atalarını təqlid etmələrini üzrlü saymamışdır. Bununla yanaşı qullarına qarşı çox mərhəmətli olan Allah azzə və cəllə zaman-zaman elçilər göndərərək onları xəbərdar etmişdir.

***“Biz elçiləri müjdələyici və qorxuducu olaraq göndərdik ki, insanların elçilərdən sonra Allaha qarşı bir bəhanəsi qalmasın. Allah Əzizdir və hikmət sahibidir!”*** **(Nisa, 165)**

***“Biz, elçi göndərməmiş (heç bir qövmə) əzab etmərik”*** **(İsra, 15)**

Artıq peyğəmbərlərdən sonra heç kimsənin bir üzrü yoxdur və bütün peyğəmbərlərin göndəriliş məqsədi bu idi: yalnız Allaha ibadət etməyə çağırmaq, şirki yox etmək, ondan və əhlindən, tağutlardan və ona ibadət edənlərdən çəkindirmək.

***“And olsun ki, biz hər bir ümmətə Allaha ibadət edin, Tağutdan çəkinin deyə elçi göndərdik.”*** **(Nəhl, 36)**

---

[1] Əraf surəsi, 172-173
[2] Səhihu Müslim: (93)

Rəhim və Rauf olan Allah azzə və cəllə Qurani Kərimdə bütün peyğəmbərlərin qövmlərini cahillər olaraq vəsf etmişdir və onların etdikləri əməlləri də cahillik adlandırmışdır. Ancaq buna baxmayaraq onların cəhalətlərini üzrlü saymamışdır. **Nuh** (aleyhissəlam)-ın qövmü haqqında bu cür demişdir:

***“(Nuh dedi ki) "Ey qövmüm! Mən sizdən buna qarşılıq bir mal istəmirəm. Mənim əcrim yalnız Allaha aiddir və mən iman edənləri (yanımdan) qovan deyiləm. Həqiqətən də onlar Rəblərinə qovuşacaqlar. Lakin mən sizin cahillik edən bir qövm olduğunuzu görürəm."”*** **(Hud, 29)**

**Saleh** (aleyhissəlam)-ın qövmü haqqında isə bu cür demişdir:

***“Dedi ki: "Onun elmi yalnız Allah qatındadı və mən göndərildiyim şeyi sizə təbliğ edirəm. Lakin mən sizin cahillik edən bir qövm olduğunuzu görürəm."”*** **(Əhqaf, 23)**

**Lut** (aleyhissəlam)-ın qövmü haqqında isə bu cür demişdir:

***“(Lut dedi) "Siz həqiqətən də qadınları qoyub şəhvətlə kişilərə gedəcəksinizmi? Xeyr! Siz cahillik edən bir qövmsünüz"”*** **(Nəml, 55)**

**Şuayb** (aleyhissəlam)-ın qövmü haqqında isə bu cür demişdir:

***“Dedilər ki: "Ey Şuayb! Biz sənin dediklərinin çoxunu anlamırıq. Həqiqətən də, biz səni içimizdə zəif bir kimsə olaraq görürük. Əgər sənin aşirətin olmasaydı, səni rəcm edərdik. Və sən bizim yanımızda əziz birisi də deyilsən"”*** **(Hud, 91)**

Onların Şuaybın dediklərini anlamaması və fəhm etməmələri Allah qatında üzrlü sayılmadı: ***“(Əzab) əmrimiz gəldiyi vaxt Şuaybı və onunla birlikdə iman edənləri öz tərəfimizdən bir rəhmət ilə qurtardıq. Zülm edənləri isə qorxunc bir səs bürüdü və öz yurdlarında diz üstə çöküb qaldılar”*** **(Hud, 94)**

Peyğəmbərlərin cahilliklə ittham etdikləri qövmlərinin cəhaləti Allah qatında onlar üçün bir üzr olmadı, əksinə cəhalətləri ilə bərabər əzaba layiq oldular. Çünki Allah şirkin bütün əməlləri yox etdiyini bildirmiş və onu heç vaxt bağışlamayacağına hökm vermişdir:

***“De ki: "Ey cahillər! Mənə Allahdan başqasınamı ibadət etməyi əmr edirsiniz?" (Ya, Rəsulum!) And olsun ki, sənə və səndən öncəkilərə vəhy etdik ki: Əgər (Allaha) şərik qoşsan bütün əməlin puç olacaq və sən mütləq ziyan çəkənlərdən olacaqsan”*** **(Zümər, 64-65)**

***“Şübhəsiz ki, Allah Ona şərik qoşanları bağışlamaz və dilədiyi kimsəyə bundan başqa olan günahları bağışlar. Kim Allaha şərik qoşarsa, artıq böyük bir günahla iftira etmişdir.”*** **(Nisa, 48)**

Uca Allah müqəddəs Kitabı olan Qurani Kərimdə başdan sona kimi şirk qoşanların cəhalətini üzrlü saymamşdır. Həmçinin Allahın Rəsulu Muhəmməd (səllallahu aleyhi və səlləm) pak sünnəsində şirk qoşan cahilləri üzrlü saymamışdır. Həm Kitabda, həm də Sünnədə şirk qoşana cənnətin haram olduğunu bildirilmişdir. Hətta Allah Rəsulu

(səllallahu aleyhi və səlləm) kiçik şirkdə belə səhabəni üzrlü saymamışdır. Bir gün xəstəlik səbəbi ilə qoluna halqa bağlayan bir səhabə görür və ondan bunun nə olduğunu soruşur. O da cavabında taqətsizik və zəiflik gətirən xəstəlik səbəbi ilə bağladığını bildirincə Allah Rəsulu bu cür deyir:

***“Çıxart onu, o sənin xəstəliyini artırmaqdan başqa bir iş görməz. Əgər o üzərində olduğun halda ölsəydin əsla qurtulmazdın”***[3]

**Şeyx Muhəmməd ibni Abdulvəhhab** *“Kitabut-Tövhid”*-də bu hədisi qeyd etdikdən sonra bu cür demişdir: ***“Əgər səhabə o, üzərində olduğu halda ölsəydi, qurtulmazdı. Burada səhabənin bu sözünə də şahid var: Kiçik şirk böyük günahlar içərisində ən böyüyüdür. Və o, cəhaləti ilə üzrlü sayılmadı”***

Sələf bu etiqad üzərində Allaha ibadət etdi və şirkin hər növündən insanları çəkindirdi. Bu hal rafizilərin qəbr şirkini ümmətin içərisinə daxil etmələrinə qədər davam etdi. **Şeyxul İslam İbni Teymiyyə əl-İxnaiyə** yazdığı rəddiyədə bu cür demişdir:

***“Qəbrləri həcc (yəni ziyarət) edənlər və onlar üçün bütlər, məscidlər və bayram yerləri təyin edənlərə gəlincə, bunlar səhabənin, tabiinin və onlara tabe olan tayfanın zamanında yox idi. İslamda həcc (ziyarət) edilən heç bir qəbr və məşhəd yox idi, əksinə bunlar üç əsrdən sonra ortaya çıxdı”***[4]

**Şeyx Muhəmməd ibni Abdulvəhhab əs-Suveydiyə** yazdığı məktubda bu cür demişdir:

***“Bu ümmətin içərisinə şirki ilk dəfə daxil edən lənətə gəlmiş rafizilərdir. Hansı ki, onlar Əliyə və başqalarına dua edirlər, onlardan ehtiyaclarını yerinə yetirmələrini, sıxıntlarını ortadan qaldırmalarını istəyirlər”***[5]

Daha sonra sufilər və s. bidət əhli firqələr də bu şirk əməllərinə sarıldı. Elm əhli bu tayfaların əməllərinin batilliyini və onların hökmünü insanlara çatdırdı. Bu kimi əməllərin şirk olduğunu və sahibini cəhənnəmə götürdüyünü açıqladılar. Daha sonra isə bu kimi tayfaların əməllərini gözəl göstərən və həmin əməl sahiblərinə üzrlər axtarmağa çalışan şeytanın yardımçıları ortaya çıxdı. Onların bəzisi qəbr ziyarətlərinin və onlardan yardım istəməyin şirk olmadığını isbatlamağa çalışdı. Bunun üçün bəzi zəif və uydurulmuş hədislərə, rəvayətlərə əsaslandılar yaxud batil istidlal metodlarına baş vuraraq bir çox nassları təvil etdilər. Bəziləri də İslam ümmətindən cəhaləti səbəbi ilə şirkə bulaşan heç kimin kafir olmayacağını, cəhənnəmdə əbədi qalmayacaqları görüşünü ortaya qoydu. Başda İbni Teymiyyə və İbnul Qayyim kimi alimlər olmaqla bir çox rəbbani alimlər onlara qarşı mübarizə apardı və insanlara həqiqətləri açıqladılar.

Daha sonra isə özlərini sələfə və İbni Teymiyyəyə nisbət edən bir tayfa gəldi. Onlar sələfin və eləcə də Şeyxul İslamın sözlərini təhrif edərək cəhaləti səbəbi ilə küfr və böyük şirk işləyən kimsənin təkfir olunmayacağı fikrini irəli sürdülər. Onlardan bəzisi də islam ümmətinə nisbət olunanlardan heç kimin müəyyən olaraq təkfir

[3] Əhməd, (4/445)
[4] əl-İxnaiyyə, s.75
[5] Tarixu-n-Nəcd, s.320

olunmayacağını iddia etdi. Şeyx Muhəmməd ibni Abdulvəhhab başda olmaqla onun ardıcılları olan nəvələri və tələbələri bu insanlarla mübarizə apardılar və işin həqiqətini onlara bəyan etdilər. Onlara dinin əsllərində ələlxüsus böyük şirkdə cəhalətin üzrlü olmadığına dair elm əhlinin sözlərini nəql etdilər və buna dair geniş açıqlama verdilər. Şeyxul İslam İbni Teymiyyənin və digər alimlərin sözlərindən yanlış anlaşılan yerləri onlara açıqladılar.

Böyük şirkdə cəhalətin və təqlidin üzrlü olmaması Quran, Sünnə və icma ilə sabit olduğu bir halda bu barədə hər hansı müctəhidin ictihadı və ya fərqli söz söyləməsinin nə dəyəri var ki?! Maliki məzhəbinin alimlərindən **İmam Qarrafi** demişdir:

***"İcma ilə Allah üsuluddində cəhaləti üzrlü saymamışdır"***[6]

Tövhid mövzusu isə dinin bütün əsllərinin əslidir və digər mövzulardan daha açıq bir məsələdir. Belə ki, burada təqlid edərəkdən xətaya düşmək belə üzr sayılmır. Təfsirçi **İmam Qurtubi** Misaq ayəsinin təfsirinin sonunda demişdir :

**"*Tövhiddə təqlid edən üçün heç bir üzr yoxdur*"**[7]

Lakin zaman keçdikdən sonra (yəni günümüzdə olduğu kimi) özlərini Şeyx Muhəmməd ibni Abdulvəhhabın dəvətinə nisbət edən, onu sevən həqiqətdə isə ona müxalif olan bir tayfa ortaya çıxdı. Onlar bu böyük imamın bəzi sözlərini əsas alaraq böyük şirk işləyən kimsənin hüccət iqaməsindən öncə üzrlü olduqları görüşünü müdafiə etdilər. Bu mövzuda digər alimlərin, hətta şeyxin öz nəvələrinin açıqlamalarını və izahlarını gözardı etdilər. Şeyxin mənhəcinin, habelə sələfin etiqadının bu olduğuna inandılar və əksini deyənlərin xəvaric məzhəbinə tabe olduqlarını elan etdilər. Əslində onlar özlərini aldadırlar və həqiqəti öyrənməkdən qorxurlar. Əgər insaf və ədalət sahibi olsalardı şeyxin bu mövzudakı digər sözlərini də ələ alar və muradının nə olduğunu anlamağa çalışarlardı. Həmçinin şeyxin sözlərini ən yaxşı anlayan və fəhm edən övladlarının və tələbələrinin bu barədəki izahlarına söykənərlərdi. Ancaq Allahın qəlbini qaraltdığı və gözünü kor etdiyi kimsə üçün yardım edən tapılmaz. Qəlbində fitnə və əyrilik olan kimsələr hər dövrdə mütəşabih və mücməl olan sözlərə yapışmışlar. **Şeyx İshaq ibni Abdurrahman** həmin kimsələrə təccüblənərək demişdir:

***"Aman Allah! Necə də qəribədir! Şeyxin Quran və Sünnədən olan dəlillər ilə yanaşı bütün mövzularda demiş olduğu sözlərini və "kimə Quran çatmışsa ona artıq hüccət çatmışdır" - sözündə olduğu kimi İbni Teymiyyənin, İbnul Qayyimin sözlərini tərk edirlər və (şeyxin) bir yerdə dediyi sözü alıb ümumiləşdirirlər ....."***[8]

Əslində bunun səbəbi həmin azmışların Allahın Kitabına və Rəsulunun Sünnəsinə haqqı ilə iman etməmələridir. Onlar zənn etdilər ki, bu ümmətə girən kimsə bir daha dindən çıxmaz. Zənn etdilər ki, insan cahil olarsa onun üçün şirk və küfr olan əməllər üzrlüdür. Hüccət çatdığı halda əgər onu fəhm edib anlamazsa o yenə üzrlüdür. Əslində isə hüccət Allahın Kitabı Quranın və Rəsulullahın Sünnəsinin varlığı ilə artıq çatmışdır. Rəsulullah (səllallahu aleyhi və səlləm) buyurmuşdur:

[6] Şərhu Tənqiihi-l-fusul, s.439
[7] əl-Camiu' li Əhkami-l-Quran,7/319
[8] Təkfiru-l -Muayyən, s.19

***“Muhəmmədin nəfsi əlində olana and olsun ki, bu ümmətdən, yəhudi və nəsrani olsun kim məni eşidib sonra da göndərildiyimə iman etmədən ölərsə mütləq cəhənnəm əshabından olar”***[9]

Allahın Rəsulu bu ümmətdən bəzi tayfaların müşriklərə qatılacağını və bütə ibadət edəcəklərini xəbər vermişdir:

***“Ümmətimdən bir tayfa müşriklərə qatılmaqdıqca və bir qrup da bütlərə ibadət etmədikcə qiyamət qopmaz”***[10]

İş belə olunca bu gün İslam dininin həqiqətini açıqlamaq və insanlara bəyan etmək gücü çatan hər kəsin üzərinə vacibdir. Bunun üçün günümüzdə bir çox əsərlər yazılmış və fətvalar verilmişdir, bunlar arasında **İbni Teymiyyə** ilə **Muhəmməd ibni Abdulvəhhab** kimi alimlərinin məlum mövzudakı etiqadını və mənhəcini açıqlayan kitablar da yer alır. Həmin əsərlərdən biri də tərcümə edərək sizlərə oxumanız üçün təqdim etdiyimiz “*Böyük şirkdə cəhalət məsələsində dəvət imamlarının sözlərinə əlavə”* adlı qiymətli kitabdır. Səudiyyəli Şeyx Ali Xudayr ibni əl-Xudayrın yazdığı bu risalədə nəcd alimlərinin böyük şirkdə cəhalətin üzrlü olmamasına dair sözləri yer alır. Şeyx burada Muhəmməd ibni Abdulvəhhabın *“hüccətdən öncə təkfir etmərik”* kimi yanlış anlaşılan sözlərinin üzərinə qeydlər etmiş və şeyxin övladlarından və tələbələrindən buna dair nəqllər gətirib. Üzrün sadəcə təkfir isminin işlədilməsinə aid olub, müşrik isminin işlədilməsinə aid olmadığına dair dəfələrcə qeydlər edən Şeyx Ali Xudayr bunu nəcd alimlərinin sözləri ilə qüvvətləndirib. Beləki, həmin alimlər ya şeyxin dizinin dibində böyümüş və ondan bilavasitə elmi mənimsəmiş övladları və nəvələridir, yaxud da şeyxdən birbaşa və ya övladları vasitəsi ilə elm almış tələbələridir. Şeyxin məqsədini və muradını onlardan başqasının daha yaxşı bilməsi təsəvvür edilməyəcəyindən bu mövzuda həmin şeyxlərin sözlərinin dəyərləndirilməsi böyük əhəmiyyət kəsb edir. Bu baxımdan Şeyx Ali Xudayrın bu risaləsi böyük şirkdə cəhalətlə bağlı, həmçinin hüccətdən sonra və öncəsinə görə müşrik-kafir isimlərinin fərqləndiriməsi mövzusunda dəvət imamlarının (yəni nəcd alimlərinin) mənhəcini doğru bir şəkildə anlamaq istəyənlərə işıq tutur. Əsərin məzmunu ümumən bununla bağlı olduğu üçün burada böyük şirkdə cəhalətin üzrlü olmasına dair gətirilən digər şübhələrə cavablar yer almır. Bu əsər sadəcə nəcd alimlərinin məsələ ilə bağlı görüşlərini və sözlərini incələyir. Böyük şirkdə cəhalət üzrü ilə bağlı, habelə şübhələrə cavablarla bağlı daha geniş məlumat almaq istəyənlərə bu mövzuda qələmə alınmış aşağıdakı kitabları oxumağı məsləhət görülür:

- *“A'ridul cəhl”*- **Əbil-Ula ər-Raşidin** yazdığı bu kitab əhli-sünnə alimlərinin yanında cəhalət üzrü məsələsinin həqiqətindən bəhs edir. Türk dilinə tərcümə edilmişdir.
- *“əl-Uzru bi-l-cəhl təhtə-l-məchəri-ş-şəri'i”*- **Əbu Yusuf alu-Fərrac** bu mövzuda qələmə alınmış müasir əsərlər içərisində ən gözəlidir. Türk dilinə tərcümə edilərək nəşr olunub.
- *“İslam Hukuku açısında Cəhalət Özürü”* – **Murat Gezenler** hocanın bu mövzuda çox gözəl bir araşdırmasıdır.
- *“İrca Saldırılarına karşı cevaplar”*- **Murat Gezenler**. Bu kitabda cəhalətlə bağlı bir çox şübhələrin cavabını tapmaq mümkündür.

[9] Sahihu-Muslim, (153)
[10] Əbu Davud (4252), İbni Macəh (3952), Əhməd (5/27)

Təqdim etdiyimiz bu kitab müxtəsər və qısa bilgiləri özündə əhatə etməsi ilə yanaşı bəzi hallarda açıqlama və izahları da gərəkdirir. Bunu nəzərə alaraq bəzi qeydləri və açıqlamaları əlavə etməyi uyğun gördüm. Həmin əlavələrin Şeyx Ali Xudayrın qeydlərindən və izahlarından fəqlənməsi üçün sonunda "tərcümə edən" mənasında qısa şəkildə *(T.e)*-nı qeyd etdim. Sonunda bu yazının qeyd edilmədiyi bütün şərhlər və haşiyələr Şeyx Ali Xudayra məxsusdur.

Həmçinin bir çox insanın nəcd alimləri haqqında geniş məlumatının olmaması səbəbi ilə, habelə bəzi qardaşların istəyi və tələbləri üzərinə onların həyatı və elmi fəaliyyəti haqqında qısa bilgiləri bu kitabın haşiyə qisminə əlavə etdim. Həmin bilgiləri kitabın 6-cı fəsli olan "Şeyx Muhəmməd ibni Abdulvəhhabın tələbələrinin sözlərindən açıqlayıcı nəqillər fəsli"-ndə hər alimin adının keçdiyi müvafiq yerlərdə haşiyə qismində qeyd etmişəm. Alimlərin həyatı və dəvət fəaliyyətləri haqqında bilgiləri isə əsasən bu iki kitabdan faydalanaraq qeyd etmişəm:

1) *"Məşahiru uləmai nəcd va ğayrihim"*, **Abdurraahman ibni Abdullatif ibni Abdullah alu-ş-şeyx**,
2) *"Təracimul-mutəaxiri-li-hənəbilə"*, **Şeyx Süleyman ibni Abdullah ibni Həmdan,** (Şeyx Bəkr ibni Abdullah Əbu Zeydin təhqiqi ilə)

Nəcdin tövhid dəvətinin başçısı hesab olunan **Şeyx Muhəmməd ibni Abdulvəhhabın** həyatı və dəvəti haqqındakı bilgiləri, o cümlədən kitabın yazarı **Şeyx Ali Xudayrın** həyatı, elmi fəaliyyəti və onun şeyxi alim **Hamud ibni Uqla əş-Şuaybinin** həyatı haqqındakı bilgiləri isə kitabın ön qisminə əlavə etdim.

Həmçinin "Şeyx Muhəmməd ibni Abdulvəhhabın sözlərini fəhm etməyib dəlil kimi gətirdikləri nəqillərə və risalələrə cavab" ünvanlı 5-ci fəslin **sonunda Şeyxül-islam İbni Teymiyyənin** *"hüccət çatdırılana kimi cəzalandırılmağı haqq etməzlər"* və *"onlar hüccət iqaməsindən sonra kafirdirlər"* kimi bu mövzuda yanlış anlaşılan sözlərinin açıqlanmasına və izahına dair haşiyə əlavə etdim. Bunlarla yanaşı bir çox yerlərdə aydın olması və anlaşılmaya yardımçı olması məqsədi ilə haşiləyər əlavə etdim.

Sonda Aləmlərin rəbbi olan Allaha həmd və sənalar diləyirəm! Bu kitabı yazandan və onu tərcümə edərək sizlərə təqdim etməkdə zəhməti keçən hər bir kimsədən Allah razı olsun və bu əməyi bütün müsəlmanlar üçün faydalı etsin!

# Şeyx Ali ibni Xudayr kimdir?

Şeyx Ali ibni Xudayr ibni Fahd əl-Xudayr h.1374-cü ildə (m.1954) Riyad şəhərində anadan olmuşdur. H.1403-cü ildə (m.1983) İmam Qasım universitetinin üsuluddin fakultəsini bitirmişdir. H.1406-1408ci illər ərzində Məkkə Məhkəməsində katib vəzifəsində çalışır. Daha sonra isə şeyx qaziliyə namizəd göstərilsə də o bunu qəbul etmir. Lakin sonra Ədalət Nazirliyinin israrı ilə müəllim olaraq çalışması üçün Elmlər Nazirliyinə nəql olunur. Bununla yanaşı o, Bureydədə məsciddə imam və xatib idi, Quran hifzi üçün cəmiyyət inşa etmişdir.

Şeyx Xudayr elm tələbinə hələ gənc yaşlarında ikən orta məktəbdə oxuduğu vaxtlarda başlamışdır. İlk dərsini **Şeyx Abdurrauf əl-Hənavinin** yanında Quran tilavəti və təcvidi üzərində almışdır. Həmçinin universitetə daxil olmazdan öncə **Şeyx Ali ibni Abdullah əl-Curdanidən** və **Şeyx Muhəmməd ibni İbrahim alu-ş-şeyxin** zamanında böyük qazilərdən biri olmuş **Şeyx Abdullah ibni Muheyzii'**dən dərs almışdır. Bunlardan əlavə bir çox şeyxlərin və alimlərin yanında elm tələb etmişdir. Onlardan,

- **Şeyx Hamud ibni U'qla əş-Şuaybinin** yanında tövhid, əqidə, fiqh, hədis və nəhv elmlərinə aid dərslər alır. Şeyx Ali Xudayr ona tam bir bağlılıq göstərir, həyatının sonuna kimi onun yanından ayrılmır və Şeyx Hamudun daima övdüyü, önə çıxartdığı tələbələrindən birisi olur. İrəlidə bu şeyx haqqında təfsilatlı bilgi veriləcək.

Şeyx Hamud ibni U'qla onun üç kitabına müqəddimə yazmışdır: 1) *"əl-Cəmu' vat-təcrid fi şərhi kitabut-tövhid"* 2) *"əl-Haqaiqu fit-tövhid"* 3) *"ət-Tavdihu vat-tətimmətu alə kəşfiş-şubuhat"*

- **Şeyx Muhəmməd ibni Saleh əl-Mansurun** yanında da tövhid, fiqh, fəraiz, hədis və nəhv elmlərinə dair dərslər alır.
- **Şeyx Muhəmməd ibni Saleh əl-Useyminin** yanında fiqh oxumuşdur.
- **Şeyx Abdullah ibni Muhəmməd ibni Abdullah alu-Hüseynın** yanında da fiqhə dair elm almışdır.
- **Şeyx Muhəmməd ibni Süleyman əl-A'litin** yanında zühdə dair dərslər alır, İmam Vəki'nin və İmam Əhmədin *"Zühd"* kitabını oxuyur.

Bunlardan başqa universitetdə oxuduğu zamanlarda bir çox alimlərdən elm almışdır.

Şeyx Ali Xudayr təlim-tədris və dəvət işləri ilə də məşğul olmuşdur. Məscidində dərs halqaları təşkil edər, davamlı olaraq tövhid, əqidə və fiqh mövzularında dərslər verərdi. İlk dəfə məsciddə fiqh və mustahul hədis mövzusunda dərslər keçəndə dərsə qatılanların sayı beş nəfərdən artıq deyildi. Lakin şeyx davamlı olaraq günlük dərslər keçirdi və getdikcə tələbələrin sayı gündən-günə artmağa başladı. Beləliklə də, şeyxin elmindən bir çox insanlar faydalanır.

Şeyx bir çox risalə və kitablar yazmışdır, onların əksəriyyəti tövhid, əqidə və fiqh dərslərində tələbələrinin aldığı qeydlər əsasında toplanmışdır. Bunlar arasında Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhabın risalələrinə yazdığı şərhlər əsas yer tutur. Onun əsərlərindən,

- *"əl-Vicazətu fi şərhi əl-usulus-sələsə"*- "Üç əsas"-ın şərhidir.
- *"əl-Mu'tasar şərhu Kitabut-tövhid"* və
- *"əl-Cəmu' vat-təcrid fi şərhi kitabut-tövhid"*- bu ikisi Şeyx Muhəmməd ibni Abdulvəhhabın "Kitabut-Tövhid" kitabının şərhidir.
- *"ət-Tavdihu vat-tətimmətu alə kəşfiş-şubuhat"*,

- *“əl-Haqaiqu fit-tövhid”*- “İstikamet” yayınları tərəfindən türk dilinə tərcümə edilərək nəşr olunmuşdur.
- *“Muzakkiratu fi navaqidil- İslam”* - Şeyx Muhəmməd ibni Abdulvəhhabın “İslamı pozan amillər” risaləsinə yazdığı şərhdir,
- *“əl-Vasit fi şərhi əvvəli risaləti fi məcmuatut-tövhid”,*
- *“əz-Zinad fi şərhi luma'til-i'tiqad”,*
- *“əl-Mutəmmimə fi məsələtil-cəhl fiş-şirkil-əkbər”*- bu hazırda tərcüməsini təqdim etdiyimiz risalədir.
- *“Qavai'du va usulu fil-muqallidin val-cəhl fiş-şirkil-əkbər val-bida'i”*- İbnul Qayyimin *“Tariqul-Hicrəteyn”* kitabında 17-ci təbəqəyə dair anlatdıqlarının müxtəsəri və *“Nuniyyə”*- adlı qəsidəsində bidət əhli haqqındakı sözlərinin şərhidir.
- *“Kitabut-tabaqat”*,
- *“Aslud-dinil İslam”* - Şeyx Muhəmməd ibni Abdulvəhhabın “Aslud-dinil İslam va qai'datuhu amran” adlı risaləsinə yazdığı şərhdir ,
- *“əl-Məsəilul-mardiyyə alə aqidətil-vasitiyyə”,*
- *“əl-Məhki fihi əl-icmaa' minəl-əhkamil-fiqhiyyə”,*
- *“İqtirahu fi tədrisil-fiqh”*

Şeyx Ali ibni Xudayr 2003-cü ildə Səudiyyə hakimiyyətini sərt şəkildə qınamasına görə və buna dair fətvalar verməsi səbəbi ilə bir neçə alim ilə birlikdə həbs olunur. Hazırda həbsdədir, həyatda olub-olmamasına dair hər hansı bir bilgi yoxdur. Allah tezliklə həbsdən qurtarsın!

## Şeyx Hamud ibni U′qla əş-Şuaybi

Şeyx Ali ibni Xudayrın üzərində çox böyük təsiri olan bu alim haqqında bilgi vermədən keçə bilmərik.

O, Şeyx Hamud ibni Abdullah ibni U′qla əş-Şuaybi h.1346-cı ildə (m.1927) Səudiyyə Ərəbistanının əl-Qasım adlı bölgəsində Bureydə şəhərinin Şaqqa adlı qəsəbəsində doğulmuşdur. Elm tələbinə hələ uşaq yaşlarında başlayan Şeyx Hamud 6 yaşında ikən tutulduğu xəstəlik səbəbi ilə görmə qabiliyyətini itirdi. Buna baxmayaraq Şeyx elm təhsilinə çox həris birisi idi və elm almağa davam etdi. 13 yaşında **Şeyx Abdullah ibni Mübarək əl-Umrinin** yanında Quranı əzbərləyir. 20 yaşına gəlincə atası elm üçün Riyad şəhərinə getməyi ona tövsiyə etdi. H.1367-ci ildə Şeyx Hamud Riyad şəhərinə köçdü və orada **Şeyx Abdullatif ibni İbrahim aluş-şeyxlə** qarşılaşdı. Ona bağlılıq göstərərək yanında elm aldı. Onun yanında fiqh, əqidə, nəhv lüğətə dair dərslər aldı.

Daha sonra isə **Şeyx Muhəmməd ibni İbrahim aluş-şeyxin** dərs halqalarına qatıldı. Ona tam bir bağlılıq göstərir və yanından heç vaxt ayrılmadı. Əqidə, hədis, fiqh, təfsir, üsulu fiqh, nəhv və s. elmlərdən dərslər aldı Onun yanında nəhv elmində *“Əlfiyyətu ibni Malik”*-i, Hənbəli fiqhində isə *“Zadul Mustaqni'”*-i əzbərlədi. Şeyx Hamud özü haqqında bu cür demişdir:

*“H.1368-ci ildə Şeyx Muhəmməd ibni İbrahim aluş-şeyxin yanında oxumağa başladım. Onun yanında öncə “Zadul mustaqni”-i sonra “Kitabut-tövhid”i, “Kəşfuş-şubuhat”-ı, Şeyxül-islamın “A'qidatul vasitiyyə”-sini, “əl-Ərbau'n-nəvəvi”-ni, “Əlfiyyətu ibni Malik”-i və “Buluğul Məra'm”-ı oxudum. Bunlar şeyxin yanında mütləq oxunması gərəkən kitablar idi. Mən bunların üzərinə bəzi kitabları da əlavə etdim. Təkbaşına şeyxin yanında “A'qidatut-tahaviyyə”-ni, Səfəraninin “əd-Durrul-*

*madiyyə"-sini və İbni Teymiyyənin "əl-Haməviyyə"-sini oxudum. Bunları şeyxin yanında mən tək başına oxudum"*

Şeyx Muhəmməd ibni İbrahim həmin vaxtlarda Səudiyyənin baş müftisi idi və o, Şeyx Hamud ibni U'qlanın görüşlərinin formalaşmasında əhəmiyyətli rola sahibdir. Belə ki, Muhəmməd ibni İbrahim aluş-şeyx şeyx ailəsindən Şeyx Abdurrahman ibni Həsənin nəvəsi Şeyx Abdullatifin nəvəsidir. Buna görə onun izlədiyi metod və tabe olduğu mənhəc elə nəcd alimlərinin üzərində olduğu metod və mənhəcin özüdür. Bu səbəblə Şeyx Hamud ibni U′qla əş-Şuaybinin nəcd alimlərinin dəvət və mənhəcini təmiz və saf şəkildə mənimsəməsində onun çox sevdiyi və dərslərini fatihə surəsi kimi əzbərlədiyi Şeyx Muhəmməd ibni İbrahimin təsiri açıq aydın görsənir. Nəticə olaraq, Şeyx Ali Xudayrın da Şeyx Hamuda bağlanması və onun elmindən, mənhəcindən təsirlənməsi, nəcd alimlərinin dəvətinin həqiqətini düzgün şəkildə anlaması bizə gizli qalmır.

Şeyx Hamud ibni U′qlanın təsirləndiyi və bağlılıq göstərdiyi digər bir şeyx **Muhəmməd Əmin əş-Şanqitidir**. Şeyx Hamud onunla xas dərslərə qatıldı, şəxsən evinə gedərək tək başına ondan dərs almışdır. Əslən Mavritaniyadan olan Şeyx Muhəmməd Əmin əş-Şanqitinin yanında təfsir, hədis, üsulu fiqh, ərəb dili lüğəti və məntiq elmlərindən dərslər alır. Şeyx Şanqiti bu cür demişdir:

*"Qarşılaşdığım alimlər içərisində ən zəkalısı Şeyx Muhəmməd ibni İbrahimdir. Qarşılaşdığım tələbələr içərisində ən zəkalısı isə Hamud əl-U'qladır"*

Şeyxin bağlılıq göstərərək dərs aldığı digər alim isə **Şeyx Abdurrahman ibni Qasimdir**. O, Şeyxül-islam İbni Teymiyyənin fətvalarını 37 cild halında *"Məcmuul-Fətava"* adı altında, Nəcd alimlərinin fətvalarını isə 16 cild halında *"əd-Durərus-Səniyyə"* adı altında toplayan məşhur alimdir.

Şeyx Hamud ibni Uqala əş-Şuaybi təlim-tədris işləri ilə də məşğul olmuş, bir çox alim və tələbələr yetişdirmişdir. Onun əli ilə yetişmiş alim və şeyxlərdən bəziləri,

- Tərcümə etdiyimiz risalənin sahibi Şeyx Ali Xudayr ibni əl-Xudayr. Şeyxin ən çox sevdiyi və ən yaxın tələbəsidir.
- Abdullah əl-Ğuneyman,
- Süleyman ibni Fahd əl-A′vdə,
- Saleh əl-Luheydan,
- Abdurrahman əl-A′clan,
- Muhəmməd ibni Saleh əl-Useymin,
- Səudiyyənin alimlər heyətinin başçısı və başmüftü Abdulaziz aluş-şeyx,
- Saleh Favzan,
- Abdullah ibni Turki,
- Abdurrahman ibni Saleh əl-Cəbr,
- Abdurrahman ibni Ğays,
- Həmd ibni Faryan,
- Abdurrahman ibni Abdulaziz əl-Cifn - onun həyatı və bioqrafiyası haqqında kitab yazıb.
- Rabii′ ibnu Hadi əl-Mədxali,
- Əbu Bəkr əl-Cəzairi və başqaları.

Şeyx Hamud bir çox risalə və məqalələr yazmış, kitab və mətnlərə şərhlər və açıqlamalar etmişdir. Bunlardan,

- *"ər-Raddu alə iftiraati əl-A'nbəri",*
- *"Bəyanu a'mmə hasala min lubsi fi şuruti-l-iftia",*

- *“Hukmu əxzil-cinsiyyəti lil mukrahi min davlatil- kəfira”,*
- *“Hukmu muqatiatil-iqtisadiyyə”,*
- *“Ma'nal-irhab va haqiqatuhu”,*
- *“Fətva fi hukmis-salati aləl-meyyitil-ğaib”,*
- *“Şubhatu-hurriyyatul-fikri taqtadi a'damə təkfirin-nəs”* və s

Şeyx Hamud ibni Uqala əş-Şuaybi h.1422-ci ildə Bureydə şəhərinin əl-Qasim qəsəbəsində ürək çatışmazlığı səbəbindən vəfat etmişdir. Allah rəhmət eləsin!

# Şeyx Muhəmməd ibni Abdulvəhhabın həyatı və dəvətinin qısa tarixi

**Şeyxul-İslam Muhəmməd ibni Abdulvahhab** hicri 1115 (m. 1703) ilində Ərəb yarımadasının **Uyeynə** adlı kəndində doğulmuşdur.[11] Uyeynə Nəcd bölgəsində Yəmamə adlı yerdə yerləşən bir kəndin adıdır, Riyadın təxminən 70 km-lik məsafəsində, şimal qərbində yerləşir.

Onun adı tam şəkildə Əbu əl-Hüseyn Muhəmməd ibni Suleyman ibni Əli Müşərrəf Əli Mi'dad əl-Muheyiy olub Bəni Hanzala ibni Malik ət-Təmimi qəbiləsindəndir. Altı oğlu və bir qızı var idi: Həsən, Hüseyn, İbrahim, Abdullah, Əli, Abdulaziz və Fatimə adında bir qızı var idi.

***Elm tələbi ilə bağlı həyatı***

Şeyx Muhəmməd elmin nuru ilə bərəkətlənmiş alim və saleh bir ailədə böyümüşdür. Atası **Şeyx Abdulvəhhab** (v./h.1153) və babası **Şeyx Süleyman ibni Ali ibni Muşərrəf** (v./h.1079) yaşadıqları dövrdə bütün Nəcd bölgəsinin məşhur qazisi və müftisi idilər. Babası yaşadığı coğrafiyada həmin dövrün sayılan alimlərindən və Nəcdlilərin fətva üçün baş vurduqları əsas qaynaq idi. **Şeyx Abdurrahman ibni Həsən** (rahiməhullah) *"əl-Maqamat"* adlı risaləsində bu cür qeyd etmişdir:

***"Şübhə yoxdur ki, onun (yəni Şeyx Muhəmmədin) babası Suleyman ibni Ali Ravzadan gələrək Uyeynədə məşkunlaşdığı vaxt öz zamanında Nəcddə məskunlaşanların ən fəqihi idi. Onun əli ilə Nəcd əhlindən bir çox insan yetişdi, onların arasında övladları Abdulvəhhab və İbrahim də var."***[12]

Şeyx Süleyman bir çox alimlərdən dərs almışdır, onlardan əsasən ikisinə daha çox bağlılıq göstərmişdir: Şeyx Muhəmməd ibni Əhməd ibni İsmail əl-Uşayqiri (v./h.1059) və Şeyx Əhməd ibni Muhəmməd ibni Muşərrəf (v./h.1012). Hər ikisi də Hənbəli məzhəbinin alimi, *"əl-İqna'"* və *"Zadul mustaqni'"* kitablarının müəllifi **Musa əl-Həccavinin** (v./h.968) tələbəsi olub. Şeyx Suleyman elmi məsələləri onlardan, onlar isə İmam əl-Həccavidən və Əhməd ibni Yəhya ibni A'tvadan (v./h.948) rəvayət edir.

**Şeyx Süleyman ibni Abdullah ibni Həmdan** (v./h.1397) *"Təracimul-mutəaxiri-li-hənəbilə"*-də onun haqqında bu cür qeyd etmişdir:

***"Nəcd diyarının əllaməsidir, Uyeynədə doğdu və orada böyüdü. Oranın alimlərinin yanında oxudu və onlara bağlılıq göstərdi. Onlardan ən böyüyü Şeyx Muhəmməd ibni Əhməd ibni İsmailin yanında təfsir, hədis, usuluddin, fiqh, fəraiz və s. oxudu. Bunların hamısında mahirləşdi, xüsusən də fiqhdə bir örnək idi. Ustalaşdı, dərs***

---

[11] Hicri 1111 (m.1699) ildə doğulduğu da söylənilir, məşhur olan isə birinci tarixdir.

[12] *"əl-Maqamat, s.2"*- Osman ibni Mansura qarşı rəddiyə olaraq yazılmışdır *"əd-Durərus-Səniyyə, 12/5-42"*-də mövcuddur.

***verdi, fətva verdi və bölgələrdən ona suallar yönəldildi, onlara doğru cavablar verdi. Əsərlər yazmağa əhil oldu, hətta deyilir ki, "əl-Muntəha"[13] –nı şərh etməyə niyyətlənmişdi ki, tələbələrindən bəzisi Şeyx Mənsurun[14] şərhi ilə onun yanına gəldi. Əzm etdiyi bu işdən çəkindi və bu cür dedi: "Şeyx bu muhim şərhi ilə bizim ehtiyacımızı qarşıladı." Deyirlər ki, şeyx onu oxudu, üzərində düşündü və dedi: "Üç mövzu xaricində onun mənim yazmaq istədiyimə uyğun gəldiyini gördüm" - və ya buna bənzər bir şey dedi.***

***Məşhur "əl-Mənsək"-i [15] yazdı və o həcc ibadətləri mövzusunda hənbəlilərin etimad göstərdiyi bir kitabdır. Onun bundan başqa kitabının olduğunu bilmirəm. Dürüst fətvalar və bəyanatlar verən birisi idi, əgər fətvaları cəm edilsə böyük cildlər halında olar. Lakin fətvaları cəm edilmiş halda yoxdur.[16] Kaş ki, cəm edilsə də, onlar böyük faydaya və məsələlərin geniş toplusuna malikdir."***[17]

Şeyx Suleymanın əli ilə bir çox alim və şeyxlər yetişmişdir ki, onlardan ikisi öz övladlarıdır: Şeyx Muhəmmədin atası **Abdulvəhhab** və əmisi **İbrahim**. Onların ikisi də öz zamanlarının önəmli alimlərindən hesab olunurdular. Şeyx Muhəmmədin atası Abdulvəhhab əl-Arızda[18] qazilik vəzifəsində çalışırdı, əmisi Şeyx İbrahim ibni Suleyman isə ətraf bölgələrə insanların fətvaya olan ehtiyaclarını arşılamaq üçün tez-tez səfərlər edərdi. Şeyx Muhəmməd ilk təhsilini fəqih və alim olan atası **Abdulvəhhab ibni Suleymanın** yanında aldı, hələ kiçik yaşlarında ikən Quranı hifz etdi. Atasından Hənbəli məzhəbinin fiqhini, həmçinin hədis, təfsir və bir çox elmləri öyrəndi. Onun yanında Hənbəli məzhəbinin bir çox kitablarını incəliklərinə kimi oxudu: **İbni Qudamə əl-Maqdisinin** (v./h.625) *"əl-Muğni"*, **əl-Mardavinin** (v./h.885) *"əl-İnsaf"*, **əl-Futuhinin** (v./h.972) *"Muntəhəl-İradat"*, **əl-Haccavinin** (v./h.968) *"əl-İqna'"* və s. kitablarını məsələləri ilə birlikdə əzbərləmişcəsinə oxudu.[19]

Beləliklə, şeyx ilk elmini fəqih ailəsinin yanında aldı, onlardan Hənbəli məzhəbinin fiqhini dərindən öyrəndi. Daha sonra Şeyx Muhəmməd ibni Abdulvəhhab elm tələbini davam etdirmək üçün doğma yurdunu tərk edərək səfərlərə çıxdı, dəfələrlə ayağı elm uğrunda toza-torpağa bulaşdı. İlk yolculuğu həcc ziyarəti məqsədilə çıxdığı səfər idi. Artıq bülüğ yaşına çatmış, gənc bir dəliqanlı olan Muhəmməd həccə gedir, fərz ibadətini yerinə yetirdikdən sonra Mədinəyə yönəlir və bir müddət orada qalır. Peyğəmbər (səllallahu aleyhi və səlləmin) hicrət yurdu olan Mədinədə qaldığı müddət ərzində oranın alimlərindən faydalandı. Orada Hənbəli məzhəbinin bəzi kitablarını əldə edir, **İbnul Qayyimin** *"əl-Hədyun nubuvvə fil fadaili val ədəb"* adlı kitabını, **Buxarinin** mətnini əli ilə yazaraq nüsxəsini çıxardır. Nəhv dərslərinə qatılır və *"Əlfiyyətu ibni Maliki"* əzbərləyir.[20] Şeyx Muhəmməd ibni Abdulvəhhab Mədinənin məşhur alimlərindən və mühəddislərindən sayılan iki şeyxin dizinin dibində elmin

---

[13] əl-Futuhinin *"Muntəhəl İradat"* kitabıdır. Hənbəlilərin ən çox əsaslandığı kitablardandır.

[14] O, Hənbəli məzhəbinin məşhur alimi, *"Kəşşaful-Qina'"* kitabının müəllifi **Mənsur əl-Bəhautidir. Şeyx Suleyman ibni Ali** onunla eyni zamanda yaşamışdır, hətta Məkkədə bir araya gələrək görüşmüşlər. (Bax:*"Məşahirul uləmai nəcd va ğayrihim, s.21"* – Şeyx Abdurrahman ibni Abdullatif ibni Abdullah aluş-Şeyx)

[15] O, *"Misbahus salik fi əhkamil mənasik"* – adlı kitabıdır və h.1352-ci ildə çap edilmişdir.

[16] Ancaq ayrı-ayrı kitablarda bəzi fətvaları nəql edimişdir. Məsələn, İbni Manqur *"əl-Fəvakihul adida fil məsailil mufida"* adlı kitabında ondan 64 fətva nəql edir. Həmçinin *"Məcmuatur-rəsail val məsail nəcdiyyə"*-nin tərkibində bəzi məsələlər çap edimişdir.

[17] *"Təracimul-mutəaxiri-li-hənəbilə, s.67"*, (Şeyx Bəkr ibni Abdullah Əbu Zeydin təhqiqi ilə)

[18] Nəcddə yerləşən bir məntəqənin adıdır.

[19] Bax: *"əl-Maqamat, s.2"*,*"əd-Durərus-Səniyyə, 12/5"*

[20] Bax: *"əl-Maqamat, s.5"*,*"əd-Durərus-Səniyyə, 12/9"*

şərbətini içir və onlara tam bir bağlılıq göstərir. Onlardan birincisi **Şeyx Abdullah ibni İbrahim ibni Seyfi ən-Nəcdi** (v./h.1140), ikincisi isə **Muhamməd Hayatus-Sindi**-dir. Həmin bu iki alim irəlidə böyük bir dəvətin sahibi olacaq Muhəmmədin fikirlərinin formalaşmasında böyük təsirə malik idilər.

Şeyx Abdullah ibni İbrahim İbni Seyfi Riyadın şimalında yerləşən əl-Məcmaa' şəhərinin böyüklərindən idi, mühəddis və fəqih bir alim idi. Şeyx Muhəmməd ibni Abdulvəhhab ondan çox faydalanır, xüsusən də hədis elmində ondan icazətlər alır. Bunlardan,

***"Rəhm edənlərə Rəhman rəhm edər. Yerdə olanlara rəhm edin ki, səmada olan da sizə rəhm etsin"***[21] hədisini iki yoldan gələn sənəd ilə icazətini alır. Birincisi: İbni Muflih-Şeyxül-islam İbni Teymiyyə-Şəmsuddin ibni Əbi Ömər-İbni Qudamə-Abdulqadir Ceylani-Qadi Əbu Yal'a-İbni Hamid-Xallal-İmam Əhməd yolu ilədir. İkincisi isə: İbni Rəcəb-İbnul Qayyim-İbni Teymiyyə-İbnu Aqil-Qadi Əbu Yal'a-İbni Hamid-əl-Mərvəzi-Xallal-əl-Əsrəm-İmam Əhməd yolu ilədir.[22]

İcazət aldığı başqa bir hədis isə : ***"Allah quluna xeyir dilədiyi zaman onu istifadə edər." Dedilər ki: Ey Allahın rəsulu necə istifadə edər? Dedi ki: "Ölümündən öncə onu saleh əmələ müvəffəq edər"***[23]

Şeyx Muhəmməd ibni Abdulvəhhab elm tələbi yolunda ayaqlarını toza bulaştırdığı zamanlarda Nəcd və Hicaz bölgəsində elmlə məşğul olanların əsas diqqəti fiqh mövzusunda dərinləşməkdən ibarət idi. Ümumiyyətlə, həmin dövrdə alimlərin əksəriyyəti Hənbəli məzhəbində fəqih olsalar da, digər elmlərin öyrənilməsində xüsusən də əqidə, tövhid kimi vacib mövzuların incələnməsində o qədər də maraqlı deyildirlər. Qəbr şirkinin və bidətlərin yayıldığı belə bir mühitdə tövhidə o qədər də önəm verilmirdi. Bir çoxları fiqhdə ixtisaslaşsalar da əqidədə əşari və ya maturudi idilər.[24] Bu səbəbdən, hər nəqədər fiqhdə alim olsalar da tövhidin həqiqətindən, kəlimə-i şəhadətin gerçək mənasından cahil bir vəziyyətdə idilər. Şeyx Muhəmməd ibni Abdulvəhhabın məlum sözü də buna şahidlik edir:

***"Özündən başqa ilah olmayana and olsun ki, mən elm tələb edirdim və məni tanıyan kimsə bilgimin olduğuna inanırdı. Lakin mən həmin vaxt, Allahın nemət olaraq bəxş etdiyi bu xeyirdən öncə nə Lə iləhə illəllahın mənasını bilirdim, nə də İslamın mənasını bilirdim. Həmçinin mənim şeyxlərim də, onlardan bunu bilən adam yox idi. Kim bu vaxtdan əvvəl əl-Arızın[25] alimlərindən kiminsə Lə iləhə illəllahın mənasını bildiyini və ya İslamın mənasını bildiyini iddia edərsə, yaxud da***

---

[21] Tirmizi, "*Kitabul Birr*" (1847)- hədis həsən səhihdir demişdir.

[22] *"Əsərud-davati əl-vahhabiyyə, s.42"*- Şeyx Muhəmməd Hamid əl-Fiqi

[23] Tirmizi, *"Kitabul Qədər*" (2068)- hədis həsən səhihdir demişdir.

[24] Onlar etiqad mövzusunda öz batil inanclarını məzhəb imamlarına nisbət edərdilər. Necə ki, Şeyxin özü bu barədə demişdir :
***"Bil ki , bu (son donəm alimlərdən olan kitab) muəllifləri müsəlmanların imamlarına onların demədiyi sözləri nisbət edirlər. Həmçinin Şafiyə, Malikə, Əhmədə və Əbu hənifəyə onların demədiyi öz batil etiqadlarını nisbət edərək öz ardıcıllarına (yalandan) deyirlər : "Bizim bu dediklərimiz filan imamın etiqadıdır." Və əgər sən onlardan (bunun sübutu üçün) səhih bir nəql tələb etsən, onların yalanı sənə (açıq aşkar) bəyan olar necəki rəsulullahın adından yalan danışan bir çox insanların yalanları bəyan olunmuşdur."*** *"əd-Durərus-Səniyyə, 3/52"*

[25] Yəni Şeyxin böyüdüyü və yaşadığı Nəcd bölgəsini qəsd edir. Yoxsa digər bölgələrdə haqqa müvafiq olan, lakin müəyyən səbəblərdən bunu izhar etməyən alimlər də var idi. Şeyxin fikirləri ilə təsirləndiyi alimlər buna misaldır.

***öz şeyxlərindən birinin bunu bildiyini iddia edərsə bununla yalan söyləyər, iftira atar, insanları aldatar və özünü övər."***[26]

Ancaq **Şeyx Abdullah ibni Seyfi** kimi bəzi alimlər bu gerçəkliyin fərqində idilər və Şeyx Muhəmmədin islahedici düşüncələrinə müvafiq oldular.. Hətta Şeyx Abdullah ibni Seyfi irəlidə planlaşdırdığı hansısa bir mübarizə üçün özünü hazırlayırdı. Şeyx Muhəmməd ibni Abdulvəhhab onun haqqında bəhs edərkən bu cür demişdir:

***"Bir gün onun yanında idim və mənə dedi ki: "İstəyirsənmi sənə əl-Məcmaa'***[27] ***üçün hazırladığım silahı göstərim?" Dedim ki: "Bəli" Məni içərisində çoxlu kitablar olan bir mənzilə daxil etdi və dedi: "Onun üçün hazırladığım bunlardı"***[28]

Şeyx Muhəmmədin Mədinədə olduğu ərəfələrdə təsirləndiyi və çox faydalandığı digər alim isə **Şeyx Muhəmməd Hayatus- Sindi əl-Hənəfidir**. Şeyx Muhəmməd ibni Abdulvəhhab bu alim ilə **Şeyx İbni Seyfin** səbəbi ilə tanış olmuşdur. Şeyx Hayatus-Sindi zamanında böyük mühəddis alimlərdən biri hesab olunurdu və o bir çox faydalı əsərlərin müəllifidir. Bunlardan, *"Şərhul-ərbai'n-nəvəviyyə", "Şərhut-tərğib vət-təhrib", "Şərhu muxtasar əz-zəvacir li İbni Hacər", "Tuhfətul-ənam fil-aməli bi hədisin-nəbiyyi aleyhis-salati vas-salam", "əd-Durra fi izhari ğışşi naqdis-surra", "Fəthul ğafur fi vadi'l-əydi aləs-sudur", "əl-Hukmul-həddadiyyə"* və s. O, eyni zamanda Şeyx Muhəmməd ibni Abdulvəhhabın dəvətinə müvafiq olmuş, *"Subbulus-Salam fi şərhi buluğul-məram"* və *"Təthirul-İ'tiqad"* adlı əsərlərin sahibi **Muhəmməd ibni İsmail əs-Sənaa'ninin** də şeyxi olmuşdur.

Şeyx Hayatus-Sindi məzhəb təəssübkeşliyinə və təqlidə qarşı birisi idi, hədisə və dəlilə əsaslanardı. Eyni zamanda bidətlərə, şirk əməllərinə qarşı çıxan və mübarizə aparan biri idi. Bu səbəblədir ki, Şeyx Muhəmmədin dəvət və islahatla bağlı düşüncələrinin formalaşmasında onun da böyük təsiri olub. Şeyx Muhəmməd ibni Abdulvəhhab rəvayət edir ki, Mədinədə olduğu günlərin birində peyğəmbər səllallahu aleyhi və səlləmin qəbrinin yerləşdiyi otağın ətrafında insanların peyğəmbər səllallahu aleyhi və səlləm ilə istiğasə etdiklərini görür. Bunu görən Şeyx Hayatus-Sindi onun yanına gəlir və şeyx ondan soruşur: ***"Onlar haqqında nə deyirsən?"*** O isə dərhal cavab verir: ***"Şübhəsiz ki, bunların etiqad etdikləri məhvə məhkumdur, gördükləri işlər isə batildir"*** **(Əraf, 139)**[29]

Buradan da aydın olur ki, Şeyx Muhəmməd ibni Abdulvəhhab dəvətini açığa vurmazdan öncə də tövhid dəvətinin həqiqətini anlayan, şirk və bidət kimi əməllərdən çəkinən alimlər də var idi, lakin hansısa səbəblərdən dolayı susurdular.

Həmçinin şeyxin elmindən faydalandığı və ondan icazətlər aldığı digər alim **Şeyx Abdulbaqi əl-Hənbəlidir**. Onun yanında *"Səhihu Buxari"*ni, *"Səhihu Muslim"*i və onların şərhlərini müəlliflərinə kimi çatan bir sənədlə oxudu. O cümlədən *"Sunənu ət-Tirmizi", "Sunənu ən-Nəsai", "Sunənu Əbi Davud", "Sunənu İbni Macə"* və **Dariminin** əsərlərini müəlliflərinə kimi çatan bir sənədlə oxudu. Bunlardan başqa **İmam Şafinin** *"Müsnəd"*-ini, **İmam Malikin** *"Muvatta"*-sını, **İmam Əhmədin** *"Müsnəd"*-ini və digər əsərləri şeyxin dizinin dibində oxumuşdu.

---

[26] *"ər-Rəsailuş-Şaxsiyyə, 28-ci məktub s.186", "əd-Durəru-s-Səniyyə, 17/18"*
[27] İbnu Seyfinin doğuldu yerin adıdır. Çox güman ki, orada aparacağı dəvət üçün elm biriktirirdi və həmin elmi silah olaraq təsvir etdi.
[28] *"U'nvanul-məcd fi Tarixin-nəcd, 1/7"* - Osman ibni Abdullah ibni Bişr
[29] *"U'nvanul-məcd fi Tarixin-nəcd, 1/7"*

Həmçinin Şeyx Muhəmməd ibni Abdulvəhhabın Hicaz bölgəsində faydalandığı alimlərdən **Şeyx Ali Əfəndi əd-Dağistani**, **Şeyx İsmail əl-A'cluni**, **Şeyx Abdullatif əl-A'faliqi əl-Əhsai**, **Şeyx Muhəmməd əl-A'faliqi əl-Əhsai** kimi alimlər də var. Şeyx Ali Əfəndi əd-Dağistani ona oxuduğu elmlərə dair icazət vermişdi.[30]

Sonra isə Şeyx Mədinədən Nəcdə qayıtdı, daha sonra elm tələbini davam etdirmək üçün İraq tərəfinə **Bəsrəyə** yönəldi. Şeyx Abdurrahman ibni Həsən onun bir neçə dəfə Bəsrəyə gedib gəldiyini bildirir. Şeyx Muhəmməd orada bir çox alimlərin yanında təfsir, hədis, lüğət kimi elmlərdən dərslər aldı. Orada **Muhəmməd-əl-Məcmui'** adında bir şeyxin yanında elm aldı, ondan ərəb dili elmləri ilə bağlı dərslər aldı. Tövhidə dəvətə də ilk dəfə burada başladı, şirk və bidətlərə qarşı çıxdı və bunu elan etdi. Şeyx əl-Məcmui' onun sözlərini gözəl qarşıladı və dəvətinə müvafiq oldu.[31] Şeyx Abdurrahman ibni Həsənin bildirdiyinə görə Şeyx Muhəmməd ibni Abdulvəhhab *"Kitabut-Tövhid"* adlı kitabını orada olarkən yazıb.[32]

Beləcə şeyx insanları şirk və bidət əməllərdən çəkindirdi, onları Qurana və Sünnəyə bağlanmağa çağırdı. Bu mövzuda oradakı bir çox insanlarla müzakirələr və münazərələr etdi. Bu barədə demişdir:

***"Bəsrənin müşrikləri mənə bəzi şübhələr gətirirdilər. Yanımda oturmuşdular və mən dedim: "ibadətin bütünü yalnız Allah üçün olduğu zaman doğru olar." Hamısı çaşıb qaldı, ağızlarını açıb bir şey demədilər."***[33]

Şeyxin dəvətini həzm edə bilməyən Bəsrədəki bəzi pis niyyətli alimlər ona ve şeyxinə qarşı çıxaraq bir çox əziyyətlər verdilər. Bu səbəblərdən dolayı o, Bəsrədən ayrılaraq **Şam** bölgəsinə getməyə qərar verir. Ancaq maddi imkanının yetərsizliyindən dolayı ora gedə bilmir. Zubeyrə adlı bölgəyə, oradan da Əhsa adlı yerə gedir. Deyilənə görə şeyx Zubeyrə gedərkən yolda quldurlara rast gəlir, onlar əlindəkilərini alıb, özünü də döyürlər. Şeyx susuzluq və taqətsizlik içərisində Zubeyrə ayaqla gedir. Özü ilə birlikdə səfər üçün hazırladığı malının oğurlanması səbəbi ilə Şama gedə bilmir və Əhsaya qayıdır. Orada ilk öncə **Şeyx Qazi Abdullah ibni Abdullatif əş-Şafinin** yanında qonaq olur. Ondan *"Səhihu Buxari"*-nin şərhi olan *"Fəthul-Bari"*-ni başdan sona kimi oxuyur, iman məsələsində **Hafiz İbni Hacərin** etdiyi xətaları ona açıqlayır. Əşarilərin Buxarinin kitabında yazdığı hədislərə və rəvayətlərə müxalif olduqlarını açıqlayır. Bir çox mövzularda və məsələlərdə oranın alimləri ilə münazərələr edir, hətta bu məsələ Əhsa və digər nəcdlilərin arasında məşhur olur.[34]

Həmçinin Əhsada olduğu vaxtlarda **Abdullah ibni Feyruz** və **Əbu Muhəmməd əl-Kəfif**[35] kimi alimlərdən də faydalanır, İbni Teymiyyə və İbnul Qayyimin ona gizli qalan kitablarını oxuyur. İmam Əhmədin əqidəsini yaxşı bilməsinə görə Şeyx Abdullahı övərdi.[36]

---

[30] Bax: *"Əsərud-davati əl-vahhabiyyə, s.47"*, *"əl-Mədxal ilə məzhəbil imam Əhməd ibni Hənbəl, s.447"*-Şeyx Abdulqadir ibni Bədran əd-Diməşqi (Dr.Abdullah ibni Abdulmuhsin ət-Turkinin təhqiqi ilə)

[31] *"Unvanul-məcd fi Tarixin-nəcd, 1/7"*

[32] *"əl-Maqamat, s.3"*

[33] *"Tarixun Nəcd, 1/27"*

[34] *"əl-Maqamat, s.4"*

[35] Əbu Muhammэd əl-Kəfif daha sonra şeyxin dəvətinə qarşı çıxanlar arasında idi.

[36] *"əl-Maqamat, s.3"*

Sonra **Hureymila** adlı bölgəyə yönəlir[37] və atası vəfat edənə qədər (m.1740) burada elm təhsilinə və tədrisinə davam edir. Əsasən Şeyxül-islam İbni Teymiyyənin və İbnul Qayyimin kitablarını əzbərləyəcək səviyyədə oxuyur və məsələləri öyrənir, bəzi qeydlər və müxtəsərlər yazır. Atasının dərs halqalarına və elmi məclislərinə qatılır, qazilik və fətva ilə bağlı işlərində ona kömək edir.

Şeyx Muhəmməd ibni Abdulvəhhabın elm tələbi yolundakı həyatını incələdiyimiz zaman onun elminin və bəsirətinin formalaşmasında əsasən 3 alimin təsiri olduğunu öyrənmiş oluruq. Həmçinin həmin alimlər şeyxin dəvəti ilə bağlı fikirlərinə qarşı çıxmadıqlarını, ona müvafiq olduqlarını, hətta dəstək olduqlarını görürük. Həmin alimlərdən ikisi muhəddis alim **Şeyx Abdullah ibni Seyfi** və **Şeyx Muhəmməd Hayatus- Sindi əl-Hənəfidir**. Digəri isə Bəsrədə ikən elmindən faydalandığı **Muhəmməd-əl-Məcmui'**-dir. Bunlardan başqa bir çox alimlərdən icazət aldığını da öyrənmiş olduq.[38] Lakin qəlblərində əyrilik olan bəzi pis niyyətli və tövhid dəvətinin düşməni olan insanlar Şeyxin elminə kölgə salmaq və dəyərini düşürmək üçün bir çox yalan və iftiralarla insanları aldatmağa çalışırlar. Onun haqqında ən çox yayılan yalanlardan biri də Şeyxin heç bir alimin yanında oxumadığı, kimsədən icazət almadığı və ümumiyyətlə alim olmaması ilə bağlı içərisi boş iddialardır. Bu kimi yalan və iftiraların yayanlardan biri də Osman ibni Mansur idi. Şeyx Abdurrahman ibni Həsən ona qarşı yazdığı *"əl-Maqamat"* adlı rəddiyəsində ilk öncə onun "O, heç bir alimin yanında oxumamışdır" şübhəsinə cavab verir və bunun əslində Şeyxin dəvətinə qarşı aşırı düşmənçilik göstərən Osman ibni Mansurun üç şeyxinə: İbnu Sind, İbnu Cədid və İbni Səluma dayanaraq söylədiyini və onların şeyxin halı haqqında cahil olduqlarını bildirir. Sonra isə şeyxin elm üçün yola çıxdığı səfərlərindən və kimlərdən dərs alması ilə bağlı bilgilər verir və Osman ibni Mansurun əslində özünün cahil olduğunu bildirir:

***"Cavabda deyilər ki: sən, ey İbni Mənsur, Bəsrəyə və Zubeyrə elm dalınca səfər etməyinlə fəxr edirsən və orada üç şeyxin arasında qalmısan. Səni başqalarından deyil sadəcə onlardan elm almağını xas edən şey nədir? Əgər hər kəs ora səfər etsə və alimlərlə birlikdə otursa haqqında yalan və saxtalıqla ittiham olunmayan kimsələrdən elm alması ilə səndən seçilərdi. Sən isə bunda günah və şübhə əhlinin sözünü qəbul etdin. (Şeyx Muhəmməd) Bəsrədə ikən "Kitabut Tövhid"-i yazdı, hansı ki, yaxın və uzaqda olan hər kəs onun bu əsərinin fəzilətinə şahidlik etmişdir. Onu Bəsrədəki mədrəsələrdə oxuduğu hədis kitablarından əldə etmişdir.***[39]

---

[37] Atası Uyeyenədə olarkən oranın əmiri ilə aralarında çıxan problem səbəbi ilə bura köçmüşdür.

[38] Şeyx Muhəmməd ibni Abdulvəhhabın şeyxlərindən aldığı elmin icazətinin sənədləri aşağıdakı kimidir:
1) Atası Abdulvəhhab (v./h.1153) o da atasından, yəni Suleyman ibni Alidən (v./h.1079), o da Muhəmməd ibni Əhməd ibni İsmail əl-Uşaqiridən (v./h. 1059) və şeyxi Əhməd ibni Muhəmməd ibni Muşərrəfdən (v./h.1012), o da Musa əl-Həccavi (v./h.) və Əhməd ibni Yəhya ibni A'tvadan almışdır.
2) Abdullah ibni İbrahim ibni Seyf (v./h.1140), o da Fəvzan ibni Nasrullah ibni Mişab dan (v./h.1149), o da Abdulqadir ibni Ömər ət-Tağlubiyyidən (v./h.1135), o da Əhməd ibni Muhəmməd Həsən əl-Qusayyaridən almışdır.
ət-Tağlubiyy isə Abdulbaqi ibni Abdulbaqi əl-Ba'lidən, o da Alu Teymiyyədən (v./h.1071) və oğlu Əbul Məvahib Muhəmməddən (v./h.1176), o da Muhəmməd ibni Bədriddin əl-Balbanidən (v./h.1083) almışdır.
İbni Seyf isə Əbul Məvahib Muhəmməd ibni Abdulbaqi əl-Ba'lidən icazət almışdır, o cümlədən atasından o da əl-Balbanidən və Muhəmməd ibni Ali əl-Bəhautidən almışdır. (Bax: *"əl-Vəcazəti fil əsbati val icazət, s.134-136"* -Abdullah ibni Abdurrahman ibni Cibrin)

[39] Yəni *"Kitabut-Tövhid"* –dəki hədisləri Bəsrədəki mədrəsələrdə oxuyub öyrəndiyi hədislər əsasında yazmışdır.

***Sən isə ey İbni Mənsur! Elm üçün çıxdığın səfərdən nə ilə qayıtdın? Vaxtın boşa getdi və ad-sanını batırdın, şeyxdən elm almış tələbələrindən elm alan kimsələrdən elm almışların yanında özünü gülünc vəziyyətə saldın. Burada saymağın bir faydası olmadığı bir çox səhvlərini saydılar. Sən isə onların etdiyi bircə səhvi belə nəql etmədin. Bu isə onların Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhabdan elmi alanlardan əldə etdiklərinin bərəkəti ilədir. Bəs elmi ondan (birbaşa) alanları görsən o zaman halın necə olacaq? Lakin sən öz nəfsində həqir birisən.***

***Burada dediklərimin dəlili isə budur ki, O[40], məndən bu söz üzərinə icazət almaq istədi. Ona rəvayət etdiyim hədislər və başqa şeylər üzərinə icazət verdim. Bunu onun hidayət üzərində olduğunu və haqqa tabe olan elm əhlindən oduğunu zənn edərək etdim."[41]***

Həmçinin Osman ibni Mansurun iftiralarına qarşı Şeyx Abdurrahman ibni Həsənin oğlu **Şeyx Abdullatif** *"Misbahuz-Zallam"* adlı kitabında cavab vermişdir.

Daha sonra isə İbni Mansur kimilərindən təsirlənən və onun sözlərindən bir az fərqli şəkildə şeyxin elminə ləkə salmaq istəyən insanlar törədi. Onlar şeyxin Quran ayələrindən istidlal edə biləcək səviyyədə alim olmadığını, nə fəqih, nə təfsirçi, nə də muhəddis olmadığını, alim deyil sadəcə tövhd dəvətçisi olduğu, dolayısı ilə təkfirlə əlaqəli bəzi əhkamlarda onun xəta etdiyini dilləndirən adamlar ortaya çıxdı. Hətta bəzi avam müsəlmanlar da bu məsələdə onların tələsinə düşərək, eyni sözləri dilləndirməyə başladılar. Təbii ki, bunun qaynağı hələ şeyxin öz dəvətini ortaya qoyduğu zamanlarda ona qarşı çıxmış sufi, quburi, əşari və cəhmi azğınlar tərəfindən qoyulub. Bu günləri təkfir əhkamını ortadan qaldıraraq ləğv etmək istəyən bəzi "sələfi" qruplar da bilincli və ya bilincsiz həmin metodu izləməkdədirlər.

Şeyxin istərsə lüğət, istərsə də hədis, təfsir kimi elmlərdə məharət sahibi olduğu onun əsərlərinə nəzər salan və elmin qoxusunu alan hər kəsə bəllidir. Sadəcə öz həsədi və haqqa qarşı olan kini səbəbiylə gözü pərdələnmiş insanlar onu küçümsər və haqqında pis danışarlar. Bu heç də şeyxin xətadan məsum olduğu mənasına gəlmir, lakin tarix gerçəklikləri önümüzə qoyur ki, ona qarşı çıxan və mübarizə aparan insanlar bunu ya həsəd ya da haqqa qarşı dirənmələri səbəbi ilə etmişlər. Yoxsa şeyxin dəvətinin haqq olduğuna müxaliflər də şahidlik edirdilər. Şeyx Muhəmməd ibni Abdulvəhhab öz zamanındakı alimlərə tövhid dəvətini ərz etdiyi zaman ona qarşı çıxanlar "biz tövhidə əhəmiyyət veririk və şirkdən bəri oluruq" deyərdilər, ancaq bəzi məsələlərdəki təfsilatlara girməzlərdi və insanların hallarını qeyd etməzdilər. Məsələn, təkfir və şirk əhlinə qarşı savaşmaq kimi mövzularda danışmazlardı və bu səbəblə şeyxə qarşı çıxdılar. Necə ki, bu barədə özü bəhs edərkən demişdir:

***"Dediklərim üzərində mənə müvafiq oldular, iki məsələdə isə mənə qarşı çıxdılar: təkfir və savaşmaq məsələsində"***[42]

Onların bu halı necə də Allah rəsulu səllallahu aleyhi vəsəlləm)-in əmisi Əbu Talibin halına bənzəməktədir. O, qardaşı oğlunun haqq din üzərində olduğunu bildirərdi və bununla yanaşı onun dininə tabe olmağa mane olan şeyin də məhz

---

[40] Yəni Osman ibni Mənsur. O, Şeyx Abdurrahman ibni Həsəndən dərs alıb.

[41] *"əl-Maqamat, s.3","əd-Durərus-Səniyyə, 12/7"*

[42] *"ər-Rəsailuş-Şəxsiyyə, s.25"*

babalarının küfr üzərində olduqlarına şahidlik etmək istəməməsi idi.[43] **İbnul Qayyim** *"Mihtəfu Darus-Səadə, 1/97"* bu barədə demişdir:

***"Əbu Talib və bənzəriləri öz atalarının və əcdadlarının küfr və zəlalət üzərində olduqlarına şahidlik etməkdən uca tutdular ki, məhz elə bu onların İslamı qəbul etmələrinə mane oldu."***

Əlbəttə ki, Əbu Talib və Qureyş kafirləri bu məsələni eşitdikləri Allah kəlamından və Rəsulun dəvətindən anlaya bilmişlər.[44] Çünki onlar ərəb lüğətinin ən saf çağında yaşayırdılar və onun əhli idilər. Amma Şeyx Muhəmməd ibni Abdulvəhhaba qarşı çıxanlar ərəb müşriklərinin bu kəlimədən anladığını anlaya bilməmişdilər. Lüğətin cahili olmaları səbəbi ilə onlardan bir qismi ilah kəliməsini ibadət edilən mənasında deyil yaradan və ruzi verən mənasında təfsir edirdilər. Digər qismi isə təkfirin vacib olmadığını, Allahın bizi onunla məsul tutmadığına inanaraq bu əhkamı əhəmiyyətə almırdı. Şeyx Muhəmməd ibni Abdulvəhhab isə onların əksinə bunun bir ibadət olduğunu, yerinə yetirməyən kimsələrin İslamlarının səhih olmayacağını bildirirdi. O, bu cür demişdir:

***"Kim iddia etsə ki, Allah mürtədləri təkfir etməyi bizə ibadət olaraq buyurmayıb, bizi onlardan və böyük şirkə düşən kimsələrin təkfirindən məsul tutmayacaq, bununla o, Allaha ən böyük iftiranı atmışdır"***[45]

Həmçinin demişdir:

***"Tağuta küfr etmənin mənası:[46] Allahdan qeyri cinni və ya insi, ağac və ya daş və ya bundan başqa (ilahlığına) etiqad olunan hər bir şeydən bəri olmağın, atan və ya***

---

[43] Hətta bu barədə Əbu Talibin məşhur bir qəsidəsi var. Orada Muhəmməd (səllallahu aleyhi və səlləm)-in dininin ən xeyirli din olduğunu, əgər atalarını söyməsə, küfr və zəlalət ilə ittiham etməsəydi hər bir halda ona tabe olacağını bildirir. (Bax: *"Miftəhu Darus-Səadə, 1/97-98"*)

[44] **Əbu Ya'lanın** *"Müsnəd"*-ində mərfu olaraq rəvayət etdiyi bir hədisdə Allah Rəsulu (səllallahu aleyhi və səlləm) bu cür buyurmuşdur:

***"Kim mənim əmimə ərz etdiyim və onun da rədd etdiyi kəliməni məndən qəbul edərsə, bu onun üçün qurtuluş olar"***

Həmçinin **İbni Sad** *"Tabakatul Kubra"*-da həmin hədisi bu ləfzlə rəvayət etmişdir:

***"Əbu Bəkr dedi ki: Allah Rəsulundan soruşdum:-Ey Allahın Rəsulu! Bu ümmətin qurtuluşu nədir? Dedi ki: "Kim mənim əmimə ərz etdiyim və onun da rədd etdiyi kəliməni məndən qəbul edərsə bu onun üçün qurtuluş olar" Sonra isə Əbu Bəkr dedi:- Onun əmisinə ərz etdiyi kəlimə, Lə iləhə illəllaha və Muhəmmədən Rəsulullaha şəhadət etmək idi."***

Əbu Talib və digər ərəb müşrikləri bu kəlimə ilə nəyin qəsd edildiyini (atalarının küfr üzərində olduğuna şahidlik etmələrinin gərəkdiyini) anlamışdılar. Lakin bugünkülər bu kəlimə ilə nələrin qəsd edildiyini anlaya bilmirlər. Bu səbəblə də təkfirsiz də İslamın keçərli ola biləcəyinə inanırlar.

[45] "*əd-Durərus-Səniyyə, 2/120*"

[46] Şeyx Muhəmməd tağutlardan bəraət edib, onları təkfir etmədikcə kimsənin İslamının səhih olmayacağını bildirmişdir: ***"Əksinə, onlardan-yəni Allahdan savayı ibadət dilən tağutlardan bəraət etmədikcə və onları təkfir etmədikcə İslam dini səhih olmaz. Necə ki, Allahu təala buyurmuşdur: «Kim tağuta küfr edib Allaha iman edərsə, qopmaq bilməyən sağlam qulpdan yapşmış olar.» (Bəqərə, 256)"*** *"əd-Durərus-Səniyyə, 10/53"*

Həmçinin demişdir: ***"Tağuta küfr etmənin sifəti isə: Allahdan qeyrisinə edilən ibadətin batilliyinə etiqad etməyin, onu tərk etməyin, buğz etməyin, əhlini təkfir etməyin və onlara düşmənçilik etməyindir. Allaha iman etmənin mənası isə, Ondan başqasına deyil, sadəcə Allahın ibadət edilən tək ilah olduğuna etiqad etməyin, ibadətin bütün növlərini Allaha xas edib, Ondan savayı bütün ibadət olunanları inkar etməyin, ixlas (yəni tövhid) əhlini sevməyin, onları dost tutmağın və şirk əhlinə nifrət edib, onlara düşmənçilik göstərməyindir. Bu, İbrahimin millədir, hansı ki (yalnız) özünü səfehliyə qoyan ondan üz çevirər. Bu isə Allahın bu sözündə xəbər verdiyi (gözəl) örnəkdir: «İbrahim və onunla birlikdə olanlarda sizin üçün gözəl bir örnək vardır. Onlar öz qövmünə demişdilər ki, "biz sizdən və sizin Allahdan başqa ibadət etdiklərinizdən bəriyik. Biz sizi rədd***

***qardaşın olsa belə onların üzərinə küfr və zəlalət ilə şahidlik etməyin və onlara buğz etməyindir. "Mən yalnız Allaha ibadət edirəm və mən başçılara və qəbrlərin üzərindəki türbələrə etiraz etmirəm"- və buna bənzər (sözlər) deyən kimsəyə gəldikdə isə o, Lə ilahə illəllah sözündə yalançıdır. O, Allaha iman etməyib və tağuta küfr etməmişdir”*** [47]

Yenə demişdir:

***“Və sən ey, özünə Allahın İslamı nemət verdiyi və Allahdan başqa bir ilahın olmadığını bildirdiyi kimsə! Zənn etmə ki, "Bu haqqdır və mən Ondan başqa (saxta ilah) olanları tərk edirəm, lakin müşriklərə qarşı çıxmıram və onlar haqqında bir şey demirəm" - dediyin zaman bununla sənin İslama girməyin hasil olacaq! Əksinə, onlara buğz etməyin və onları sevənlərə buğz etməyin, onlara ağır sözlər deməyin və düşmənçilik göstərməyin labüddür. Necə ki, atan İbrahim və onunla birlikdə olanlar demişlər: “İbrahim və onunla birlikdə olanlarda sizin üçün gözəl bir örnək vardır. Onlar öz qövmünə demişdilər ki, “biz sizdən və sizin Allahdan başqa ibadət etdiklərinizdən bəriyik. Biz sizi rədd edirik. Siz bir olan Allaha iman gətirincəyə qədər bizimlə sizin aranızda əbədi düşmənlik və nifrət başlamışdır!” (Mumtəhinə, 4) Allahu təala demişdir: “Kim Tağuta küfr edib Allaha iman edərsə, o, artıq (qırılmaq bilməyən) möhkəm bir qulpdan yapışmış olur.” (Bəqərə, 256) Və Allahu təala demişdir: “And olsun ki, Biz hər ümmətə: “Allaha ibadət edin, Tağutdan çəkinin! – deyə peyğəmbər göndərmişdik.” (Nəhl, 36)***

***Əgər bir nəfər desə ki: Mən peyğəmbər (səllallahu aleyhi və səlləm)-ə tabe oluram və o haqq üzərinədir, lakin Lata, Uzzaya qarşı çıxmıram, Əbu Cəhl və bənzərilərinə qarşı çıxmıram, onlardan mənə nə" -deyərsə onun İslamı səhih olmaz.”*** [48]

Şeyxin lüğət və təfsir kimi elmlərdən cahil olduğunu iddia edənlərin əslində özləri bu fənnlərdən cahildir. Bunun üçün onun risalələrinə və yazmış olduğu əsərlərinə, fətvalarına nəzər salmaq, məsələlərə dair dəlillərdən istinbat etməsinə, ayələri hədis və rəvayətlər işığında dəyərləndirməsi üsuluna baxmaq kifayətdir. Bu səbəbdən şeyxin təlif etdiyi *“Kitabut-Tövhid”* kitabı əvəzolunmazdır. Babların başlıqları və ardıcıl olaraq sıralanması, ayə və hədisləri babların ünvanına uyğun olaraq toplaması, onları təfsir mahiyyətində qeyd etməsi, sonunda hər ayə və hədisdən çıxarılan önəmli məsələləri qeyd etməsi, bütün bunların hamısı bir cahilin edə biləcəyi işlər olmadığını göstərir.

Onun fəqih olmasına gəlincə, daha öncə qeyd etdiyimiz kimi hələ gənc yaşlarında ikən Hənbəli məzhəbinin önəmli kitablarını atası və əmisi ilə oxuyaraq, məsələləri əzbərləmişdi. Ümumiyyətlə onun doğulduğu və böyüdüyü ailə bu məzhəbin fəqihlərindən ibarət alim bir ailə idi. Bununla yanaşı şeyx elm tələbi üçün çıxdığı səfərlərdə də məzhəbin əsas kitablarını alimlərin dizinin dibində oxuyub öyrənmişdir. Hətta öyrəndikləri məsələlərdə onlarla münazərə və müzakirələr də edirdi. Eyni

***(təkfir) edirik. Siz bir olan Allaha iman gətirincəyə qədər bizimlə sizin aranızda əbədi düşmənlik və nifrət başlamışdır!» (Mumtəhinə, 4)”*** *“əd-Durərus-Səniyyə, 1/161”*

Yenə demişdir: ***“Bil, ki. İnsan tağutu təkfir etmədikcə Allaha iman etmiş sayılmaz. Bunun dəlili Allahu təalanın bu sözüdür: «Artıq rüşd (doğru yol) ğaydan (azğınlıqdan) fərqlənmişdir. Kim tağuta küfr edib Allaha iman edərsə, qopmaq bilməyən sağlam qulpdan yaışmış olar.» (Bəqərə, 256) Rüşd: Muhəmməd (səllallahu aleyhi və səlləm)-in, Ğayy isə Əbu Cəhlin dinidir. Qopmaq bilməyən qulp isə Lə ilahə illəllaha şəhadətdir.”*** *“əd-Durərus-Səniyyə, 1/163”*

[47] *“əd-Durərus Səniyyə, 2/121-122”*

[48] *“əd-Durərus Səniyyə, 2/109*”

zamanda məzhəbin əsas kitablarını müxtəsər edərək kitab halına salmışdır. **Şeyx Abdulqadir ibni Bədran** *"əl-Mədxal"* kitabında Hənbəli məzhəbində yazılmış məşhur kitabları qeyd edərkən Şeyx Muhəmməd ibni Abdulvəhhabın *"Muxtasaru Şərhul Kəbir vəl İnsaf"* adlı kitabından bəhs edir. O, bu kitabında bab açıaraq *"Şərhul Kəbir"*[49]-dən məsələləri qeyd edib və sonra isə *"əl-İnsaf"*-dan əlavələr etmişdir.[50]

### *Dəvətdən öncə İslam coğrafiyasının vəziyyəti*

Şeyxin dəvətinin həqiqətini anlaya bilməyimiz üçün onun dəvətini izhar etdiyi dövrdəki İslam coğrafiyasının dini vəziyyətinə baxmağımız gərəkir. Tövhid dəvətinin elan edildiyi hicri 12-ci əsrdə İslam coğrafiyasında üç əsas dövlət mövcud idi :

1) Osmanlı dövləti 2) İrandakı Səfəvi dövləti 3) Hindistanda Moğol dövləti[51]

Bunların içərisində ən böyük gücə sahib olan Osmanlı dövləti idi ki, başqa bir ifadə ilə xilafət adını daşıyırdı. Ancaq Osmanlı dövləti hicri 12-ci əsrdə geriləmə dövrünə girmişdi və yuxarıda qeyd etdiyimiz kimi müsəlmanlar arasındakı dini vəziyyət getdikcə daha da pisləşirdi. Bu da iki əsas mərkəz olan **İstanbul** və **Əzhər** alimlərinin dini vəziyyəti istədikləri kimi idarə etmələrinə, öz köhnə adətlərinə bağlı qalmalarına şərait yaratmışdır. Həmçinin dövlət idarəsinin bu vəziyyətə heç bir halda müdaxilə etməməsi onlara müəyyən sərbəstliklər verməsinə və bunun nəticəsində hər hansı bir islahatın gerçəkləşdirilməsini çirkin görmələrinə səbəb olmuşdur. Beləki, islahat yönlü fikirə sahib olan hər bir kəsi kafir belə adlandırmışdılar. Dolayısı ilə Osmanlı dövləti Şeyx Muhəmməd ibni Abdulvəhhabın dəvət və islah yönlü hərəkatını dindən çıxmaq, riddət olaraq qəbul etmişdir.

Bununla yanaşı Osmanlı dövlətində idarəetmədəki güclər bidət əhlinə, sufilərə və azmış din adamlarına hər cür fikir azadlıqlarını vermişdir. Onların məqamlarını xalqın yanında o dərəcədə ucaltmışdılar ki, xalq o kimsələrin övliya və saleh kimsələr olduğuna inanırdı və onların hər bir sözlərinin haqq olduğunu qəbul edirdi.

Beləliklə, İslam aləmindəki vəziyyət - istər Ərəbistan yarımadası olsun istərsə də digər bölgələr - tamamilə inanc əsaslarına zidd bir şəkildə xürafatlar və bidətlərlə dolu idi. Bunu Şeyx Muhəmmədin dəvət tarixini və eləcədə dövrün gündəmini qeydə alan tarix kitablarından aydın görmək mümkündür.

Hicri 12-ci əsrdə İslam coğrafiyasında yayğın olan şirk və bidətlərə misal olaraq bunları qeyd etmək olar :

**- Misirdə :** Qahirə şəhərində 294-dən çox məzar-tübələr var idi. Onlardan ən məşhurları:
**"Hüseynin başı"** türbəsi, **"Səkinə xanım"** türbəsi, **"Nəfisə xanım"** türbəsi, **"Zeynəb xanım"** türbəsi, **"İmam Şafi"** türbəsi, **"Leys ibni Sad"** türbəsi və s.-dir. Qahirənin xaricindəki türbələrdən isə ən məşhur olanı **Tanta** şəhərindəki **"Seyyid Bədəvi"** türbəsidir. Bu türbələrin hər birinin üzərində məscidlər, camilər bina edilib.

**- Şam bölgəsinə** gəlincə ən böyük türbə və məzarlıqlar orada idi. Təkcə **Dəməşq** və

---

[49] İbni Qudamə əl-Maqdisinin *"əl-Muqni'"* kitabının şərhidir.

[50] *"əl-Mədxal ilə məzhəbil imam Əhməd ibni Hənbəl, s.447-448"*-Şeyx Abdulqadir ibni Bədran əd-Diməşqi (Dr.Abdullah ibni Abdulmuhsin ət-Turkinin təhqiqi ilə)

[51] Bax : *"əl-Mucəddidin fil İslam min qarnil əvvəli ilər-rabi' aşara, s.416-418"*- Abdülmütəa'l Səidi

onun ətrafında 194-dən çox qəbr və məzarlıqlardan ibarət türbələr var idi. Onlardan 27-sinin səhabəyə məxsus qəbrlər olduğu zənn edilirdi, hansı ki, hər birinin üzərində türbələr var idi. İnsanlar təbərrük və ibadət niyyəti ilə oraları ziyarətgaha çevirmişdilər.

Ümumən Şam bölgəsinə gəldikdə isə, **Livanın** cənubundakı Saydən deyilən ərazidə **Yəhya ibni Zəkəriyyənin** məzarı, cənub-şərqində **Şamonun** məzarı, cənub-qərbində **Saydonun** və **Davud** (aleyhissəlamın) məzarı, **Fələstində** Yafada **Əyyub, Saleh** (aleyhissəlam) məzarları, **əl-Xəlil** şəhərində böyük məscidin daxilində yerləşən **İbrahim, İshaq, Yaqub, Yusuf** (aleyhimussəlam) məzarları, Halhul şəhərində **Yunus** (aleyhissəlamın) türbəsi və s. digər qəbrlər var, hansı ki, onların peyğəmbərlərə məxsus olduqlarını iddia edirlər. Bununla yanaşı bir çox səhabəyə aid olduğu iddia edilən qəbrlər də var, halbuki həmin səhabələrin Mədinədə dəfn edildiyi qeyd edilmişdir.

**- İraqda** isə daha çox miqdarda qəbrlər var idi. **Bəsrədə** bir çoxunun səhabələrə məxsus olduğu iddia edilən türbələr var idi: **Zeyd ibnul A'vvamın** türbəsi, **Utbə ibni Ğazvanın** türbəsi, **Talhatul Xayr** türbəsi, **Miqdad ibnul Əsvədin** türbəsi, **Abdurrahman ibnu A'vf, Ənəs ibni Malik** (radiyallahu anhum) kimi bir çox səhabənin qəbrləri, türbələri var idi. Üstəlik bunların yanına rafizilərin Kəbədən daha çox təzim edib ziyarət etdikləri **Nəcəf** və **Kərbəla** kimi şəhərlərdəki məzarları, qəbrləri əlavə edincə insanların necə də şirk və küfr bataqlığının içərisində batdıqlarını təsəvvür etmək mümkündür.

**- Osmanlının** paytaxtı olan **İstanbula** gəldikdə isə burada 481-ə yaxın cami var və hər birində türbələr mövcuddur.

**- Hind bölgəsində** isə 150-dən çox məşhur türbələr mövcuddur.[52]

Beləliklə, Şeyx Muhəmmədin dəvətinin ortaya çıxdığı hicri 12-ci əsrdə, əksəriyyəti Osmanlı imperiyasının tərkibində yerləşən bu ərazilərdə şirk və bidətlərin nə dərəcədə yayğınlaşdığını tarixi qaynaqlardan görməkdəyik. Daha öncə qeyd etdiyimiz kimi bu cür şirklərin və bidətlərin yayğınlaşmasına başlıca səbəb xalqın və hökümətin yanında etibar qazanmış və din mövzusunda sərhədsiz səlahiyyətlər verilmiş təriqət "şeyxləri" və "hocaları" idi. Tasavvuf və təriqət şeyxlərinin nüfüzu hətta dövlət strukturlarına qədər yüksəlmişdir, dövlət rəsmən təriqət və tasavvufun müdafiəçisi halına çevirilmişdir. Eyni zamanda bu təriqət şeyxlərini İslam adına danışan bir çox alimlər də dəstəkləyirdi. Bunların sayəsində hətta təriqət şeyxləri, sufilik ideologiyasına sahib olan bəziləri **Əzhərin şeyxliyinə** qədər gəlib çıxa bilmişdilər. Şirk və bidət xürafatları artıq Osmanlının bütün torpaqlarına yayılmışdır. Osmanlı "xilafət" adı ilə bir növ şirkin və xürafatların hamisi halına çevirilmişdir. İnsanlar heç bir dini və əqli dayanağı olmayan mövzularda azdırıcı şeyxlərə, imamlara tabe olurdular.

**Abdülmütəal Səidi** bu barədə bu cür qeyd etmişdir:

---

[52] Bax : *"əd-Davatul islahiyyə fi bilədin nəcd, 45-57"* - Abdullah ibni Muhəmməd ibni Abdul Muhsin əl-Matuu', *"İntişaru davatuş şeyx, 32"* – Muhəmməd Cum'a,*"Aqidatuş şeyx əs-sələfiyyə, 1/48-105"* – Dr. Abbud, *"İhtisabuş şeyx Muhəmməd ibni Abdulvəhhab, 52-66"* - Mərifət bintu Kamil ibni Abdullah Əsra, *"Dəm'atu alə-t-tovhid haqiqatul quburiyyə və əsaruhə, 24-37"*, *"Təhzirus səcid min ittixazul qubur məsəcid"* - Nasuriddin əl-Albani

*“Dəli Muhammәd ibni Əbi Bәkir әl-Mәğribi әt-Tarablusi* (v./h.1201/m.1786) ***övliya olduğuna inanılan kimsәlәrdәn birisi idi. İçki mәclislәrini sevәr vә öz mәclisinә qadınları toplayardı. Bununla yanaşı alim vә dәyәrli bir çox kimsәlәr ona hörmәt edәr, onun haqqında gözәl xәbәrlәr nәql edәrlәrdi. Hәmçinin әyalәt valilәri dә onun vasitәçiliyini (aracılığını) rәdd etmәzlәrdi”***

Hәmçinin bu barәdә başqa bir örnәk verәrәk demişdir:

*“Şeyx Bәkri* (v:h.1207/m.1792) ***daha öncәlәri dәli birisi idi. Küçәlәrdә başı açıq vә baldırı çılpaq bir şәkildә dolaşardı. Misir xalqı hәr dәliyә inandıqları kimi bunun da vәli olduğuna inanmağa vә ona kәramәtlәr nisbәt etmәyә başladılar.”***

Tarixçi **Abdurrahman Cәbәrti** “keçi hadisәsi” ilә әlaqәli olaraq bunu qeyd etmişdir :

***“Misirdәki Nәfisә Xanım türbәsinә xidmәt edәn bir nәfәr Nәfisә Xanımın türbәsinә bir keçi gәtirmiş vә Nәfisә Xanımın bu keçi haqqında yaxşı şeylәri ona tövsiyә etdiyini iddia etmişdir. İnsanlar da bu keçiyә bәzi kәramәtlәr nisbәt edәrәk ona qiymәtli hәdiyyәlәr göndәrәrlәrdi.”***

- **Nәcd bölgәsinә** gәldikdә isә, insanlar qәbrlәrә, ağaclara, daşlara vә övliyalara aşırı tәzimlәr göstәrәrәk İslam inancından uzaq bir zәlalәtin içәrisinә düşmüşdülәr. Bu barәdә Şeyxin dәvәti ilә bağlı Nәcd tarixini dürüst şәkildә qәlәmә alan vә bu mövzuda güvәnilәn tarixçilәrdәn biri hesab olunan **Əbu Bәkr Hüseyn ibni Ğannam әl-Əhsai** 12-ci hicri әsrdә Ərәb yarımadasındakı insanların halını *“Ravzatul әfkar vәl әfham”* [53]adlı әsәrindә tәsvir etmişdir. Orada demişdir :

***“12-ci hicri әsrin başlanğıcında insanlar tamami ilә şirkin içinә dalmışdılar vә cahiliyyә zamanına geri dönmüşdülәr. Elm vә bәsirәt әhlinin yoxluğundan, cahillәrin çoxalması, hәva vә zәlalәt sahiblәrinin ucaldılması sәbәbi ilә onların arasından İslamın vә sünnәnin nuru silinmişdir. Allahın Kitabını arxalarına ataraq atalarını zәlalәt üzәrindә gördüklәri şeylәrә tabe oldular. Onları haqqı daha yaxşı dәrk edәn vә hidayәt yolunu әn yaxşı bilәn kimsәlәr olduğunu zәnn edәrәkdәn bunu etdilәr....”***

Daha sonra insanların arasında yayğınlaşmış zәlalәt, bidәt vә şirkin növlәrinә misallar verәrәk onların halarını qeyd etdi. İnsanlar arasında qәbrlәrdәn, ağaçlardan, daşlardan vә övliya olduğuna inanılan şәxslәrdәn yardım dilәmәk onlardan sıxıntı vә bәlaları dәf etmәlәri üçün dua edib yalvarmaq, bәzi ehtiyaclarından ötrü qurban kәsmәk, nәzir vermәk, vasitәçi tutmaq vә s. kimi bir çox şirk çeşitlәrini eyniliklә bu toplumda görmәk mümkün idi. **İbni Ğannamın** әsәrindә qeyd etdiyi hәmin şirk növlәrinә dair sözlәri müxtәsәr olaraq aşağıdakı şәkildәdir :

1. **Qәbrlәr:** ***“Cübәylәdә Ömәr (radiyallahu anhu)-nun qardaşı Zeyd ibni Xattab (radiyallahu anhu)-nun qәbri, Şәib Ğubeyrada sәhabәnin böyüklәrindәn olan Yәmamәdә şәhid olmuş Dırar ibni Əzvәr (radiyallahu anhu)-nun, hәmçinin Diri'yyә-dә Qaryuh deyilәn yerdә sәhabәdәn bәzilәrinin qәbrlәri var idi. Xalqdan cahil olanlar bu qәbrlәrә gedәrәk orada yatanlardan sıxıntılarını götürmәlәri, başlarına gәlәn bәlaları ortadan qaldırmaları vә ehtiyaclarını yerinә yetirmәlәri üçün onlara yalvarardı.”***

[53] *“Tarixun Nәcd”* adı ilә dә tanınır.

**2. Ağaclar:** ***"Rəvayətə görə qadın və kişilər, erkək xurma ağaclarının bol olduğu "Buleydətul-Fədda" adlanan yerə gedib "Fəhhal"adlanan ağacdan bərəkət umardılar və bu ağacın onlara fayda verəcəyinə inanarlardı. Ərə gedə bilməyən qadın bu ağaca gələrək iki əli ilə ağaca sarılar və probleminin ortadan qalxmasını ümid edərək bu cür dua edərdi:***

***"Ey erkəklərin erkəyi, bu il sona çatmadan bir ər istəyirəm"***

***Eyni şəkildə "Tarafiyyə" adlanan ağaca tez-tez çoxlu insanlar gələrdi və ondan bərəkət umarlardı. Qadınlar isə oğlan uşağı doğularsa onu ölməkdən qoruması üçün bu ağaca bir parça bağlayardılar."***

**3. Daşlar:** ***"Rəvayət edildiyinə görə bu daşlardan biri "Əmirin Qızının mağarası" idi. Güya fasiq bir kimsə əmirin qızına təcavüz etmək istəyəndə Allahu Təala onu qorumaq üçün mağaranı yardığını iddia edirdilər. İnsanlar mağaraya ət, çörək və müxtəlif cür hədiyyələr gətirərlərdi."***

**4. Övliyalar:** ***"Rəvayət edildiyinə görə Xarac şəhərində xalq arasında övliya olduğu söylənən "Tâc" adlı birisi var idi. İnsanlar bu adamı o qədər çox sevərdilər ki, hətta onu tağutlaşdırıb ona bəzi nəzirlər edərlərdi, ona yalvarardı, onun fayda və zərər verdiyinə inanarlardı. İnsanlar ehtiyaclarını yerinə yetirməsi üçün gözləri görməyən bu kimsəyə toplu şəkildə gələrlərdi. Onun bu halı ilə Xarac şəhərindən Diri'yyə şəhərinə tək başına gəldiyini iddia edərlərdi və bunları ona nəzirlər vermək və pul toplamaqdan ötrü edərlərdi."***[54]

İnsanların içərisinə düşdüyü vəziyyətin heç də Rəsulullah (səllallahu aleyhi və səlləmin) göndərildiyi Məkkəli müşriklərin durumundan fərqlənmədiyini buradan açıq şəkildə görmək mümkündür. O gün saleh olduğuna inanılan *Lat, Uzza, Mənat* kimi bütlərə ibadət edirdilərsə, onlardan yardım istəyib, sıxıntılarını götürmələri üçün onlara yalvarır və vasitəçilər tuturdularsa şeyxin zamanında da yuxarıda adı keçən qəbrlərdən bunu istəyirdilər. O gün müşriklər *"Zatu-Ənvat"* deyilən ağacdan bərəkət umurdularsa, şeyxin zamanında da *"Fəhhal"*adlı ağacdan bunu tələb edərdilər. O gün tələb edilib istənilən dikinə qoyulmuş bütlər idisə, şeyxin zamanında, o cümlədən günümüzdə də tələb edilib istənilənlər eninə qoyulmuş qəbrlər üzərindəki bütlərdir.[55] Fərq sadəcə həndəsi ölçü qədərindədir. Necə ki, **Şeyx Muhəmməd** həmin vəziyyəti özünün *"Qavai'dul Ərba'"* adlı kiçik risaləsində bu cür ifadə etmişdir:

***"Peyğəmbər (səllallahu aleyhi vəsəlləm) fərqli-fərqli şəkillərdə ibadətlər edən insanların arasına göndərildi. Onların bir qismi mələklərə, bir qismi peyğəmbərlərə, bir qismi salehlərə, bir qismi ağac və daşlara, bir qismi də günəşə və***

---

[54] Müxtəsər olaraq, bax : *"Tarixun Nəcd, 1/10"*

[55] Qəbrlərin bütlərə çevrilməsinin dəlili Allah Rəsulunun (səllallahu aleyhi və səlləmin) hədisidir. **İmam Malik** *"Muvatta"*-da Ata ibni Yasardan mürsəl olaraq rəvayət etmişdir: ***"Allahım! Qəbrimi ibadət edilən büt (halına) çevirmə! Peyğəmbərlərinin qəbrlərini məscid edənlərə Allahın qəzəbi şiddətlidir"*** *"Muvatta: Camius-Salat (85),570"*

**İmam Əhməd** isə *"Müsnəd, 12/314"*-də Əbu Hureyrədən müsnəd olaraq bu cür rəvayət etmişdir: ***"Allahım! Qəbrimi bütə çevirmə. Peyğəmbərlərinin qəbrini məscid edən qövmə Allah lənət etmişdir."***

Hədisdə büt mənasına gələn (الوثن) əl-vəsən kəliməsi işlədilib. Bu isə eyni mənanı ifadə edən (الصنم) əs-sanəm kəliməsindən daha fərqli bir məna daşıyır. Ərəblər surəti olan bütlərə sanəm, surəti olmayanlara isə vəsən deyirlər. (Bax: *"Lisanul-Arab, ص-ن-م"*) Bu isə o deməkdir ki, qəbrlər, ağaclar, daşlar və s. kimi Allahdan qeyri ibadət olunan surəti olmayan hər bir şey büt adlanır. *(T.e)*

***aya ibadət edərdi. Rəsulullah (səllallahu aleyhi vəsəlləm) bunların hamısı ilə aralarında bir fərq qoymadan savaşdı. Bunun dəlili isə Allahu təalanın bu sözüdür:***

***«Fitnə ortadan qalxıb və din tamamilə Allaha məxsus oluncaya qədər onlarla savaşın» (Ənfal, 39)"***

***Dəvətin başlanması***

Bütün bu gördükləri qarşısında Şeyx Muhəmməd ibni Abdulvəhhab səssiz qala bilmirdi, haqqı bəyan etməyi və bu yolda başına gələnlərə səbr etməyi özünə vacib bilirdi. Lakin o, dəvətini atası vəfat edincəyə kimi açığa vurmur. Buna səbəb atası ilə arasındakı fikir ayrılığının olması və ya atasının onun üzləşəcəyi etiraz və müsibətlərdən ehtiyat etdiyi üçün oğlunu çəkindirməsi olduğu deyilir. Şeyx Muhəmməd atası Abdulvəhhab Nəcdin ən elmli və hörmətli insanı olduğu üçün ona qarşı çıxmaq istəmirdi. Ancaq atası vəfat etdikdən sonra açıqdan dəvətə başladı, insanları şirk və bidət əməllərindən çəkinməyə çağırdı. Yaşadığı bölgədə insanları Allahın əmrlərini tətbiq etməyə dəvət edirdi, onun buradakı əmirləri həddləri uyğulamaya dəvət etməsi bir çoxlarını narahat etdi. Günah və haramları işləyənlərə qarşı şəriətin əmr etdiyi cəzaları tətbiq etməyə təşviq edincə bəziləri bundan dolayı ona kin bəslədi. Beləcə şeyxə əziyyətlər, təhdidlər etməyə başladılar, həmçinin onu öldürməyə də səy göstərdilər.

Daha sonra Şeyx buradan da ayrılıb Uyeynəyə geri döndü. O zaman oranın əmiri **Osman ibni Muammər** idi. Əmirin yanına getdi və dəvətini ona açıqladı, əmir də onu gözəl şəkildə qarşıladı, insanları dəvət etməyə təşviq etdi. Hətta ona dəvətində yardımçı olacağını bildirdi və şeyxin dəvətinə müvafiq oldu. Şeyx insanları tövhidə, Allaha, haqqa yönəlməyə dəvət etdi. İstər qadın, istərsə də kişi olsun, onları bir-birlərini Allah üçün sevməyə dəvət etdi. Bununla Şeyx artıq Uyeynədə məşhur olmuşdu və dəvəti ətraf bölgələrə də yayılmağa başlamışdı, digər bölgələrdən də insanlar onun yanına gəlməyə başladılar.

Bir gün Şeyx əmirə **Zeyd ibni əl-Xattabın**[56] (radiyallahu anhu) məzarı üzərindəki türbəni dağıtmağı təklif edir. Ona bunun doğru bir şey olmadığını, Allahın bu cür əməllərdən razı olmadığını və Rəsulullahın (səllallahu aleyhi vəsəlləm) qadağan etdiyi bir şey olduğunu bildirdi. Həmçinin bu türbələrin insanları azdırdığını və xalqı şirkə saldığını bildirdi. Buna cavab olaraq əmir ona icazə verir. Şeyx qəbrin yaxınında yerləşən **Cəbilə** kəndinin əhalisinin buna qarşı çıxmasından qorxduğunu deyir. Əmir Osman 600 nəfərlik ordu və şeyx ilə bilikdə türbəni dağıtmaq üçün yola çıxır. Cəbiləlilər öncə türbəni qorumaq üçün onların qarşısına çıxırlar. Ancaq ordunu gördükdən sonra geri çəkilirlər və şeyxin şəxsən özü türbənin dağıdılmasında iştirak edir.

Orada başqa türbələr də var idi. Bunlardan biri də səhabə **Dırar ibni əl-Əzvərə** aid olduğu söylənən qəbr idi. Onun və başqa məzarların üzərindəki türbələr də dağıdıldı. Bunlarla yanaşı bu bölgədə Allahdan başqa ibadət edilən mağara və ağaclar da var idi.

---

[56] **Zeyd ibni əl-Xattabın** (radiyallahu anhu) **Ömər** (radiyallahu anhu)-ın qardaşıdır. Hicri 12 (m. 633) də Museyləmətul Kəzzabla edilən savaşda şəhid olanlardandır. Deyilənə görə burada öldürülmüş və qəbri üzərində bir türbə tikilmişdir

Allahın izni ilə bunlar da ortadan qaldırıldı və xalqa oraları ziyarət etməsi qadağan edildi.

Beləcə, şeyx həm sözlü, həm də əməli olaraq dəvət edirdi. Onun həddləri tətbiq etməsinə misal olaraq: Uyeynədə qazi ikən onun yanına bir nəfər qadın gələrək zina etdiyini etiraf edir. Şeyx qadının ağlının normal olub olmadığını maraqlanır, ona normal olduğunu bildirirlər. Evli olan qadın etirafında israr edincə, onun bu etirafa məcbur edildiyinə dair və ya başqa hər hansı bir şübhəyə dair bir şey tapılmadıqdan sonra şeyx onun rəcm edilməsinə hökm verir.

Beləliklə də, qadının rəcm edilməsi və türbələrin dağıdılması, şeyxin açıq bir dəvət ilə Allaha dəvət etməsi insanların Uyeynəyə hicrət etmələrinə səbəb olur. Daha sonra şeyxin bu dəvəti **Əhsa** və onun ətrafındakı digər bölgələrin əmiri **Xalidoğullarından Suleyman ibni Urayir əl-Xalidiyə** çatır və şeyxin bu dəvəti oradakı bədəviləri qorxudur. Allahın rəhmət etdikləri müstəsna bədəvilərin çoxu haram və zülüm əməlləri ilə məşğul idilər. Oranın əmiri şeyxin dəvətinin nəticədə onun səltənətini də ortadan qaldıracağından qorxurdu və dərhal əmir Osmana təhditedici bir məktub yazır və yanındakı şeyxi öldürməsini ona əmr edir. Bu isə əmir Osmana ağır gəlir, ona çatan qızıl cinsindən olan verginin kəsilməsindən və yaxud savaş çıxmasından qorxdu. Şeyxə bu vəziyyəti bildirdikdən sonra ona deyir : *"Səni öldürmək bizə yaraşmaz, ancaq bu əmirdən də qorxuruq, onunla savaşa bilmərik. Sən burdan ayrıl, get!"* Şeyx isə dəvət etdiyi şeyin Allahın dini olduğunu ona xatırladır, əgər bu dəvətdə ona yardımçı olarsa, Allah azzə və cəllənin onu hərkəsdən qoruyacağını və digərlərinə üstün və hakim edəcəyini vəd edir. Lakin Əmir Osman onlarla savaşa bilməyəcəklərini, qarşı dirənəcək güclərinin olmadığını bildirincə Şeyx Uyeynədən ayrılıb **Diri'yyə** bölgəsinə gedir.

Deyilənə görə şeyx Diri'yyəyə yürüyərək getmiş və Uyeynədən sabah vaxtı yola çıxmış, oraya isə axşam vaxtlarında çatmışdır. Hətta Əmir Osman ona bir minik vasitəsi belə verməmişdi. Şeyx orada bölgənin gözəl insanlarından olan **Muhamməd ibni Suveylim əl-Urayniyə** misafir olur. Həmin şəxs isə şeyxin ona misafir olmasından çox qorxur, oranın əmiri **Muhamməd ibni Səudun** bundan dolayı onu (həmin ev sahibini) cəzalandırmasından qorxur. Şeyx də onu təsəlli edərək dəvətinin Allahın dini olduğunu və sonunda Allahın bu dini qalib edəcəyini xatırladır.

Şeyxin Dir'iyyədə olması xəbəri **Muhamməd ibni Səuda** çatır. Bu xəbəri ona əmirin xanımının çatdırdığı söylənilir. Saleh bir insan onun xanımının yanına gəlib şeyxin durumunu əmir Muhamməda xəbər verməsini deyir və ona sahib çıxıb dəstəkləməsi üçün əmiri təşviq etməsini istəyir. Nəticədə əmir salehə xanımının təklifini qəbul edir, Suveylimin evində qalan Şeyxin yanına gedir, ona dəvətində dəstək olacağını bildirir və hər zaman yardım edecəyi ilə onu müjdələyir. Şeyx də bunun qarşılığında ona yardım edəcəyinə və onun bu dəvət sayəsində daha da güclənəcəyi xəbəri ilə müjdə verir. *"Çünki kim Allahın dininə yardım edərsə Allah da ona yardım edər"* - deyir. Əmir isə şeyxə Allah və Rəsulunun dini üzərində olmaq, Allah yolunda cihad etmək üzərinə beyət etdiyini bildirir. Ancaq düşmənlərə qarşı zəfər qazandıqdan sonra şeyxin o bölgəni tərk etməsindən ehtiyat etdiyini deyir. Şeyx də həmin bölgədən ayrılmayacağına, onun yanında olacağına və Allahın dini qalib gəlincəyə qədər onunla bərabər cihad edəcəyinə dair onunla beyətləşir.

Artıq insanlar hər yerdən şeyxin yanına gəlməyə başlayırlar və Dir'iyyə insanların hicrət etdikləri bir yer halına çevrilir. Şeyx burada boyük sevgi və dəstək qazanır. Orada əqidə, fiqh, fiqh üsulu, hədis, hədis üsulu, tarix, təfsir və s. elmlərdən faydalı

dərslər verməyə başlayır. Bununla yanaşı dəvət və cihada da davam edir, önəmli şəxslərə ərazilərindəki şirki ortadan qaldırmaları üçün məktublar yazırdı. Öncə Nəcdlilərdən başladı, əmir və alimlərlə yazışdı. Həmçinin Riyadın əmiri və alimləri ilə o cümlədən, **Məkkə, Mədinə** və **Əhsa** bölgəsinin alimləri ilə də yazışdı. Ərəbistan yarımadası xaricində Misir, Şam, İraq, Yəmən, Hind və digər yerlərin alimləri ilə də məktublaşdı. Şeyxin bu bölgələrin alimləri ilə yazışması heç də oralarda Allahın dininə yardım edən alimlərin yoxluğu mənasına gəlmir. Lakin Allah subhanəhu təala onların dəvətini Şeyx Muhammədinki kimi müvəffəq etməmişdir. Bunun isə bir çox səbəbləri ola bilərdi :

1- Onlara arxa çıxaraq yardım edib dəstəkləyən kimsənin olmaması.

2- Bir çox dəvətçinin Allah yolunda səbrli olmaması və əziyyətlərə qatlana bilməməsi.

3- Bəzi dəvətçilərin münasib üslub, ifadə, o cümlədən hikmətli kəlamlardan və gözəl nəsihətlərdən istifadə edərək insanları yönləndirəbiləcək səviyyədə kifayət qədər bilgiyə və bacarığa sahib olmamaları.

Şeyx Muhamməd ibni Abdulvəhhab Səud ailəsinin yardımı və dəstəkləri ilə dəvət və cihada davam etdi. Hicri 1158 (m.1745) ilindən etibarən 1206`da (m.1791) vəfat edənə qədər şeyx cihad və dəvət fəaliyyəti davam etdirdi. Allah onun dəvətinə bərəkət verdi, insanlar Allahın dininə möhkəm bağlandılar, ibadətlər çoxaldı, məscidlər namaz və elm halqaları ilə dolub daşdı, zəkatlar toplanmağa və paylaşılmağa başlandı, xalq ramazan oruclarını tutmağa başladı.

Şeyxin vəfatından sonra isə övladları və nəvələri, tələbələri və yardımçıları dəvət və cihada davam etdilər. Övladlarından **Abdullah ibni Muhamməd**, **Həsən ibni Muhəmməd**, **Hüseyn ibni Muhamməd**, **Əli ibni Muhamməd** , **İbrahim ibni Muhamməd**, nəvələrindən isə **Əbdurrahman ibni Həsən** və **Süleyman ibni Abdullah ibni Muhamməd** kimilərini qeyd etmək olar. Tələbələrindən isə **Hamd ibni Nasir ibni Muammər**, o cümlədən Dir'iyyə və digər bölgələrdən olan bir çox alimi qeyd etmək olar.

Dəvətçilərin və Səud ailəsinin Nəcd bölgəsindəki dəvət fəaliyyətləri tamamlandıqdan sonra dəvət Məkkə, Mədinə və Ərəbistan yarımadasının cənub qisimlərinə kimi uzandı. Məkkə və Mədinə alimləriylə yazışdılar, ancaq dəvət onlara fayda vermədi. Məkkə və Mədinəlilər daha öncədən müqəddəs saydıqları türbələri təzim etməyə, qəbrlər üzərində yeni türbələr bina etməyə, türbə sahiblərindən yardım istəmək və s. kimi şirk və bidət əməllərə davam etdilər. Bu səbəblə şeyxin vəfatından 11 il sonra **İmam Səud ibni Abdulaziz ibni Muhamməd Hicaz** istiqamətində hücuma keçdi. **Taiflilərlə** savaşdıqdan sonra Məkkəyə doğru yönəldi. İki ordu Məkkə xaricində bir-biriylə qarşılaşdı. Məkkəni təslim etmək və ya Ciddəyə qaçmaqdan başqa bir yolun olmadığını anladıqdan sonra geri çəkildilər, Səud və bərabərindəki müsəlmanlar şəhərə döyüşsüz girdilər. 1218–ci il Məhərrəm ayının əvvəlində (m. 1803 Aprelin ortaları) Məkkəyə hakim oldular və dərhal Allahın dininə dəvət etməyə başladılar. **Xədicənin** (radiyallahu anha) qəbri və başqa qəbrlərin üzərində inşa edilmiş türbələri dağıtdılar.

Məkkənin fəthindən təxminən 2 il sonra Səud ailəsi hicri 1220-ci (m. 1805) ildə Mədinəyə hakim oldular, bununla da iki Haram bölgəsi də Səud ailəsinin hakimiyyəti altına keçir. Hər iki şəhərdə müəlimlər, rəhbərlər, Allahın şəriəti ilə hökm edən qazilər təyin etdilər.

Harameyn h.1226-cı ilinə (m. 1811) qədər Səud ailəsinin hakimiyyətində qaldı. Daha sonra **Misir** və **Türk** orduları Səudlularla savaşmaq və onları **Harameyndən** (Məkkə və Mədinədən) çıxarmaq üçün Hicaza doğru hərəkət etdilər. Onlar arasındakı savaş təqribən 7 il boyunca davam etdi. Misir qüvvələrinin Nəcdin altını üstünə çevirib, xalqı qətl etməsindən bir neçə il keçməmişdir ki, dəvət yenidən canlanıb yayılmağa başladı. Bundan təqribən 5 il sonra **İmam Türki ibni Abdullah ibni Muhəmməd ibni Səud** dəvətlə birlikdə yenidən qiyam etdi. Onun dəvəti Nəcdə və ətrafına yayıldı. Alimlər yenidən bu bölgələrə axışmağa başladılar. Onlardan biri də Şeyxül-islamın nəvəsi **Şeyx Abdurrahman ibni Həsən**[57] idi. İmam buradakı Türkləri və Misirliləri bölgələrdən və kəndlərdən çıxardı. 1240-cı ildə (m. 1824) dəvət Nəcdi yenidən bürümüşdü. İnsanlar 1234-cü ildən (m. 1819) 1239-cu ilə (m. 1823) kimi təxminən 5 il boyunca işğal, anarxiya, adam öldürmə və qarışıqlıqlar içində yaşamışdılar. 1240-cı ildə (m. 1824) dağınıq halda olan müsəlmanlar topluluğu Nəcddə **İmam Türki ibni Abdullah ibni Muhamməd ibni Səudun** başçılığında bir araya gəldilər və haqq yenidən qalib gəldi. Alimlər kəndlərə və bölgələrə məktublar yazaraq insanları cəsarətləndirdilər və onları Allahın dininə dəvət etdilər.

Beləliklə də, Allahın yardımı və müvəffəq etməsi ilə Şeyx Muhəmməd ibni Abdulvəhhabın tövhid dəvəti dünyanın hər tərəfinə yayıldı. Hər nə qədər ona qarşı çıxanlar "vəhhabilər müsəlmanları təkfir edir, mallarını və qanlarını halal görür, xilafətə qarşı çıxır" kimi iftiralar və yalanlarla dəvətin önünə keçməyə çalışsalar da Allah azzə və cəllə öz nurunu tamamladı.[58]

---

[57] Həmin ərəfələrdə Şeyx Abdurrahman ibni Həsən Misirdə idi. İmam Türkinin dəvəti ilə yenidn Nəcdə qayıtdı

[58] Əsasən həmin yalan və böhtanlar Harameyn bölgəsinin ələ keçirilməsindən sonra daha da şiddətlənmişdi. Hətta sələf mənhəcinə tabe olan bəzi alimlər də həmin iftira və böhtanlara inanaraq Şeyxi və onun dəvətinə tabe olanları eyni mövzuda ittiham etmişdilər. Onlar arasında Yəmənli böyük alim **İmam Muhəmməd ibni Ali əş-Şəvkani** (h. 1173-1250) də var idi. İmam Şəvkani nəcdli dəvətçilər barəsində danışarkən demişdir: ***"Lakin onlar sahib olduqları Nəcd dövlətinin daxilində olmayan və onların əmirlərinə itaət etməyən kimsələrin İslamın xaricində olduqlarını düşünürlər. Bizə onlar haqqında bəzi xəbərlər gəlir çatır ki, doğruluğunu Allah bilir"*** *"Bədrut-Tali', 2/5"*

İmam Şəvkani *"Bədrut-Tali'"* əsərini Nəcd dövlətinin əmiri Abdulaziz ibni Səud ilə Hicazın əmiri Şərif Ğalib arasında savaşların cərəyan etdiyi bir vaxtda yazmışdı. Deyilənə görə savaşa səbəb Şərifin nəcdliləri həcc ziyarətindən əngəlləməsi səbəb olmuşdur. Həmçinin Şərif Nəcdlilərin bir çox fikirləri ilə razılaşmırdı. Bu iki hakim arasında baş verən savaşdan münafiqlər və kafirlər fürsət bilib faydalanırlar və məsələləri qarışdıraraq, haqqa batil donu geyindirib dünyaya yalan və böhtanlarla dolu xəbərlər yayırlar. Bunlar arasında nəcdlilərin həcc ziyarətinə gələnləri öldürdükləri yalanı da var idi. Şəvkani və digər əhli sünnə mənhəcinə tabe olan bəzi alimlər də bu cür yayılan xəbərlərin həqiqətlərini araşdırmadan nəcdliləri ittiham etmişdilər. Lakin Şəvkani bu xəbərləri tam mənası ilə təsdiqləyərək nəql etməyib və dediyi sözləri təkidli bir şəkildə bildirmədi. Onun ***"Bizə onlar haqqında bəzi xəbərlər gəlir çatır ki, doğruluğunu Allah bilir"*** sözü bunu göstərir. (Bax: *"Muhəmməd bin Abdulvəhhab muslih mazlum, s.177"*)

Həmçinin Şəvkani bu sözləri ilə yanaşı nəcd dəvətinin sahibini və Şeyx Muhəmməd ibni Abdulvəhhabı gözəl sözlərlə mədh etmişdir, onların əqidəsinin əhli sünnənin əqidəsinə müvafiq olduğunu bildirmişdir: ***"Bəzi insanlar onun (yəni nəcdin əmirinin) xəvariclərin etiqadına inandığını iddia edir. Mən bunun doğru olduğunu zənn etmirəm, çünki nəcdin sahibi və ona tabe olanların hamısı Muhəmməd ibni Abdulvəhhabdan öyrəndikləri ilə əməl edirlər. O, (yəni Şeyx Muhəmməd ibni Abdulvəhhab) isə hənbəli idi, sonra Mədinədə hədis tələb etdi (öyrəndi) və Nəcdə döndü. Sonra hənbəlilərin mutəaxxirlərindən İbni Teymiyyə, İbnul Qayyim və bənzəri kimilərindən bir qrup alimlərin ictihadları ilə əməl etməyə başladı. O ikisi isə (yəni İbni Teymiyyə və İbnul Qayyim) ölülərə***

Harameyn bölgəsi uzun müddət Səud dövlətindən ayrı qalır, sonra isə h.1343 ilində (m. 1924) təkrar onlara bağlanır. İmam **Abdulaziz ibni Abdirrahman ibni Faysal ibni Türki ibni Abdillah ibni Muhamməd ibni Səud** bu iki müqəddəs yeri ələ keçirir və həmin iki bölgə bu günə qədər bu dövlətin idarəsi altındadır.

***Əsərləri:***

Şeyx Muhamməd ibni Abdulvəhhabın tövhid, əqidə, siyər və sair mövzularda yazdığı bir çox risalələri və kitabları var. Bunlardan ən çox məşhurları:

1) *"əl-Usulus Sələsə"* – "Üç əsas" kimi tərcümə edilən Rəbbin, İslamın və Rəsulun bilinməsindən bəhs edən kiçik risalədir.
2) *"əl-Qavai'dul Ərba'"* – "Dörd Qayda" kimi tərcümə edilən, kafirlərlə müsəlmanların arasındakı fərqdən bəhs edən dörd qaydadan ibarət kiçik bir risalədir.
3) *"Navaqidul İslam"* – "İslamı pazan amillər" kimi tərcümə edilən və İslamı pozan on amillərdən bəhs edən kiçik risalədir

---

***etiqad edənlər haqqında ən şiddətli olan insanlardandır. Mən nəcdin sahibindən –hansı ki, o indi həmin tərəflərin sahibidir- bir kitab gördüm, onunla ondan nəyə etiqad etdiyini soruşan və bunu yazmağını istəyən bəzi elm əhlinə cavab verib. Onun əhli Kitab və Sünnəyə müvafiq olan gözəl etiqadı əhatə edən bir cavab olduğunu gördüm. İşin həqiqətini isə Allah bilir."*** *"Bədrut-Tali', 2/6-7"*

Bundan əlavə İmam Şəvkani Şeyx Muhamməd ibni Abdulvəhhab vəfat etdiyi zaman ona ağı həsr edərək təsirli qəsidə yazmışdır və orada şeyxi və elmini övmüşdür.

Yalan və böhtanlara aldanaraq Şeyx Muhamməd ibni Abdulvəhhabı müsəlmanları təkfir etmək və qanını axıtmaqla ittiham edən alimlərdən biri də **Şeyx Muhəmmd ibni Nasir əl-Hazimi** (v.e/h.1283) idi. Hər nəqədər şeyxi övsə də bu iki xislətinə qarşı çıxmış və onu qınamışdır. Lakin **Şeyx Muhəmməd Siddiq Həsən Xan** *"əl-Hitta fi zikris-sihahis-sittə, s.151"*-də Şeyx əl-Haziminin *"Fəthul-Mənnan"* kitabından onun Şeyx Muhamməd ibni Abdulvəhhabı övdüyü sözlərini nəql etmişdir. Görünür ki, Şeyx Hazimiyə Muhamməd ibni Abdulvəhhabın dəvəti ilə əlaqəli həqiqətlər aydın olduqdan sonra onun barəsindəki mövqeyini dəyişmişdir və bir çox yerdə şeyxi müdafiə etmişdir.

Digər bir alim isə **Şeyx Muhamməd Siddiq Həsən Xandır** (h.1248-1307). *"Məsu'd ən-Nədvi Muhamməd bin Abdulvəhhab muslim mazlum, s.175"*-də onun dəvət imamları və ona tabe olanlar barəsində qəti hökm vermədiyini qeyd edir. Bəzi kitablarında onları övsə də, mədh etsə də təkfirlə və savaşla bağlı hökmlərdə qınadığı görülür. **Şeyx Abdulaziz ibni Muhəmməd ibni Ali alu-Abdullatif** onun haqqında bu cür demişdir:

***"Eyni şəkildə Muhəmməd Siddiq Həsən də bu şübhələri doğruladı. "Tərcümanul-Vəhhabiyyə" kitabında hədis əhlinin vəhhabilərdən bəri olduğunu elan etdi, çünki – necə ki, bunu Muhəmməd Siddiq Həsən özü zikr etmişdir - vəhhabilər (müsəlmanların) qanlarını axıtmaqla tanınırlar. Muhəmməd Siddiq – Allah onu əfv etsin!- bu məlumatlardakı qaynağının xristiyanların alimlərinin kitabları olduğunu vurğulayır."*** *"Dəa'vil- munaviin li da'vatiş-şeyx muhamməd, s.159"*

Göründüyü kimi Muhəmməd Siddiq Həsən Xan və digər alimlərin bu mövzuda əldə etdikləri məlumatlar gerçəkləri əks etdirməyən və müsəlmanlar arasına fitnə salmaq istəyən bəzi qüvvələrin uydurduqları yalan və böhtanlar idi. İşin həqiqətini öyrəndikdən sonra bu alimlər öz mövqelərini dəyişdirərək başda Muhəmməd ibni Abdulvəhhab olmaqla nəcdin dəvət imamları haqqında gözəl sözlər işlətmişlər. Xüsusən də Muhəmməd Siddiq Həsən Xan nəcdli dəvət imamları arasında yüksək hörmətə sahib birisi idi. **Şeyx Süleyman ibni Sahmanın** onu və yazdığı *"əd-Dinul-Xalis"* adlı kitabını müdafiə etmək üçün yazdığı qəsidəsi və **Şeyx Hamd ibni A'tiqin** Muhəmməd Siddiqin yazdığı *"Fəthul-bəyan"* adlı təfsiri üzərinə etdiyi qeydlərdən ibarət risaləsi buna örnəkdir.

4) *“Kitabut Tövhid”* – “Tövhid Kitabı” kimi tərcümə edilən və tövhid, onun əhəmiyyəti, ona dəvət, şirk və onun növləri, onlardan çəkinmək kimi məsələlərdən ibarət babları əhatə edən mükkəmməl bir əsərdir.

5) *“Kəşfuş Şubuhat”* – “Şübhələrin Kəşfi” kimi tərcümə edilən və tövhidlə bağlı bir çox şübhələrin çürüdülməsindən bəhs edən kitabdır.

6) *“Məsəilul Cahilyyə”* – “Cahiliyyə məsələləri” kimi tərcüm edilən və cahiliyyə əhlinin xüsusiyyətlərindən və sifətlərindən bəhs edən bir əsərdir.

7) *“Muxtasaru Zadul Məa'd”* – “Zadul Məadın müxtəsəri” kimi tərcümə edilən və İbnul Qayyimin yazdığı *“Zadul Məa'd”* adlı mükəmməl əsərdən çıxarılmış müxtəsərdir.

8) *“Muxtasarus Siyra”* – İbni Hişamın “əs-Siyra” kitabının müxtəsəridir.

9) *“Şurutus salat və Ərkanuha”* – namazın şərtləri və rükunlarından bəhs edir.

10) *“Muxtasaru Şərhul Kəbir vəl İnsaf”* – İbni Qudamə əl-Maqdisinin *“əl-Muqni'”* kitabının şərhi olan *“Şərhul Kəbir”* ilə Əbul Həsən əl-Mardvinin *“əl-İnsaf”* kitablarının müxtəsəridir. O, bu kitabında bablar açaraq *“Şərhul Kəbir*” -dən məsələləri qeyd edib və sonra isə *“əl-İnsaf”*-dan əlavələr etmişdir.

11) *“Təfsiruş Şəhadə”* – Lə iləhə illəllahın təfsirindən bəhs edir.

12) *“Təfsiru li ba'di suvaril Quran”* – Quranın bəzi surələrinin və ayələrinin təfsirindən ibarət kiçik risalədir.

13) *“Əhadisu fil fitən val həvadis”* – Qiyamətin əlamətləri olan fitnələr və hadisələr haqqında varid olan hədisləri toplamışdır. “*Məcmuatu əl-Muəllifəti əş-Şeyx Muhəmməd bin Abdul vəhhab”* – 11-ci cüzün tərkibində çap edilmişdir.

Bununla yanaşı şeyxin fətvalarının, yazmış olduğu məktublarının və cavablarının toplandığı kitablar mövcuddur. Məsələn, “*Məcmuatu əl-Muəllifəti əş-Şeyx Muhəmməd bin Abdul vəhhab”, “Məcmuatul Məsail vər Rəsail ən-Nəcdiyyə”, “əd-Durərus Səniyyə”* və *“əl-Fətava Əimmətun Nəcdiyyə”*. Bu kitabların bəzisində şeyx ilə yanaşı digər nəcd alimlərinin fətvaları da yer alır.

Muhəmməd ibni Abdulvahhabın kitablarını oxuyan birisi, onun yazmış olduğu kitablarda **İmam Əhmədin, Şeyxül-islâm İbni Teymiyyə** ilə **İbnul Qayyimin** təsirini açıq şəkildə görəcəkdir. Şeyx Hənbəli məzhəbinə tabe olmuşdur və əsasən İbni Teymiyyə ilə İbnul Qayyimin sözlərinə əsaslanaraq onların fikirlərindən təsirlənmiş ve görüşləriylə aydınlanmışdı. Dolayısıyla Muhamməd ibni Abdulvahhabın inancını düzəltmədə, həyatına ve dəvət metoduna yön vermədə bu iki alimin çox böyük təsiri var.[59]

***(Tərcümə edən)***

[59] Şeyxin övladları, nəvələri və tələbələrinin həyatı haqqında məlumat irəlidə 6-cı fəsldə *“Şeyx Muhəmməd ibni Abdulvəhhabın tələbələrinin sözlərindən açıqlayıcı nəqillər fəsli”*-ndə qeyd ediləcəkdir.

# Müqəddimə

### BİSMİLLƏHİR RƏHMANİR RƏHİM

Aləmlərin Rəbbinə həmd olsun, salat və salam peyğəmbərlərin və elçilərin ən şərəflisi olan nəbimiz Muhammədin (səllallahu aleyhi və səlləm), ailəsinin və bütün əshabının üzərinə olsun !

Bu kitab, Nəcdli Sələfi Dəvət İmamlarının böyük şirkdə cəhalətin üzrlü olmaması məsələsi ilə bağlı yazmış olduqlarına dair bir tamamlayıcı əlavədir. Bunu cəhalətin üzrlü olmadığından bəhs edən aşağıdakı kitablara əlavə olaraq yazdım :

**1- Allamə Şeyx İmam Muhamməd ibni Abdulvəhhabın** (rahiməhullah) :

*“Mufidul Mustəfid fi Kufri Tərikut Tövhid”*

**2- Şeyx Abdullah ibni Abdurrahman Əba Buteyn** (rahiməhullah) :

*“Risalətul İntisar li Hizbullahil Muvahhidin vər Rəddu aləl mucadili anil muşrikin”*

**3- Şeyx İshaq ibni Abdurrahman Aluş Şeyx** (rahiməhullah) :

*“Risalətu Təkfiril Muayyən”*

Bu risalədə həmin üç kitabı ixtisar etdim və elm əhlinin bu məsələdə söylədiklərini risalənin əvvəlinə əlavə etdim. Əslində bunlar mənim *"əl-Cəmu' vət Təcrid fi şərhi Kitabut-Tövhid li Şeyx Muhamməd bin Abdulvəhhab"* adlı kitabımda mövcuddur. Lakin onun əhəmiyyətinə nəzərən və bu məsələni öyrənmək istəyən kimsəyə asanlıq olması üçün onu müstəqil bir risalə halına gətirdim.

Allah hidayətə yönəldən və doğru yola müvəffəq edəndir !

Peyğəmbərimiz Muhamməda, ailəsinə və bütün əshabına salat olsun !

**(Şeyx Ali ibni Xudayr əl-Xudayr)**

# 1-Cİ FƏSL : BU ŞÜBHƏNİN TARİXİ

Böyük şirkdə cəhalətin üzrlü olması şübhəsi **İbn Teymiyyə** zamanına qədər ortaya çıxmamışdır. Bu səbəbdəndir ki, bu məsələdə üzr olduğunu iddia edən kimsələr ilk öncə dəlil olaraq İbn Teymiyyə (rahiməhullah)-ın cəhalət üzrü barəsindəki sözlərini dəlil gətirirlər ki, "o cəhaləti üzrlü saymışdır".

Daha sonra isə bu şübhə **Muhamməd ibni Abdulvəhhabın** zamanında ortaya çıxdı. Muhamməd ibni Abdulvəhhabın zamanında bu şübhə iki mərkəzli şəkildə ortaya çıxdı:

-1) Zəlalətdə olan insanlar bunu ortaya çıxartdılar və o, bunlara *"Mufidul Mustəfid"*-də rəddiyə vermişdir.

-2) Daha xəfif bir şəkildə ortaya çıxdı. Çünki o, insanlarda məsələlərin qarışıq gəlməsi şəklində ortaya çıxmışdır və onlar da haqqı istəyən kimsələr idi. Şeyxin Diri'yyədki və Əhsadakı bəzi tələbələri bunlara misaldır, sonra isə bu şübhə söndü

Daha sonra bu şübhə ikinci mərhələdə şeyxin nəvəsi **Abdurrahman ibni Həsənin** zamanında ortaya çıxdı, **Davud ibni Cərcis** ilə **Osman ibni Mənsur** bunu mənimsədilər. Şeyx Abdurrahman bu şübhəyə qarşı çıxdı və bu işdə oğlu **Abdullatif** məlum olan əsərlərində ona yardımçı oldu. Həmçinin **Şeyx Əba Buteyn** də ona yardım etdi.

Sonra bu şübhə üçüncü mərhələdə ortaya çıxdı. **Şeyx İshaq ibni Abdurrahman** və **Şeyx İbni Sahman** öz əsərlərində və fətvalarında bu şübhəyə qarşı çıxdılar və onlara bu işdə **Şeyx Abdullatifin** övladları olan **Abdullah** ilə **İbrahim** yardım etdi. Həmin şübhə hələ də mövcuddur və hər zaman yenilənməkdədir.

Günümüzdə böyük şirkdə cəhalətin üzrlü olması məsələsində ixtilaf olduğunu deyib sonra isə iki görüş üzərinə ixtilafı nəql edən kimsələr ortaya çıxmışdır. Bu fikirlər bəzi müasir kitablarda və məqalələrdə mövcuddur. Beləki, bunu iddia edən kəs ixtilafı heç kimə nisbət etmədən söyləməkdədir və ixtilafın varlığını yalnız mütləq mənada nisbət etməkdədir. Bu anlayışın mənşəyi onların Şeyx Muhamməd ibni Abdulvəhhabın bu məsələdə iki görüşünün olması haqqındakı zənləridir. Beləki, onlar Şeyx Muhammədin bəzi ibarələrinə baxmışlar və onlardan cəhalətin üzrlü olduğunu anlamışlar. Bu isə yanlış təsəvvürün və zənnin üzərinə bina edilmişdir və xətalı bir anlayışdır. İnşəallah bu haqqda sonrakı fəsllərdə danışacağıq və orada bu ibarələri qəsd olunandan fərqli bir şəkildə anlayanlara cavab verəcəyik, bu haqdakı doğru olan anlayışı qeyd edəcəyik.

**Xülasə olaraq :** Cəhalətin üzrlü olması məsələsində ixtilafın olduğunu söyləmək yeni bir şey olub, yalnız bu zamanda ortaya çıxmışdır. Öncəki zamanlar da isə bu, ixtilaf sayılmayacaq bir şəkildə ictihadi olaraq zikr edilmişdir. Bu məsələ "cəhmiyyənin təkfirində iki görüş üzərində ixtilaf var" dedikdən sonra bu ixtilafı heç kimə nisbət etmədən anlatan kimsələrin sözü kimidir. Bu, yalnız İbn Teymiyyənin bəzi sözlərinin yanlış fəhmi üzərinə bina edilmiş xətalı bir zəndən başqa bir şey

deyildir. (Bunu deyən kimsə İbni Teymiyyənin cəhmiyyə olaraq isimləndirməsi[60] üçün işlətmiş olduğu ləfzlərin arasını ayıra bilməyib. Çünki bunlar siyaqa[61] görə fərqlənməkdədir.) Bu isə **Şeyx Suleyman ibni Sahmanın** zamanında ortaya çıxdı və o buna qarşı rəddiyə verdi ki, cəhmiyyənin təkfirindəki məsələ ittifaq halındadır və bunda ixtilaf yoxdur. Necə ki, o bunu *"Raful iltibas"* və *"Kəşfuş şübhətəyn"* adlı kitablarında demişdir və onun bu haqqdakı sözlərini irəli fəsllərdə inşəallah qeyd edəcəyik.

Həmçinin **Şeyx Abdullətifin** övladları **Abdullah** və **İbrahim** də bu şübhəyə qarşı çıxdılar və dedilər ki :

***"Salehlərə dua etmək, onlarla istiğasə etmək[62], sıxıntılı və şiddətli hallarda onlardan istəmək; bunların haramlığında və böyük şirk olması haqqında heç bir müsəlman mübahisə etməz. Onların təkfirində və cəhmiyyənin təkfirində ikinci bir görüş yoxdur"*** *"ən-Nəcdiyyə, 3/66"*

Allah ən doğrusunu biləndir !

---

[60] Yəni hər hansı bir tayfanı və ya müəyyən şəxsləri cəhmiyyə olaraq adlandırması *(T.e)*
[61] yəni sözün gəlişinə görə *(T.e)*
[62] İstiğasə etmək, şiddətli və üzüntülü anlarında yardım istəmək deməkdir. *(T.e)*

## 2-Cİ FƏSL :

## Böyük şirkə düşən kimsə mücərrəd olaraq bu fe'li ilə müşrik adlanarmı? Və bu kimsə cahil, təqlidçi olsa və ya təvili, xətası olsa bununla onun halı üçün (aqibəti üçün) qorxularmı?

Bunun üzərinə böyük şirkdə cəhalət üzrlümüdür, yoxsa deyildir məsələsi (necə ki, sələfin məzhəbində cəhalət üzrlü deyildir. İnşəallah bunun açıqlanması irəlidə gələcəkdir.) bina edilir. Təvil, təqlid və xəta da bunun kimidir. Bunu bilmək bizi bu böyük məsələnin açıqlanmasına götürəcəkdir, hansı ki bu məsələ tövhidi öyrənmək və şirki anlamaq haqqındakı ən mühim bablardandır. Həmçinin bu, bəzən isimlərin əhkamlardan ayırıldığı, bəzən də başqa bir yerdə ayırılmaması ilə bağlı olan ən mühim bablardandır. Bu da fəsllər, nəqllər və təliqlər arasında bu məsələni zikr etməyimizi gərəkli edir. Burada, öncə elm əhlinin bu mövzudakı sözlərini zikr edəcəyik, daha sonra **Şeyx Muhamməd Abdulvəhhabın** və tələbələrinin şeyxin zamanından bu günümüzə kimi gəlib çatan sözlərini zikr edəcəyik. Bundan öncə isə **İbn Teymiyyə** və **İbnul Qayyimin** sözlərini və bu məsələdəki icmaları, səhih qiyasları nəql edəcəyik.

İndi isə məsələyə daxil olaraq deyirik ki :

## 3-CÜ FƏSL :

## Cəhalət məsələsi ilə bağlı elm əhlindən nəqllər :

**- 1)** "*Səhih"*-də **İbn Abbasdan** (radiyallahu anhu) **Nuh** (aleyhissəlam)-ın qövmü haqqında bu cür dediyi rəvayət edilmişdir :

***"Nə zaman ki, elm (bilgi) unuduldu o bütlərə ibadət edilməyə başlandı"*** [63]

(Onlara cəhalət zamanında ibadət edildi və onlar cahil olmaları ilə yanaşı Allahdan qeyrisinə ibadət edənlər olaraq adlandırıldılar. )

**- 2)** *"Bədius-Sənai, 7/32"*- də *"Kitabus-Seyr: "İki diyarın dəyişməsi ilə dəyişən əhkamlar haqqındakı bab""*da dedi ki:

***"Əbu Yusuf Əbu Hənifədən rəvayət etdi ki: "İnsanlardan heç kimin onu yaradanı tanımasındakı cəhaləti üzrlü deyildir. Çünki Rəb subhanəhu təalanın və Onun tövhidinin bilinməsi bütün insanların üzərinə vacibdir. Çünki o yerlərin və göylərin yaradılmasını, özünün və Allah subhanəhu təalanın yaratdığı digər şeylərin yaradılışını görməkdədir. Fərzlərə gəldikdə isə, əgər kimsə bunları bilməz və bu haqda ona bir şey çatmayıbsa, məhz bu kimsə ona hökmi olaraqdan hüccətin iqamə edilmədiyi kimsədir.""***

**- 3) Şeyx Abdullatif** *"Misbahuz-Zallam",* s. 123 –də **Abdullah İbni Əhmədin** *"Sünnət"* kitabındakı [64] sözünü qeyd edərək dedi ki :

***"Əbu Səid ibni Yaqub ət-Talaqani bizə xəbər verdi ki, Muəmməl ibni İsmail İmara ibni Zəzənin belə dediyini eşitmişdir :***
***"Mənə çatan xəbərə görə qədəriyyələr qiyamət günü müşriklərlə bir yerdə həşr olunacaqlar. Onlar deyəcəklər ki: - "Vallahi biz müşrik deyildik!" – Onlara deyiləcəkdir ki: "Siz bilmədiyiniz halda şirk qoşurdunuz" "***

( ***"Siz bilmədiyiniz halda"*** – yəni cahil olduğunuz halda)

**- 4)** ***"(Allah) bir qrupa hidayət verdi, bir qrup isə azğınlığı haqq etdi. Onlar Allahı qoyub şeytanları özlərinə dost tutdular və (bununla belə) özlərinin doğru yolda olduqlarını hesab edirlər."*** [65]

**İbni Cərir ət-Təbəri** (rahiməhullah) Allahu təalanın bu ayəsinin təfsirində dedi ki:

***"Azğınlığı haqq edən qrup Allahdan başqa şeytanları özlərinə dost və köməkçilər tutmaları ilə Allahın yolundan azdılar və əsas hədəfdən (haqq yolundan) çıxdılar, bunu üzərində olduqları şeydən cahil olaraq və xəta səbəbi ilə etdilər. Lakin bunu***

---

[63] *"Səhihi-Buxari, Təfsir : 440"*
[64] 2/392
[65] (Ə'raf surəsi, 30)

***özlərinin haqq və doğru yol üzərində olduqlarını və işləmiş olduqlarının doğru olduğunu zənn edərəkdən etdilər. Bu isə, "yalnız bir kimsəyə işlədikləri (əməllər) haqqındakı doğru bilginin gəlməsindən sonra inad edərək onları işləyən kimsəndən başqa, Allah heç kimə işləmiş olduğu günahdan və sapıq inancından dolayı əzab etməz" deyən kimsələrin yanlış olduğuna dair ən açıq dəlildir. Əgər belə olsaydı, o zaman özünün haqq yolda olduğunu zənn edən azmış bir tayfa ilə həqiqətən də haqq yolda olan tayfa arasında bir fərq olmazdı. Lakin Allah onların adlarını və hökmlərini bu ayədə ayırmışdır."***

**Əba Buteyn** İbn Cərirdən bu ayənin təfsiri ilə bağlı onun sözlərini nəql edərək dedi:

***"İbn Cərir dedi ki: - "Bu ayə cəhalətin üzrlü olmadığına dəlildir" "*** [66]

(Həmçinin bununla bağlı İbn Cəririn Kəhf surəsi, 104-cü ayə ilə bağlı sözünə də bax.)

**- 5) İbn Kəsir** (rahiməhullah) zikr edilən ayənin təfsirində[67] **İbn Cəririn** daha öncə keçən sözlərini müvafiq olaraq və təsdiqləyərək nəql etmişdir .

**- 6) Bəğavi** (rahiməhullah) isə zikr edilən həmin ayənin təfsirində demişdir :

***"Bu ayədə öz dinində haqq üzərində olduğunu zənn edən kafir ilə inadkar və inkar edən kimsənin eyni olduğuna dəlil vardır"***

**-7) Buxari** *"Səhih"*-ində *"İman Kitabı : Cahiliyyədən olan günahlar babı"*-nda demişdi:

***"Günah sahibi yalnız şirki işləməsindən dolayı kafir olar. Çünki Rəsulullah (səllallahu aleyhi vəsəlləm) demişdir: "Səndə cahiliyyə (əlaməti) var". Allahu təala demişdir : "Allah, Ona şirk qoşulmasını əsla bağışlamaz, bundan başqasını isə dilədiyi kimsəyə bağışlar""***

**-8) İbni Mundə** (rahiməhullah) *"Tövhid"* kitabında 1/314-də *"Allah azzə və cəlləni tanımada və birləmədə xəta edən müctəhidin inadkar kimsə kimi olmasına dair dəlilin zikr edilməsi babı"*-nda demişdir :

***"Allahu təala onların zəlaləti və inadkarlığı haqqında xəbər verərək demişdir :***

***"De ki : Sizə (etdikləri) əməllər baxımından ən çox ziyana düçar olanları bildirim mi? O kəslər ki, onların dünya həyatındakı səyləri boşa getmişdir və onlar isə yaxşı işlər gördüklərini hesab edirlər." "*** **(Kəhf, 103)**

Sonra isə **Əli ibni Əbi Talib** (radiyallahu anhu)-dan ziyana uğrayan kimsələr haqqında soruşularkən ondan rəvayət edilən sözünü nəql etdi. Demişdir ki :

---

[66] *"əd-Durərus-Səniyyə, 10/392"*

[67] Yəni, (Ə'raf, 30) *(T.e)*

***“Onlar  əhli kitabdan olan kafirlərdir. Onların ilk nəsli haqq üzərə idi. Sonra rəbləri olan Allah azzə və cəlləyə şirk qoşdular və dinlərində bidətlər işləyərək özlərindən yeni şeylər icad etdilər. Həmçinin zəlalət üzərində birləşdilər və özlərinin doğru yol üzərində olduqlarını zənn etdilər. Batildə ictihad etdilər və özlərinin haqq üzərində olduqlarını hesab etdilər. Gözəl işlər gördüklərini hesab etdikləri halda onların dünya həyatındakı səyləri boşa getmişdir.”***

Sonra radiyallahu anhu dedi ki : ***"Harura əhli*** [68] ***də onlardandır"***

Sonra yenə **Salman Farisi** (radiyallahu anhu)-dan gələn rəvayəti zikr etdi: Salman Farisi Rəsulullah (səllallahu aleyhi vəsəlləm)-ə onun peyğəmbər olaraq göndərilməsindən öncəki nəsranilərin halını anlatdı: ***“Onlar namaz qılar, oruc tutar və sənin peyğəmbər olaraq göndəriləcəyinə şəhadət gətirərlərdi.”*** Bunun üzərinə Rəsulullah (səllallahu aleyhi vəsəlləm)  dedi ki: ***“Onlar cəhənnəm əhlidirlər”***

**- 9) Bərbahari** *"Şərhus-Sünnə"* kitabında 49-cu nəqldə [69] demişdir:

***“Qiblə əhlindən heç kim Allahın Kitabından bir ayəni və ya Rəsulullah (səllallahu aleyhi vəsəlləm)-in bir hədisini rədd etmədiyi müddətcə və yaxud Allahdan qeyrisinə qurban kəsmədiyi və ya Allahdan qeyrisinə namaz qılmadığı müddətcə İslam dinindən çıxmaz. Bunlardan hər hansı birisini etdiyi zaman isə onu İslamdan çıxartmağın sənə vacib olar. Əgər bunlardan heç bir şeyi etməzsə o kimsə həqiqəti ilə deyil  ismi ilə mömin müsəlmandır.”*** [70]

- Bundan öncə isə Ömərin (radiyallahu anhu) bu sözünü nəql etmişdir :

***“Heç kimsənin zəlalətdə olan bir şeyin hidayət olduğunu zənn edərək işləməsinə görə bir üzrü yoxdur. Və heç kimsənin hidayətdə olan bir şeyin zəlalət olduğunu hesab edərək tərk etməsinə görə bir üzrü yoxdur.”***

**- 10) Lalakai** *"Şərhu Usuli İtiqadi Əhlis Sünnət"* kitabında (3/528) -də müşəbbihənin[71] təkfiri haqqında edilən rəvayətlərdən bəhs edərkən demişdir:

***“Davud əl-Cəvaribi təşbih mövzusunda danışdı. Muhamməd ibni Yəzid, Xalid Tahhan, Haşim və Vasit əhlindən olanlar toplanaraq əmirin yanına gəldilər və onun sözlərini xəbər verdilər.  Beləliklə, onun qanının axıtılmasında icma etdilər.”*** [72]

---

[68] Yəni xəvariclər *(T.e)*

[69] *“Şərhus-Sünnə li Bərbahari, 73”*

[70] Yəni hökmi olaraq zahirən mömin müsəlman adlanar, lakin həqiqi olaraq adlandırılmaz. Çünki həqiqi İslam batini bir şeydir və onun elmi Allaha məxsusdur. *(T.e)*

[71] Müşəbbihə, Allah azzəvə cəllənin sifətlərini məxluqata bənzədən firqəyə deyilir. Həmin bənzətməyə isə təşbih deyilir. *(T.e)*

[72] (933)-cü rəvayət. Rəvayətin sonu bu şəkildədir : ***“O,*** (yəni Davud əl-Cəvaribi) ***bu günlərdə öldü və Vasit əhlindən olan alimlər onun cənazəsini qılmadı”*** Yəni onu tövbəyə belə çağırmadan öldürülməsində icma etdilər, lakin, həmin günlərdə ölüm onu yaxaladı və vəfat etdi. Belə bir halda onun cənazə namazını qılmamaları onun təkfrində icma etdiklərini göstərir. *(T.e)*

Və **Yəzid ibni Harundan** nəql edərək demişdir: ***"Cəhmiyyə və Müşəbbihə tövbəyə çağırılar. Bununla da onları böyük bir işlə ittiham etdi"***[73]

Və **Nəim ibni Hammaddan** nəql edərək demişdir : ***"Kim Allahı yaratdıqlarından bir şeyə bənzədərsə bununla kafir olar. Kim də Allahın Özünü vəsfləndirdiyindən hər hansı bir şeyi inkar edərsə bununla kafir olar."*** [74]

Və **İshaq ibni Rahaveyhdən** nəql edərək demişdir: ***"Kim Allahı vəsfləndirər və Onun sifətlərini yaratdıqlarından hər hansı birisinin sifətinə bənzədərsə, bununla Uca Allaha küfr etmişdir."***[75]

(Kim də Allahdan qeyrisinə ibadət edərsə, bununla Allahı yaratdıqlarına bənzətmiş olar. Ona görə ki, o, bununla Allahın yaratdıqlarından bəzisini ibadət edilən ilah halına gətirmişdir.)

**- 11) Qurtubi** Təfsirinin 7/319-da Misaq ayəsinin[76] təfsirinin sonunda demişdir :

***"Tövhiddə təqlid edən üçün heç bir üzr yoxdur."***

**- 12) Qadı İyad** (rahiməhullah) *"Əş-Şifa"* kitabının sonunda *"Küfr olan sözlərin və üzərində təvaqquf edilənlərin və ya ixtilaf edilənlərin və küfr olmayanların hansılar olduğunun açıqlanması haqqındakı fəsl"*- də bunlardan ilk olaraq başlayıb demişdir :

***"Allahın Rübubiyyətini və ya vəhdaniyyətini inkar etməyi və ya Allahdan başqasına ibadət etməyi və ya Allah ilə bərabər başqasına ibadət etməyi açıq bir şəkildə ifadə edən bütün sözlər küfrdür."***

**- 13) Əbul Vəfa ibni Aqil** (rahiməhullah) türbə sahiblərinə dua edən və qəbrlərin üzərinə bez parçalarını bağlayan kimsə haqqında bunun böyük küfr olduğunu demişdir. Dəvət imamları da ondan bu haqda bir çox sözlərini təsdiqləmək üzrə nəql etmişlər. **Şeyx Muhamməd** *"Tarixu Nəcd"* 266-cı səhifədə demişdir:

***"İbni Aqil onların bu fe'llə kafir olduqlarını zikr etmişdir."*** (Yəni türbə sahiblərinə dua edən və qəbrlərin üzərinə bez parçalarını bağlayan kimsə haqqında)

**Şeyx Əba Buteyn** demişdir : ***"İbni Aqilin qəbrlər haqqında aşırı gedənlərin işlədikləri əməllərində cəhalətlə vəsfləndirdiyi kimsələrin küfrünə dair qəti sözü daha öncə keçmişdir. İbnul Qayyim bunu gözəl sayaraq ondan nəql etmişdir."*** [77]

**- 14) Şəvkani** *"İrşadu-l-Fuhul"*-da *"İctihad babı"*-nda (2/227) demişdir :

***"Yaradanın elm (sifətini), tövhid və ədalətin isbatı kimi (ağıl ilə bilinən) məsələlərdə yanlışlıq Allah və Rəsulunu tanımasına əngəl olmaz. Demişlər ki, burada haqq bir***

---

[73] (934)-cü rəvayət. Burada onların tövbəyə çağırılması onlar haqqında küfr hökmünün verildiyinə dəlalət edir. Çünki tövbəyə çağırmaq hökmün verilməsindən sonrası üçündür. *(T.e)*

[74] (936)-cı rəvayət *(T.e)*

[75] (937)-ci rəvayət *(T.e)*

[76] Yəni (Ə'raf,172-173) *(T.e)*

[77] *"əd-Durəru-s-Səniyyə, 10/386"*

***dənədir, kim ona isabət edərsə haqqa isabət etmiş olar, kim də xəta edərsə kafir olar.”***

Həmçinin demişdir :

***“Mənası ilə əməl olmadan, mücərrəd olaraq Lə İləhə İllallah sözü, Islam üçün dəlil olmaz. Çünki əgər cahiliyyə əhlindən birisi bütə ibadət etməyə davam etdiyi halda onu deyərsə, bu İslam sayılmaz.”***[78] *“Durru-n-Nadid, s.40”*

**- 15) İbni Fərhun** *“Təbsiratul Hukkam” "Riddət"* babında [79] demişdir :

***“Kim günəşə, aya, daşa və ya başqa şeylərə ibadət edərsə öldürülər və tövbəyə çağırılmaz.”***

**- 16) İbni Qudamə** *“Ravdatun Nazir”*-də ictihad babında demişdir :

***“Cahiz[80]: İslam millətinə müxalif olan birisi əgər araşdırar və haqqı dərk etməkdən aciz qalarsa, bundan dolayı onun günahkar deyil üzrlü sayılacağını iddia etdi. Bu isə yəqin olaraq batil bir şeydir və Allahu təalanı inkar etmək, Onu və Rəsulunu rədd etmək deməkdir. Biz qəti olaraq bilirik ki, nəbi (səllallahu aleyhi vəsəlləm) yəhudi və nəsranilərə İslamı və ona tabe olmalarını əmr etmişdir. Onları israr etmələri üzərinə qınamışdır və biz onların hamısı ilə savaşarıq və büluğ yaşında olanlarını öldürərik. Və biz bilirik ki, bilərəkdən inkar edənlər azlıq təkşil edənlərdəndir. Təqlidçilərin çoxu atalarının dinlərinə yalnız təqlid edərəkdən inanarlardı və Rəsulullah (səllallahu aleyhi vəsəlləm)-in möcüzəsini bilməzlərdi.”***

Sonra bu mövzuda bəzi ayələri qeyd etdi.

**- 17) Abdullah ibni Muhamməd ibni Abdulvahhaba** gəldikdə isə onun bu mövzuda ayrıca kitabı var: *“əl-Kəlimətun Nafia'tu fil mukəffaratil vaqia'ti”* həmin kitab *“əd-Durərus-Səniyyə, 10/149”*- də müsəlmanın küfrə girib dindən çıxması ilə bağlı dörd məzhəbin sahibləri müctəhid alimlərin sözlərini qeyd etdiyi yerdədir. Beləki, həmin alimlər mürtədin hökmü haqqındakı babda sözlərinə ilk olaraq böyük şirk və onun əhlinin təkfiri və onların cəhalətlərinin üzrlü olmaması ilə başlamışlar.

Orada Şafiilərin sözlərini qeyd etmişdir və onlardan **İbni Hacər əl-Heytəminin** *"əz-Zəvacir a'n iqtirafil-kəbəir"* adlı kitabındakı ilk böyük günah (böyük şirk) haqqındakı sözlərini qeyd etmişdir. Böyük şirki açıqlarkən cəhalətin üzrlü olmadığını ifadə etmişdir və insanlar arasında çox yayğınlaşmasından dolayı və şirk olduğunu bilmədən (yəni cahil olaraqdan) çoxlarının dillərində olan şirkin növlərini ümumən zikr etmişdir.

**Nəvəvinin** Müslimin şərhindəki ***“Təzim edərəkdən Allahdan başqasına qurban kəsmək şirkdir və bunu edən kimsə qurban kəsməyi ilə mürtəd olmuşdur.”*** - sözünü nəql etmişdir.

---

[78] Yəni o bununla İslama girmiş sayılmaz *(T.e)*

[79] Bax : *“Təbsiratu-l-Hukkam, 2/279” (T.e)*

[80] O, Əbu Osman Amr ibni Bahr əl-Kinani əl-Bəsri əl-Cahizdir. Mötəzilə alimlərindəndir. (h.159-h.255) *(T.e)*

(Bu söz müəyyəndir,[81] çünki qurban kəsməyə olan qadağa onunla bağlı müəyyən kimsə üçündür.)

Sonra **Əbu Şamənin** *"əl-Bai's"*-dəki sözünü nəql etmişdir. Və *"Təbəyyunil-məharim"* adlı kitabın sahibinin küfr babındakı sözlərini nəql etmişdir və orada böyük şirkin bəzi növlərini qeyd etmişdir. Bunlardan; kim Allahdan başqasına səcdə edərsə və ya ibadətində yaratdıqlarından hər hansı birisini Ona ortaq qoşarsa, həmin kimsənin icma ilə kafir olduğunu, əgər bunun üzərində israr edilərsə öldürüləcəyini qeyd etmişdir.

Sonra **Şeyx Qasimin** *"Şərhud-Durər"*-dəki Allahdan qeyrisinə dua edən və ya nəzir verən kimsənin kafir olması haqqındakı sözünü nəql etmişdir.

Malikilərin sözlərindən isə **Əbu Bəkr ət-Tartuşinin** sözlərini qeyd etdi. Onun zamanında ağaclara və bənzəri şeylərə yönəlmənin müşriklərin fe'lləri kimi olmasını açıqladı.

Daha sonra isə Hənbəlilərin sözünü qeyd etdi və **İbni Aqilin** qəbrləri təzim edən və ehtiyaclarından ötrü ölülərə xitab edənlərin təkfiri haqqında onların bununla kafir olduqları sözünü nəql etdi.

Sonra **İbni Teymiyyə**, **İbnul Qayyim** və atasının sözlərini zikr etdi və burada Allaha şirk qoşan kimsənin təkfiri və cəhalətinin üzrlü olmaması ilə bağlı sözləri uzunca qeyd etdi. (İxtisarla) [82]

---

[81] Yəni müəyyən təkfirdir *(T.e)*

[82] Şeyx Xudayr burada Şeyx Abdullah ibni Muhamməd ibni Abdulvəhhabın *"Durərus Səniyyə, 10/149"*- dakı sözlərini müxtəsər olaraq qeyd etdi *(T.e)*

# 4-CÜ FƏSL :

## Bu məsələdə Şeyx Muhamməd ibni Abdulvəhhabın sözlərini izah edən nəqllər:

**Qeyd:** İnşəAllah Şeyx Muhamməd ilə əlaqəli sözlər bitdikdən sonra əhəmiyyətinə görə ehtiyac duyulan şeylərin üzərinə şərh üçün səhifənin altında haşiyələr qoyacağıq. Onunla[83] əlaqəli olanlara gəlincə, şərhlərin çoxu ondan nəql etdiklərimiz ilə bağlıdır.

Nəqllərdən öncə :

**-1)** Şeyx Muhammədin bu məsələdə seçilmiş müstəqil kitabının olduğunu bildirmək istəyirik. Bu kitab *"Mufidul-mustəfid fi kufri tarikut-tövhid"*-dir. Kitabın ünvanını "tövhidi tərk edənin təkfiri" şəklində ifadə etməsi haqqında düşün! Hansı ki, bunu edən kimsə zərurətdən dolayı şirk işləyən birisidir. Həmçinin ünvanda bir kimsə şirk etdiyi zaman onun müəyyən təkfirinə də dəlil var. Burada "İbni Teymiyyə şirk mövzusunda müəyyən olaraq təkfir etmir" deyənlərə şiddətli şəkildə qarşı çıxmışdır.

**-2)** *"Kəşfuş-Şübuhat"* kitabında bir çox mövzulardan bəhs etməkdədir ki, onlardan birisi də böyük şirkdə cəhalətin üzrlü olmamasının açıqlanması ilə bağlıdır.

**-3)** Həmçinin onun *"Navaqidul İslam"* adlı risaləsi vardır. Orada cəhaləti üzrlü saymamışdır. Bunu isə islamı pozan on amili qeyd etdikdən sonra ikrah altında olandan başqa ciddi və ya zarafat ilə yaxud da qorxaraqdan bunlara bulaşmaları halında hamısının hökmlərinin eyni olduğunu bildirmişdir. Bunların içərisindən ikrah altında olandan başqa cahil, təvili olan və ya xətakar kimi heç kimsəni istisna etməmişdir. (Bax: *"Fətava Əimməti Nəcdiyyə, 3/188")*

**-4)** Şeyx Muhamməd ibni Abdulvəhhabdan nəql olunanlardan biri də *"əd-Durəru-s-Səniyyə, 8/1182"* -də mürtədləri və onların firqələrini zikr etdiyi zaman demiş olduğu sözüdür. Onların bəzisi Nəbi (səllallahu aleyhi və səlləm)-i yalanlayıb bütlərə ibadət etməyə döndü, bəzisi də Nəbi (səllallahu aleyhi və səlləm)-in nübuvvətdə onu ortaq etdiyini zənn edərəkdən Museyləmənin peyğəmbərliyini qəbul etdi. Bununla yanaşı alimlər bundan cahil olsalar belə onların hamısının mürtəd olduqlarında icma etdilər və kim onların mürtəd olmasında şək edərsə, o da kafirdir.

**-5)** Yenə Şeyx Muhamməd ibni Abdulvəhhabdan *"əd-Durərus-Səniyyə, 9/405-406"*-da İbni Teymiyyənin təkfir barəsindəki sözünü nəql edərkən demişdir :

***"Hər yerdə üzərində durduğumuz İbni Teymiyyənin sözü[84] budur ki, o müəyyən təkfirin olmadığını yalnız buradakı anlaşılmazlığı ortadan qaldıracaq şey ilə bir yerdə zikr etmişdir.[85] Burada təkfirində[86] dayanmaqdan məqsəd o kimsəyə hüccətin***

---

[83] Yəni Muhəmməd ibni Abdulvəhhab *(T.e)*

[84] Bu Şeyx Muhammədin bu məsələdə İbni Teymiyyənin məzhəbini fəhm etdiyini və həzm etdiyini və onun üsulu üzərində getdiyini göstərir.

[85] Yəni İbni Teymiyyə müəyən təkfirin olmadığına dair zikr etdiyi yerlərdə bunun hansı hallarda olacağına dair müəyyən şeyləri də zikr etmişdir. Bununla da müəyyən təkfirin ümumən olmaması kimi

***çatmasından öncədir. Hüccətin çatdığı kimsəyə isə təkfir, təfsiq və ya günah sahibi olmasında bu məsələnin gərəkdirdiyi ilə hökm verilir . İbni Teymiyyə -Allah ondan razı olsun- bu sözünü zahir olmayan məsələlər haqqında söylədiyini açıqlamışdır və kəlamçılara rəddiyəsində onların bəzi alimlərindən islam dinindən çıxanların olması haqqında çox bəhs etmişdir və demişdir ki:***

***"Bunlar əgər xəfi (gizli) olan məsələlərdə olarsa, deyilər ki, o, burada azmış bir xətakardır, tərk edənin kafir olduğu hüccət ona iqamə edilməyib. Lakin onlardan ortaya çıxan bu şeylər müsəlmanların avamının və xas (alim) olanlarının bildiyi,[87] Rəsulullah (səllallahu aleyhi və səlləm)-in göndərilmiş olduğu və ona müxalif olanın kafir olacağı işlərdəndir: heç bir şeyi şərik qoşmadan sadəcə bir olan Allaha ibadət etmək, Allahdan savayı mələklərdən, peyğəmbərlərdən və onlardan başqa hər hansı bir şeyə edilən ibadəti inkar etmək kimi. Çünki bunlar İslamın ən açıq şüarlarıdır. Həmçinin beş vaxt namazı doğrulaması və onun dəyərini ucaltması kimi, çirkin şeylərin haramlığını, zinanın, içkinin, qumarın haramlığını qəbul etməsi kimi. Sonra isə, onların başçılarından çoxunun bu küfrlərə düşdüyünü və mürtəd olduqlarını görərsən"[88]***

Daha sonra isə hüccətin çatmasından sonra müəyyən təkfir məsələsini qeyd etdi və dedi:

***"Alimlərdən bircə nəfərin bu məsələdə ixtilaf etdiyini bilmirik"***

**-6)** Şeyx Muhamməd ibni Abdulvəhhabın risalələri və mətnləri şeyxin cəhaləti üzrlü saymadığını göstərir və şirk işləyən kimsəni müşrik adlandırır, müşriklərdən olduğunu bildirir. Şeyx Muhammədin yanında bəzən küfr ismi ilə hüccət iqamə edilmədiyi zaman şirk mənası qəsd olunur. Ancaq hüccət iqamə edilmişsə o zaman müşrik kafir olaraq adlandırır. Burada hüccət iqaməsindən öncəki isimlər ilə sonrakı isimlər arasındakı fərqə bəlkə təəccüb edərsən, lakin bu haqqdır və əhli sünnənin məzhəbidir. Necə ki, bunu İbni Teymiyyə (Fətava, 20/37-38)-də nəql etmişdir. Hansı ki, həmin iki səhifə boyunca necə deyərlər qızıl suyu ilə yazılmış incilər vardır. Bu, həmçinin İbnul Qayyimin və dəvət imamlarının yoludur. Onların hamısı bunun üzərində icma nəql etmişlər. Necə ki bunu inşəallah (irəlidə) dəvət imamlarının sözlərini axıra kimi oxuyub bitirdiyin zaman çox görəcəksən.

Indi isə nəqllərə dönək :

**- Birinci nəql :** Yazar özünün *"Kəşfuş-Şübuhat"* kitabının 9-cu səhifəsində (Darus Saqafə mətbəəsinə aid) bu cür demişdir :

***"Əgər sən insanın dilindən çıxan söz ilə küfrə girəcəyini bildinsə, o, çox vaxt bunu cahil olduğu halda deyər və cəhaləti üzrlü sayılmaz."*** Sözü bitdi.

(Onun cahil olması təkfirinə əngəl olmaz)

---

= yanlış anlayışı ortadan qaldırmışdır. Və Şeyx Muhamməd ibni Abdulvvəhab bu kimi durumlarda hər zaman buna dair sözlərin üzərində durmuş və açıqlamışdır *(T.e)*

[86] Bu sözə diqqət et! Buradakı inkar təkfir ismi üçündür, şirk ismi üçün deyildir

[87] Zahir olan məsələlərin ölçüsü məhz budur, bəzən də dində bilinməsi zəruri olanlar kimi adlandırılır.

[88] Bax: *"Məcmuul-Fətava, 4/54; 18/54" (T.e)*

- **İkinci nəql : İbni Sabbah-**a rəddiyə olaraq yazdığı risalə, Nasiruddin Əsədin təhqiqi ilə olan "*Tarixun-Nəcd"*[89]-də 468-ci səhifədə zikr edilmişdir. Burada ona atılan ittihamlara rəddiyə verdiyi əsnada demişdir :

***"Allaha həmd olsun! Bundan sonra ... Müşriklərin*** (Diqqət et! Burada onları müşriklər adlandırdı) ***məndən nəql etdikləri şey ki, mən insanlara peyğəmbərə (səllallahu aleyhi və səlləm) salat gətirmələrinə əngəl oluram və ya deyirəm ki, əgər əlimdə imkan olsaydı peyğəmbərin (səllallahu aleyhi və səlləm) türbəsini dağıdardım və ya (guya) mən saleh kimsələrin əleyhində danışıram, onları sevməyə mane oluram. Bunların hamısı insanların mallarını batil şəkildə yemək istəyən şeytanların mənə atmış olduğu yalan və böhtanlardır. Onlar özlərinə nəzirlər vermələrini və onları mədh edib, onlar üçün üzülmələrini insanlara əmr edən Şəmsan övladları və İdris övladları kimi şeytanlardır. Həmçinin onlar özlərini Şeyx Abdulqadirə nisbət edən - ki, Əli ibni Əbu Talibin rafizilərdən bəri olması kimi o da onlardan bəridir - şeytanlara möhtac kimsələrdir. Nə zaman ki, onlar peyğəmbər (səllallahu aleyhi və səlləm)-in Allahdan başqasına ibadət etməmələrini əmr etdiyi şeyi mənim də insanlara əmr etdiyimi gördüklərində (iftiraları atmağa başladılar) Kim Abdulqadirə dua etsə o kafirdir - ki, Abdulqadir bundan bəridir - və həmçinin kim salehləri, övliyaları aşırı dərəcədə təzim edərsə və ya onlara səcdə edərsə ...."***
Sözü bitdi

Burada bizim üçün şahid olan : onun ***"Kim Abdulqadirə dua etsə o kafirdir"*** sözüdür. Məhz bu, onun Abdulqadir və bənzərilərinə dua edənləri təkfir etdiyinə dəlildir.
(Diqqət et! Onu Abdulqadirə ibadət edən olaraq vəsf edir və şirk işləyənə adını verərək müşrik kafir adlandırır)

Sonra risalənin sonunda demişdir :

***"Əgər kimsə İsa ibni Məryəmin peyğəmbərlərdən bir peyğəmbər olmasına baxmayaraq onun haqqında bəzi (batil) şeylərə inanar və onu aşırı səviyyədə övüb, gözəlliklərini saymaqla kafir olursa, elə isə əl-Vadi də olan "Əbu Hədidə və Osmanın köpəyi" kimi şeytanlara inanan və Xaracdakı digər "köpəyə" və başqa bölgələrdəki şeytanlara inanların halı necə olsun?"***

Burada bizim üçün şahid olan : onun ***"Kim İsa ibni Məryəm haqqında batil şeylərə inanarsa kafir olar"*** sözüdür. Sonra isə risalənin sonunda salehlər haqqında (batil şeylərə) etiqad edənlər barəsində demişdir:

***"Əslində o, bütlərə ibadət etməkdir. Kim bunu edərsə kafir olar."*** Sözü bitdi.

(Burada hökmü fe'lə bağlamışdır, onun etmiş olduğu fe'l isə bütlərə ibadət etməkdir. Bütlərə və ya qəbrlərə ibadət edən cahil olsa belə onların müsəlman olaraq isimləndirilməsi şəri cəhətdən imkansız bir şeydir.)

- **Üçüncü nəql : "***Tarixun Nəcd, s. 474"* –də mövcud olan, İbni Suhayma rəddiyə olaraq yazdığı vərəqlərdə keçən sözüdür. Orada demişdir :

---
[89] Kitabın müəllifi əl-Hüseyn ibni Ğannam-dır. *(T.e)*

***“Abdulqadirin və övliyaların fayda və zərər verdiklərini söyləyənləri təkfir etdiyimiz zaman dedilər ki, İslamı[90] təkfir etdiniz. Şəmsana, Taca və Hattaba dua edənləri təkfir etdiyimiz zaman dedilər ki, İslamı təkfir etdiniz ...”*** Sözü bitdi.

Burada bizim üçün şahid olan : Budur ki, Şeyx Abdulqadirə ibadət edənləri və Şəmsana dua edənləri təkfir etmişdir. Şəmsan yazarın zamanında əl-Xaracda mövcud olan sufilərdən birisi idi.

**- Dördüncü nəql :** *“Tarixun-Nəcd”*, s. 263-də mövcud olan, Sərmdanın alimlərindən birisi olan Muhamməd ibni İ'd-ə yazdığı məktubdur. Orada bəzi sözləri qeyd etdikdən sonra demişdir :

***“Lakin qəti bir şəkildə bildirirəm ki, Əbu Talibin türbəsinə ibadət edənlərin küfrü Muveysin və onun kimilərinin küfrünün onda birinə çatmaz ...”*** Sözü bitdi.

Burada bizim üçün şahid olan : Budur ki, Abdulqadirə ibadət edənlərin küfrünə qəti şəkildə hökm etmişdir və onların cəhalətlərini üzrlü saymamışdır.

**- Beşinci nəql :** əd-Diri'yyənin qazisi Şeyx Abdullah ibni İsaya göndərdiyi məktubdur və o, *“Tarixun-Nəcd”*, s. 324-də mövcuddur. Şeyx həmin məktubu tağutların təkfirinin ona ağır gəlməsinə qarşı çıxaraq yazmışdır. Şeyx Muhamməd ibni Abdulvəhhab demişdir :

***“Mənə Əhməd bildirdi ki, Şəmsan övladları və İdris övladları kimi tağutların təkfirinə fətva vermək sizə ağır gəlməkdədir. Hansı ki, (bir şey) tələb etməklə və bənzəri şəkillərdə (insanlar) onlara ibadət edirlər.”***

Bu nəqldən onun tağutlara ibadət edənləri təkfir etməsi aydın olur, habelə tağutları və ya onlara ibadət edənləri təkfir etməyənlərə qarşı çıxması da. Onları tağutlar adlandırmasına və tağutlara ibadət edənləri (onlardan bir şey) tələb edənlər və bənzəriləri kimi adlandırmasına diqqət et! Cahil olsa dahi tağutlara ibadət edənin müsəlman olması mümkün deyil, üstəlik müvahhid olması heç mümkün deyil. Çünki şirk ismi onu əhatə etmişdir və üzərində doğrulanmışdır.

**- Altıncı nəql :** Sədiqin alimlərindən Abdurrahman ibni Rabia'ya yazdığı məktubdur və o *“Tarixun-Nəcd”,* s. 341-də mövcud olan iyirminci məktubdur. Orada bəzi sözləri qeyd etdikdən sonra demişdir :

***“Kim gecə və gündüz Allaha ibadət edər, sonra isə nəbiyə və ya övliya birisinə qəbri yanında dua edərsə, artıq özünə iki ilah götürmüş olar və Allahdan başqa ilah olmadığına şahidlik etmiş olmaz. Çünki ilah, dua ediləndir, necə ki, bu gün müşriklər bunu Zübeyrin, Abdulqadirin və ya başqalarının qəbri yanında edirlər. Və necə ki, bunu əvvəllər Zeydin və başqalarının qəbri yanında edirdilər...”*** Sözü bitdi.

---

[90] Yəni müsəlmanları təkfir etdiniz *(T.e)*

Burada bizim üçün şahid olan : Adı keçən qəbr sahiblərinə ibadət edənləri ***"müşriklər"*** adlandırdı və həmçinin onları özlərinə ***"iki ilah götürənlər"*** kimi adlandırdı.

**- Yeddinci nəql :** ər-Riyadın qazisi Suleyman ibni Suheymə yazdığı məktubdur və o *"Tarixun-Nəcd"*, s. 304-də mövcud olan doqquzuncu məktubdur. Orada bəzi sözləri qeyd etdikdən sonra demişdir :

***"Biz əl-Xaracın əhlinin və digərlərinin tağutlarını etdikləri işlərə görə təkfir etdik. Atalarını və əcdadlarını vasitəçilər tutmaları, insanları küfrə çağırmaları və Muhəmməd (sallallahu aleyhi və səlləm)-in dinini insanların yanında nifrət etdirmələri ... bunlardandır"*** Sözü bitdi.

Burada bizim üçün şahid olan : Onun Allah ilə özü arasında vasitəçilər tutanları təkfir etməsidir.

Həmçinin həmin məktubda (s.305-də) İbni Suheymin düşmüş olduğu problemləri gətirərək demişdir:

***"Bəs Əli ibni Əbu Talib haqqında (batıl şeylərə) etiqad edən kimsələr barəsində nə deyirsən? Bu, insanların çoxunun Abdulqadir və başqaları haqqında olan etiqadı kimidir ..."*** Sözü bitti.

Onun vasitəçilər tutmalarına görə əl-Xarac əhlini təkfir etməsinə diqqət et! Hökmün səbəbini fe'lə bağlamışdır və fe'lin ismini üzərilərinə uyğulamışdır ki, bu da şirk ismidir.[91]

**- Səkkizinci nəql :** *"Tarixun-Nəcd"*, s. 274-də şeyxə qarşı atılmış ittihamlara cavab olaraq yazdığı rəddiyəsidir. Həmin risalə şeyxə qarşı söylənən ittihamların və sözlərin məcmusundan ibarətdir. Şeyx Muhəmməd ibni Abdulvəhhab onun haqqında deyilənlərin bəzisini doğruladı. Bunlardan :

***"Allahdan qeyrisinə yaxınlaşmaq istədiyi zaman nəzir verənin, həmçinin nəzirləri alan kimsənin təkfiridir."***

Yenə bunlardan : ***"Cinlər üçün qurban kəsmənin küfr olması, Allahın adını çəksə belə cinlər üçün kəsdiyi zaman kəsilən ətin haram olması və digər beş məsələnin hər biri doğrudur, mən onları deyirəm"***

Sonra yenə davam edərək dedi : ***"Zəlalət əhlindən olan bəzi insanlar şiddətli və bolluq anlarında Abdulqadir əl-Ceylani, Əhməd əl-Bədəvi, Adiy ibni Musafir kimi ibadət və saleh əməl sahibi digər salehlərdən bəzilərinə dua etməyə başladılar."***

Sonra isə elm əhlinin salehlərə edilən ibadəti inkar etdiklərini qeyd etdi və dedi :

---

[91] Yəni onların təkfirinin səbəbini vasitə tutmaları fe'linə bağladı və sonra da bu fe'lin ismini yəni şirki onların üzərinə tətbiq etməklə müşrik olmalarına hökm verdi. *(T.e)*

***"Elm əhli bu kimi bənzəri işlərin böyük şirk olduğunu bildirmişlər"*** Sözü bitdi.

Burada bizim üçün şahid olan : Budur ki, şeyx həmin üç qəbrə ibadət edənləri zəlalət əhli adlandırdı və onu da böyük şirk adlandırdı.

Sonra isə sözə davam edərək demişdir : ***"Düşün ki, bu onun Əli (radiyallahu anhu) haqqında dediyi sözdür. Bəs İbni Arabi və Abdulqadirin ilah olduğunu iddia edən kimsə haqqındakı söz (necə olsun?) ..."*** Sözü bitdi.

**- Doqquzucu nəql :** Şeyxin Əhsanın alimlərindən birisi olan Əhməd ibni Abdulkərimə yazmış olduğu məktubdur. Bu isə *"Tarixun-Nəcd"*, s. 346-də iyirmi birinci məktub olaraq keçməkdədir. Cahil olmaları ilə yanaşı qəbrlərə ibadət edənlərin fe'lləri Əhməd ibni Abdulkərim əl-Əhsaiyə qarışıq gəlmişdir və həmin əl-Əhsai qəbrlərə ibadət edənləri cəhalətlərindən dolayı müəyyən olaraq təkfir etmirdi, əməlin növünün təkfirini isə caiz görürdü. Yə'ni: *"onun fe'li küfrdür, şirkdir, lakin onun özü müşrik, kafir deyil, çünki o cahildir"* - deyirdi. Şeyx Muhəmməd ibni Abdulvəhhab yazdığı uzun məktubda onunla münaqişə etdi və orada demişdir:

***"(İbni Teymiyyənin) filankəslərin başçılarını müəyyən olaraqdan təkfir etməsi barəsində düşün! Onların riddəti açıq bir şəkildə olan riddətdir. Yenə onun sizin yanınızda dörd böyük alimlərinizdən biri olan Fəxrəddin ər-Razinin İslamdan çıxması üzərinə icmanı açıqlaması haqqında düşün! Bu, sənin onun sözündən anladığın "müəyyən kimsə kafir olmaz" anlayışına uyğun gəlirmi? Hətta bolluq və şiddətli anlarda Abdulqadirə dua etsə də, hətta Abdullah ibni A'vni sevsə də və Əbu Hədidə ibadət etməklə yanaşı dininin gözəl olduğunu iddia etsə də, … ?"***

Yenə məktubda sələfin təkfir etdiyi kimsələri qeyd etdikdən sonra demişdir :

***"İqna' kitabının şərhində "riddət" (babındakı) sözünü xatırla ki, necəki sizdə də mövcud olan bir çox (küfr) növlərini qeyd etmişlər. Sonra isə Mənsur əl-Bəhauti dedi ki : - "Bu firqələrdə riddət yayğınlaşdı, tövhid əhli bir çox kimsənin əqidələrini pozdular. Allahdan əfv və afiyət diləyirik"- Bu sözlər onun hərfi ilə olan ləfzləridir. Sonra isə, onlardan birisinin öldürülməsini və malının hökmünü zikr etdi. Səhabə zamanından Mansur əl-Bəhautinin zamanına qədər onlardan kimsə belə bir şey demişmi? -"Onlar (əməllərinin) növləri[92] ilə kafirdilər, müəyyən olaraqdan kafir deyillər" "***

Həmçinin Şeyx Muhəmmədin Abdulqadirə ibadət edən, onu ucaldan kimsələrin təkfir etməsinə dair bax : (*əd-Durərus Səniyyə, 10/ 63-74*)

(**Bəhautinin** *"riddət"* babında qeyd etdiyi tayfalar : hulul və ittihad əhli[93], rafizilər, batinilər və qərmətilərdir.)

---

[92] Yəni Şeyx Muhəmməd böyük şirk məsələlərində və zahir olan işlərdə növ ilə müəyyənin arasını ayırmır. Bu isə səhabənin zamanından *"Ravdatul Murbi'"* kitabının müəllifi əl-Bəhəutunin zamanına kimi müsəlmanların bu məsələ üzərindəki icmasının nəqlidir.

[93] **"Hulul və ittihad"** eyni zamanda **"vahdətul vucud"** olaraq da adlandırılır. Əsası buddizm və hinduizmdən gələn şirk etiqadıdır. İslam ümmətinin içərisinə nəsranilikdən və yunan fəlsəfəsindən təsirlənən sufilər və batinilər tərəfindən daxil edilərək mənimsənilmişdir.

**Hulul** iki şeyin varlığını isbat edərək, birinin digərinin içərisinə yerləşməsi və ona qarışmaması mənasındadır. Sufilər və bu inanca sahib digər firqələr bununla Allah azzə və cəllənin (haşa!)

**- Onuncu nəql :** Şeyxin əsərlərinin toplandığı *"Məcmua'tu Muəllifətiş-Şeyx Muhəmməd ibni Abdulvəhhab"*, əqidə bölümünün 1-ci qismində, səhifə 363-də kəliməi tövhidin təfsiri haqqındakı risalədir. Şeyx demişdir:

***"Və sən zamanımızın müşriklərini görürsən, bəlkə də, onların bəziləri özlərinin zühd əhli, çox çalışan və ibadət əhli olduqlarını iddia edirlər. Onlara bir zərər toxunan kimi Maruf, Abdulqadir əl-Ceylani kimi və onlardan daha böyük olan Zeyd ibnul Xattab, Zübeyr kimiləri və ya onlardan da daha böyük olan Rəsulullah (səllallahu aleyhi vəsəlləm)- kimi Allahdan qeyriləri ilə istiğasə etməyə qalxarlar. Allahu mustəan! Bundan daha da pis olanı isə onların Şəmsan, İdris və əl-Əşqar adlanan birisi, Yusuf və bənzəriləri kimi tağutlardan, kafirlərdən və mürtədlərdən yardım istəmələridir."*** Sözü bitdi.

Burada bizim üçün şahid olan : Onlara ibadət edənləri ***"müşriklər"*** adlandırmasıdır. Beləki, risalənin əvvəlində ***"Və sən müşrikləri görürsən ..."*** i.a demişdir, həmçinin

---

məxluqatına və ya bəzi məxluqatına yerləşdiyini qəsd edirlər. Hulul iki qismdir: 1) *Ümumi hulul* və 2) *Xas hulul*

*Ümumi hulul* Allah azzə və cəllənin hər şeyə hulul etdiyi mənasındadır. Bu inanca görə Allah hulul etdiyi heç bir şey ilə bütünləşməz, əksinə o, ayrılması ilə bərabər hər yerdədir. Bu cəhmilərin və onlara bənzər küfr tayfalarının etiqadıdır.

*Xas hulul* isə Allah azzə və cəllənin məxluqlarından bəzisinə hulul etdiyi mənasındadır. Bu inanc nəsranilərin və rafizilərin onlardan aldığı batil etiqaddır. Bu inanc iki şeyin varlığını: yaradanın və yaradılmışın varlığını isbat etməyə çalışır. Beləki, nəsranilərə görə Allah azzə və cəllə İsa (aleyhissəla)-ın vücuduna hulul etmişdir. O, vəhy ilə danışdığı zaman Allah, çarmıxa çəkildiyi zaman isə özü idi. Həmçinin rafizilərin aşırıları Allahın Əli ibni Əbi Talibə hulul etdiyinə və onun ilah olduğuna inanırlar. Bunların ilkin sələflərini Əli (radiyallahu anhu) yandıraraq öldürmüşdür.

**İttihad** isə iki şeyin bir-birinə qarışaraq bütünləşməsi, tək bir şeyə çevirilməsidir. (Bax: *"ət-Tə'rifat li Curcani, s.9"*) Bununla Allah azzə və cəllənin məxluqatı ilə və ya bəzisi ilə bütünləşdiyini qəsd edirlər. Yəni kainatın bir qismi və ya hamısı Allahın elə özüdür deyirlər. Bu da iki qismdir: *1)Ümumi ittihad* və 2) *Xas ittihad*

*Ümumi ittihad* buna eyni zamanda vahdətul vucud da deyirlər. Bu inanca görə Allah yaradılmış hər bir şeylə bütünləşir, kainat elə Allahın özüdür. Bu inanc sahiblərinə ittihadiyyə və ya vahdətul vucud əhli deyilir. İbnu Arabi, İbnul-Fariz, Tilmisani və İbnu Səbi'n və başqaları bu etiqada sahibdilər.

*Xas ittihad* isə Allah azzə və cəllənin bəzi məxluqlarla bütünləşdiyi halda bəziləri ilə bütünləşmədiyi inancıdır. Bu inancın sahibləri digərindən fərqli olaraq Allahın pis olan şeylərlə bütünləşmədiyinə inanırlar. Onların etiqadına görə Allah peyğəmbərlər, salehlər kimi məxluqlarla bütünləşər, hətta onlar eynən Allahın Özü olarlar. Həmçinin bu inanc nəsranilərin başqa bir firqəsinə aiddir. Digər firqələrdən (yəni hulula inananlardan) fərqli olaraq bu inancın sahibləri etiqad edirlər ki, Allah İsa ilə bütünləşdi və İsa elə Allahın Özü oldu.

Hulul ilə ittihadın fərqi budur ki, hulul iki şeyində mövcudluğunu isbat etdiyi bir halda ittihad yalnız bir şeyin mövcudluğunu isbat edir. Həmçinin hulul bir-birindən ayrılmağı qəbul etsə də ittihad ayrılmağı qəbul etməz. Bunu aid bir misal çəksək daha aydın olar: Əgər içərisi su ilə dolu stəkana şəkər tozu əlavə etsək və onu qarışdırmasaq bu hulul olacaq. Çünki burada iki şeyx mövcuddur: su və şəkər tozu. Bu ikisi bir-birindən ayrıdır. Lakin onu qarışdırsaq şəkər tozu suya qarışaraq yox olacaq, yəni su ilə bütünləşəcəkdir. Bu zaman buna ittihad deyilir. Ona görə ki, ikisi bir-birindən ayrı deyil və burada artıq bir şey mövcuddur: şəkərli su.

Başqa bir misal isə, suyun içərisinə xırda daş dənəcikləri qoyarsaq bu hulul olacaq. Çünki burada iki şey mövcuddur: daş və su. Bunlar ikisi bir-birindən ayrı şeylərdir və qarışaraq bütünləşməmişlər.

Şübhəsiz bu inancların hamısı şirk və küfr inanclarıdır, lakin bunlar içərisində ittihad hululdan daha iyrənc olanıdır, ümumi ittihad isə ən iyrənc olanı və ən xəbis olanıdır. Bu kimi çirkin və azmış inanclardan Allaha sığınırıq!

(**Şeyx Muhəmməd ibni İbrahim alu-ş-şeyxin** *"Mustalahat fi kutubil-aqaid"* kitabından ixtisarla və cüzi əlavələrlə) *(T.e)*

onları Allahdan qeyrisi ilə istiğasə edənlər şəklində vəsf etmişdir. Bəs Allahdan qeyrisinə ibadət etdikləri halda onların müsəlman olmaları, onlara İslam və iman isminin verilməsi mümkündürmü? Bu şəri olaraqdan imkansızdır, ona görə ki, İslam ilə şirk bir-birinin əksi olub bir yerdə cəmləşə bilməzlər.[94]

**- On birinci nəql :** Bu nəql bu məsələni gözəl şəkildə açıqlayan sözlərin mahiyyəti hesab olunur. Burada şeyxin böyük şirkdə cəhaləti üzrlü saymadığı anlaşılmaqdadır ki, bunu məktubunda qeyd edəcəkdir. Şeyx xəfi məsələlər istisna olmaqla cahil olaraq böyük şirkə bulaşan kimsəni müşrik adlandırır, qəbrlərə ibadət etmək isə xəfi olan məsələlərdən deyil açıq olan məsələlərdəndir. Təkfirə gəlincə isə, əgər o dəvətin çatmadığı kimsələrdən olarsa – ki, bunlar da üç sinifdir- və ona hüccət iqamə edilibsə o kimsə kafir olar. Üç sinifin xaricindəkilərə gəldikdə isə artıq onlara hüccət iqamə edilmişdir, onlara şirk və küfr ismi aid edilər.

Bu risalə şeyx Muhəmməd ibni Abdulvəhhab əl-Uyeynədə dəvətinin başlanğıcında ikən əd-Diri'yyədəki bəzi tələblərinə yazmış olduğu məktubdur. Onun tələbələri **İsa ibni Qasim** və **Əhməd ibni Suveylim** idilər. Həmin məktub *“Tarixun-Nəcd”* s. 410-da mövcuddur.

Burada şeyx Muhəmməd ibni Abdulvəhhab onların tağutların və onlara tabe olanların təkfirində : “onlara hüccət iqamə edilmişmi yoxsa yox?”- deyə necə şübhəyə düşdüklərinə təəccüb etmişdir. Şeyx Muhəmməd cahil olmalarına görə və hüccət iqamə olunmadı deyə tağutların və onlara tabe olanların təkfirində duranlara[95] etiraz edərək qarşı çıxmışdır və demişdir:

***“Sizə şeyxin (İbni Teymiyyənin) bu və ya başqa şəkildə inkar edən və hüccətin iqamə edildiyi hər kəs haqqındakı sözünü qeyd etdim və siz: onlara hüccət iqamə edildimi?- deyə bu tağutlar və onların tabeçiləri haqqında şəkk edirsiniz. Sizin bunda şəkk etməyiniz necə də qəribədir! Mən sizə bunu dəfələrlə izah etdim ki, üzərinə hüccətin iqamə edilmədiyi kimsə[96] İslama yeni girən və uzaq çöllərdə yaşayan və ya sarf və atf[97] kimi xəfi məsələlərdəki kimsələrdir ki, onlara bildirilincəyə qədər təkfir olunmazlar. Ancaq Allahın açıqladığı və Kitabında hökm***

---

[94] Bu bir qaydadır: Bir-birinə zidd olan iki şey bir yerdə cəmləşə bilməzlər. Birinin varlığı ilə digəri yox olub gedər. *(T.e)*

[95] Şeyx Muhəmmədin tağutlara “küfr” ismini icra etməyən tələbələrinə etiraz edərək dediyi sözə diqqət edilməsi gərəkir. Ancaq “tağut” isminə və “müşrik” isminə gəldikdə, o da tələbələri də bunu onların üzərində icra edirdilər. Bunun üçün şeyxin nəfy (yəni inkar )etdiklərinə hər zaman diqqət et, bu çox incə bir şeydir! O, küfr ismini nəfy etsə də, şirk və müşrik isimlərini nəfy etmir. Bu sözü yaxşıca həzm olunması üçün çoxlu təkrar edəcəyik. Bu söz sadəcə təkfirin nəfy edilməsinə aiddir, islam ismi isə ondan nəfy edilmişdir və bunun heç bir dəyəri yoxdur.

[96] Yə'ni, cəzalandırılması və ya öldürülməsini gərəkdirən küfr isminin aid edilməsi üçün hüccətin iqamə edilmədiyi kimsə. Ancaq bu 3 sinif və onlarla birlikdə küfr bölgəsində böyüyən kimsə şirk işlədiyi zaman onlara adları (yəni müşrik adı) verilir. Lakin onlar öldürülməsi, savaşılması, cəzalandırılması və küfr ismi ilə adlandırılmaları üçün onlara hüccətin iqamə edilmədiyi kimsələrdir.

[97] **Sarf** və **atf** ər-arvadın arasını ayırmaq və ya birləşdirmək üçün edilən sehr növüdür. **Sarf**, əri arvadından və ya arvadı ərindən ayırmaq üçün edilən sehrə deyilir. Beləki, ər arvadının yanına gəldikdə onu çirkin şəkildə görər və ondan qaçar, ona yaxınlaşmaq istəməz. Və yaxud qadın ərini gördükdə onu çirkin şəkildə görər və ondan uzaqlaşar, beləcə aralarında ayırılıq hasil olar. Ancaq buna səbəb sehrbazın etdiyi sehrdir. **Atf** isə əksinə, çirkin olan bir qadını kişiyə sevdirmək üçün və ya çirkin olan kişini qadına sevdirmək üçün edilən sehrdir. Beləki, sehrlənmiş kişi çirkin qadını öz gözündə ən gözəl şəkildə görər və onu ən gözəl qadın hesab edər. Həmçinin sehrlənmiş qadın çirkin olan kişini ən gözəl kişi kimi görər. Buna səbəb isə sehrbazın etdiyi sehrdir. *(T.e)*

***etdiyi dinin əsllərinə gəlincə, şübhəsiz ki, Allahın hüccəti Qurandır. Quran kimə çatmışsa artıq ona hüccət çatmışdır.***

***Lakin buradakı problemin əsli sizin hüccətin iqamə edilməsi ilə hüccətin fəhm edilməsinin arasını ayırmamağınızdır. Məhz, kafirlərin və münafiqlərin çoğu Allahın hüccətinin onlara çatması ilə yanaşı onu anlamamışlar. Necə ki, Allahu təala buyurmuşdur :***

***"Yoxsa sən hesab edirsən ki, onların əksəriyyəti səni eşidəcək və ya düşünəcək? (Xeyr!) Onlar heyvan kimidirlər, hətta daha çox yolunu azmışlar"*** **(Furqan,44)**

***Hüccətin iqamə edilməsi və çatması ayrı bir şey, onun anlaşılması isə ayrı bir şeydir. Onların küfrləri hüccətin onlara çatması ilədir, hətta onu anlamasalar da, bu ayrı bir şeydir ..."***

Sonra şeyx hüccətin iqamə edildiyi, lakin onu anlamayan insanları qeyd etdi. Xəvaricləri, Əli (radiyallahu anhu)-nun yandırdığı aşırıları və aşırı qədəriyyələri zikr etdi, sonra isə dedi :

***"Əgər bunu bildinizsə, sizin içində olduğunuz vəziyyət də budur: tağutlara ibadət edənlərin və İslam dininə düşmənçilik edib anlamadıqlarından ötrü onu riddət hesab edən[98] insanlar haqqındakı şəkdir ..."*** Sözü bitdi.

**Bu məktubun xülasəsi :** budur ki, şeyx bəzi tələbələrinin cahil olduqlarından ötrü hüccəti fəhm etməyən cahillərin təkfirində (burada təkfir ləfzinə diqqət et!) durmalarına etiraz edərək qarşı çıxmışdır. Çünki bu yanlış bir şeydir və tələbələrinə yalnız 3 sinif cahillərin təkfirində durulacağını bildirmişdir: 1) İslama yeni girmiş kimsə 2) uzaq çöldə yaşayıb, böyüyən kimsə. Bəzi risalələrində başqa şəxsləri də əlavə etmişdir ki, bunlar küfr bölgəsində yaşayıb, böyüyən kimsələrdir. 3) Gizli məsələlərdəki kimsələr. Tələbələrinə qəbrlərə ibadət etməyin gizli məsələlərdən olmadığını bildirmişdir.

Şeyx Muhəmmədin bu üç sinifin təkfir edilməməsi ilə bağlı dediyi sözün və onlara küfr isminin işlədilməsini nəfy etməsinin[99] fəhm edilməsi gərəkir. Çünki həmin üç sinif hüccəti eşitməyən və onlara hüccətin çatmadığı kimsələrdir. Lakin şirk və müşrik isimləri bu kimsələrə aid edilir və onlar "müşiklər", "Allahdan başqasına ibadət edənlər" və "Allah ilə yanaşı başqa ilahlar götürənlər" olaraq adlandırılarlar və onlardan İslam ismi nəfy edilər. Bunların hər biri onlara aid edilər, çünki onlar şirk işləyirlər və şirk ismi onları əhatə edir və üzərilərində doğrulanır.

Lakin küfr ismi, öldürmək və əzablandırmaq kimi kafirlərin əhkamları onlara aid edilməz, çünki onlara hüccət iqamə edilməmişdir. Çünki küfrün mənası rəsulu inkar etmək və yalanlamaqdır. Beləki, ona rəsulun xəbəri gələr, sonra isə onu inkar edər və ya yalanlayar yaxud inad edər və ya bundan uzaqlaşar və ya üz çevirər. Ona rəsulun xəbərinin gəlməsinin mənası isə yəni ona hüccətin iqamə olunmasıdır. Şirk isminə gəldikdə isə o, Allahdan qeyrisinə ibadət deməkdir və onun hüccətlə bir bağlantısı yoxdur. Necə ki, **İbni Teymiyyə** *"Fətava"*-sında 20/37-38 –də bunu demişdir və bu çox mühim bir mövzudur. Orada demişdir :

---

[98] Yəni İslamın gerçək həqiqətini anlamayıb onu dindən çıxaran bir şey olduğunu hesab edənlər. *(T.e)*

[99] Nəfy etmək, yəni inkar etmək deməkdir. Bu ifadə irəlidə çox işlədiləcək. *(T.e)*

***"Müşrik ismi risalətdən (yəni hüccətdən) öncə də sabitdir. Çünki o rəbbinə şərik qoşmuş və başqasını Onunla bir tutmuşdur"***

Şeyxin *"mən falan-filankəsi təkfir etmirəm"* – dediyi zaman bununla yalnız (buradakı yalnızlaşdırmağa diqqət et!) küfr ismini nəfy etdiyini başa düşmək gərəkir. Lakin bu, təkfirin nəfy olunduğu kimsənin müsəlman olmasını və ya ona İslam və yaxud müsəlman hökmünün verilməsini gərəkdirmir. Çünki şeyx bu ikisinin arasını ayırır.

Şeyx Muhəmməd ibni Abdulvəhhabın nəqllərini gözdən keçirdikdən sonra bizə aydın oldu ki, şeyx dəvətini izhar etdikdən sonra cahil olan kimsələri təkfir etmişdir. Yalnız, müəyyən şəxsləri təkfir etməyib, lakin onları müsəlman və ya müvahhid də adlandırmadı. Əksinə, onları müşriklər adlandırdı: uzaq çöllərdə yaşayan, islama yeni girmiş kimsələr və küfr bölgəsində böyüyən kimsələr kimi. Bunlardan başqaları isə küfr ismində üzrlü olmazlar. Şirk isminə gəlincə isə onu işləyən kimsə üçün - nə üç sinifdən olan kimsə, nə də başqa heç kim - üzrlü sayılmaz.

Həmçinin aydın olur ki, təkfirin olmadığı anlaşılan nəqllər hüccətin çatmadığı kimsələrə şamil edilir. Bu məsələnin daha çox aydın olması üçün şeyxin nəvələrindən **Şeyx İshaq ibni Abdurrahmanın** sözünü nəql edək. Belə ki, Şeyx İshaq *"Təkfirul-Muayyən"* adlı kitabının 16-cı səhifəsində bu məsələyə toxunmuşdur. Heç də qəribə deyil ki, Şeyx Muhəmməd ibni Abdulvəhhabın sözlərini insanlardan ilk öncə onun tələbələri və nəvələri başa düşmüşlər və onlar şeyxin elmini digərlərindən daha çox dərk etmişlər.

**Şeyx İshaq ibni Abdurrahman** bəzi şeyləri qeyd etdikdən sonra demişdir :

***"Bu haqda az bir şey qeyd edəcəm, çünki bu məsələ ittifaq edilmiş bir məsələdir və buradakı söz ixtisar məqamındadır. Onun sözlərindən şübhə olaraq sənin diqqətini çəkən sözünü zikr edək, hansı ki, onu qeyd etdiyimiz kimsələr "Kəvvazın türbəsi"[100]-nə ibadət edən barəsində şeyxin onun təkfirində durmasını dəlil gətirirlər*** - (Diqqət et! Buradakı durma təkfir ismindədir, onun müşrik olmasına gəldikdə isə şeyx bunda durmadı, çünki onu, türbəyə ibadət edən olaraq adlandırdı. Allahdan başqasına ibadət edənin müsəlman adlandırılması isə əsla mümkün deyil. Ona görə ki, İslam və şirk iki zidd şey olub bir yerdə cəmləşə bilməzlər) - ***İlk öncə, cavabın verilməsi yönünü və nədən dolayı bu şəkildə gətirildiyini qeyd edək. Şeyx Muhəmməd (rahiməhullah) və ondan bu qissəni nəql edənlər bunu onların müsəlmanları təkfir etdiklərini iddia edən qarşı tərəfə bir üzr olaraqdan zikr etməkdədirlər.*** - (Şeyx Muhəmməd müsəlmanları təkfir etmir. Ona görə ki, müsəlman kəliməsi ümumi bir sözdür və onların içərisində küfr ismini haqq etməyən hüccətin iqamə edilmədiyi kimsələr də vardır) - ***Yoxsa ki, bu iddianın özü təkbaşına hüccət ola bilməz, əksinə onun Quran və Sünnədən dəlilə, şahidə ehtiyacı var... i.a."***

Sonra yenə şeyx 19-cu səhifədə demişdir :

***"Onun – yəni Şeyx Muhəmməd ibni Abdulvəhhabın – bəzi cavablarında (təkfirdə) dayanması bunun hansısa məsələlərdən birinə aid olduğuna şamil edilir. Həmçinin onun : "Yer üzündə iqamə edib qalan kimsənin halının nə olduğunu bilmirəm"[101] - sözündə olduğu kimi yenə (təkfirdə) durduğunu görürsən.***

---

[100] İraqda Bəsərə şəhərində yerləşən türbələrdən biridir. *(T.e)*

[101] Yəni şirk işləyən və hüccətin ona çatmadığı bir kimsə bütün ömrünü bu şəkildə yaşayıb bitirərsə. *(T.e)*

***Aman Allah! Necə də qəribədir! Şeyxin Quran və Sünnədən olan dəlilləri ilə yanaşı bütün mövzularda demiş olduğu sözlərini və "kimə Quran çatmışsa ona artıq hüccət çatmışdır" - sözündə olduğu kimi İbni Teymiyyənin, İbnul Qayyimin sözlərini tərk edirlər və (şeyxin) bir yerdə dediyi sözü alıb ümumiləşdirirlər ...”*** Sözü bitdi.

Şeyx İshaqın sözlərindən bu nəticələri çıxara bilərik :

1) Şeyx Muhəmməd ibni Abdulvəhhab qəbrlərə ibadət edənlərdən təkfiri nəfy etdiyində, o, bununla ümumi nəfyi qəsd etmişdir. Çünki onların arasında üç sinif kimi hüccətin iqamə edilmədiyi kimsələr var ki, bunları kafir adlandırmır. Lakin şirk və müşrik ismini onlara verir, çünki onlar bunu işləyirlər və müşrik ismi onların üzərində doğrulanır. Ümumiyyətlə qəbrlərə ibadət edən kimsəyə ümumən müşrik ismi verilir və onlardan kimsə bundan istisna edilmir. Lakin küfr isminə gəlincə, qəbrlərə ibadət edənlərə nisbətən hüccətin iqamə edilib-edilməməsinə görə bunda təfsilat vardır. Şeyx bu isimlərdə çox dəqiqdir və bunların arasını hüccətə əsasən ayırır. Necə ki, inşəallah irəlidə şeyxin tələbələrinin sözlərinə, xüsusən də ona bağlı olan tələbələrinin sözlərinə əlavə olaraq açıq şəkildə izahı gələcək.

Yəni qəbrlərə ibadət edənlərin hər bir fərdi kafir deyil, lakin qəbrlərə ibadət edənlərin hər bir fərdi müşrik olaraq adlandırılar. Beləki, burada qəbrlərə ibadət edən üç sinif var ki, onlara hüccət iqamə edilmədiyinə görə kafir deyillər, lakin müsəlman da deyillər. Bunlar: İslama yeni girmiş kimsə, çöllükdə yaşayıb, böyümüş kimsə və küfr bölgəsində yaşayıb, böyüyən kimsədir. Əgər qəbrlərə ibadət edən hər bir fərd təkfir edilərsə, o zaman həmin bu üç sinif də buna daxil olacaq. Şeyxin sözləri bu çərçivədə anlaşılması gərəkir.

2) Şeyxin bəzi yerlərdə şirkdə deyil küfr ismində dayanması, hər hansı bir məsələdən dolayıdır, lakin bu təməl olan bir şey deyil.

# 5-ci FƏSL :

## Şeyx Muhəmməd ibni Abdulvəhhabın sözlərini fəhm etməyib dəlil kimi gətirdikləri nəqillərə və risalələrə cavab :

(İnşəallah söz əsnasında mötərizə içərisində tə'liqlər edəcəyik)

- **Birinci nəqil:** Şərifə göndərdiyi məktubdur və o Nasiruddin Əsədin təhqiqi və gözdən keçirməsi ilə olan *"Tarixun-Nəcd"* kitabının 407-ci səhifəsində yerləşir.
Bu məktub iki səhifə yarım yer tutur və şeyx onun girişində demişdir :

***"Şərif məndən nə üçün savaşdığımızı və nə ilə insanları təkfir etdiyimizi soruşdu*** - (sualın təkfir və savaş barəsində olduğuna diqqət et!) - ***Ona cavab verərək dedim ki : ..."***

Sonra isə şeyx təkfir etdiyi kimsələrin 4 sinif olduğunu qeyd etdi (təkfirin səbəbi məktubun sonunda gələcəkdir), bundan sonra isə şeyx Muhəmməd ibni Abdulvəhhab onun əleyhinə ortaya atılmış şübhəyə rəddiyə verməyə keçir. Həmin şübhə isə onun ümumla təkfir etməsidir ki, o bu məsələni də həmin məktuba əlavə etmişdir və demişdir:

***"Yalan və böhtanlara gəlincə isə, hansı ki, onların bu sözü kimi: (güya) biz ümumla təkfir edirik*** (çünki təkfir hüccətə bağlıdır, hər kəsə hüccətin çatıb çatmadığı isə bilinməz)***, dinini açığa vurmağa qadir olan hər kəsə bizə hicrət etmələrini vacib görürük, küfr etməyən və savaşmayan kimsələri təkfir edirik və bunun kimi neçə-neçə iftiralar və böhtanlar… Bütün bunların hamısı insaları Allahın dinindən və rəsulundan qaçırtmaq üçün ortaya atılmış yalan və böhtanlardır. Əgər biz Abdulqadirin qəbri üzərindəki bütə, Əhməd Bədəvinin qəbri üzərindəki bütə və bənzərilərinə ibadət edənləri cəhalətləri səbəbi ilə və onları xəbərdar edən kimsənin olmamasından dolayı[102] təkfir etmiriksə[103], bizə hicrət etmədiyi zaman, küfr etməyib və bizimlə savaşmadığı zaman Allaha şirk qoşmayan kimsəni necə təkfir edərik ki? Subhanəllah! Bu böyük böhtandır! Əksinə, biz Allaha və rəsuluna qarşı gələn bu dört sinifi təkfir edirik.[104] Öz nəfsinə baxıb, cənnət və cəhənnəmin yanında olduğu Allah ilə qarşılaşacağını bilən kimsəyə Allah rəhm etsin! Muhəmmədə, ailəsinə və əshabına salat və salam olsun !"*** – şeyxin hərfi ilə sözləri burada bitdi.

<u>Onun sözündən bizim üçün şahid olan budur :</u> "***Əgər biz Abdulqadirin qəbri üzərindəki bütə, Əhməd Bədəvinin qəbri üzərindəki bütə və bənzərilərinə ibadət edənləri cəhalətləri səbəbi ilə və onları xəbərdar edən kimsənin olmamasından dolayı təkfir etmiriksə…"*** (Təkfiri nəfy etməyin (inkar etmənin) mənası heç də ona

[102] Cəhalət təkfirin, qətlin və əzablandırmanın əngəlidir, lakin onlara şirk isminin verilməsi üçün əngəl deyildir. Çünki onları Allahdan qeyrisinə ibadət edənlər kimi adlandırdı.

[103] Diqqət et! Burada nəfy təkfir və qətl üçündür. Ancaq müşrik olmasına gəldikdə isə bəli, bu belədir (bu ondan nəfy olunmaz). Çünki o, Allahdan qeyrisinə ibadət edir. Buna görə də "*qəbr üzərindəki bütə ibadət edənlər"* dedi. Kim də bütə ibadət edərsə, müsəlman adlandırılmaz.

[104] Ona görə ki, onlar bildilər (sonra isə qarşı çıxdılar) Kim, hüccət iqamə edildikdən sonra (ona) qarşı çıxar və inad edərsə, artıq küfr ismini haqq etmiş olar.

müsəlman isminin verilməsi  və ya müsəlman adlandırılması demək deyil. Əksinə, o kimsə cahil müşrikdir)

**- İkinci nəqil:** *"Tarixun-Nəcd"* 320-ci səhifədə yerləşən, Uyeynədə ikən dəvətinin başlanğıcında **Abdurrahman ibni Abdullah** isimli İraq əhlinin alimlərindən birisi olan **əs-Suveydi əl-İraqi**-yə yazdığı köhnə məktubudur.

Həmin məktubda Şeyx Muhəmməd ibni Abdulvəhhab əs-Suveydinin bəzi suallarına cavab verib. əs-Suveydi şeyxdən insanların onun haqqında danışdığı məsələləri soruşmuşdur. Beləki, o şeyxdən onun edildiyi ittihamlar barəsində soruşmuşdur, bunların içərisində onun bütün insanları təkfir etməsi də var. (Buradakı ümumla bağlı açıqlamamız öncəki məktubda keçdi.) Şeyx bu ittihamlara cavab verdi və dedi:

***“Bunlardan*** –yəni şeyxin ittiham edildiyi ittihamlardan- ***hansı ki, siz mənim haqqımda deyirsiniz ki,  mənə tabe olmayan  bütün insanları təkfir edirəm və onların nikahlarının səhih olmadığını iddia edirəm. Necə də qəribədir! Bu cür şeylər ağıl sahibi olan birisinin ağlına necə girə bilər? Bunu deyən kimsə müsəlmandır yoxsa kafir? Arif  birisidir  yoxsa dəli?”***

Sonra isə nəbi (səllallahu aleyhi və səlləm)-in türbəsini dağıtmaq və *“Dəlailul-Xayrat”* kitabını yandırmaq ittihamına cavab verdi və sonra yenə “ümumla təkfir etmək” töhmətinə qayıdaraq dedi:

***“Təkfirə gəlincə isə mən rəsulun dinini bildikdən sonra ona söyən və insanları ondan qaçırdan və dinin buyuruqlarını yerinə yetirən kimsələrə düşmənçilik edən bu kimsələri təkfir edirəm*** - (Diqqət et! Çünki o bildi və inkar etdi, beləcə küfr ismini haqq etdi, çünki küfr bir inkardır və bu da inkardır) - ***Allaha həmd olsun ki, ümmətin əksəriyyəti bu cür deyil!”***  Sözü bitdi.

(Yəni ümmətin əksəriyyəti inkarçı deyil, əksinə onların çoxu ya cahillərdir, ya  da təvil edənlərdir. Lakin bunlar şirk babında onlara fayda vermir)

Onun bu sözü : *“**mən rəsulun dinini bildikdən sonra ona söyən… kimsəi təkfir edirəm**”* – bu inadçının sifətidir. Bu – yəni əs-Suveydiyə yazılmş – məktub *“Misbahuz-Zallam”* kitabında 43-ci səhifədə zikr edilib.

**- Üçüncü nəql:** *“Tarixun-Nəcd”* 263-cü səhifədə yerləşən, Sərmədan şəhərinin alimlərindən biri olan **Muhəmməd ibni İ'd**-ə yazdığı məktubdur. Həmin məktub yeddi səhifədən ibarət uzun bir məktubdur və şeyx bununla Muhəmməd ibni İd-in məktubuna cavab verib.

Şeyx Muhəmməd ibni Abdulvəhhab məktubun başlanğıcında özünün dörd məsələ ilə tanındığını vurğulayıb və həmin dörd məsələni sıralamışdır. Onlar :

1- O, tövhidi açıqlamışdır,
2- şirki açıqlanmışdır,
3- O, özünə tövhidin açıqlandığı kimsəni təkfir etmişdir (Burada *özünə açıqlandığı* kəliməsinə diqqət et! Yəni o, yalnız bilən və tövhidin açıqlandığı kimsələri təkfir edir. Çünki təkfir hüccətə bağlıdır. Şirk işlədiyi zaman həmin kimsənin müşrik olmadığını da deməyib. Şirk isə, *özünə açıqlandığı*  kəliməsinə bağlı deyil.)
4- O, özünə tövhidin açıqlandığı kimsələrlə savaşmağı əmr etmişdir. (Yenə diqqət et! Qətl və savaş hüccətə bağlıdır)

Burada bizim üçün şahid olan budur ki: Şeyx Muhəmməd ibni Abdulvəhhab onun tövhidin açıqlandığı kimsəni təkfir etdiyini bildirərkən demiş olduğu sözüdür :

***"Üçüncüsü, özünə tövhidin Allahın və rəsulunun dini olduğu açıqlandıqdan sonra ona nifrət edən, insanları ondan qaçırdan, bunda rəsulu doğrulayan kimsə ilə mücadələ edən kimsələrin təkfiridir. Həmçinin şirki bilən və rəsulullah (səllallahu aleyhi vəsəlləm)-in onun inkarı ilə göndərildiyini bilən, gecə-gündüz bunu dilə gətirib sonra isə insanlara onu (yəni şirki) övən, gözəl göstərən və onun (sallallahu aleyhi vəsəlləmin) ümmətinin (qiyamət günü) insanların böyük əksəriyyətini təşkil edəcəyindən (dolayı) onların xəta etməyəcəklərini[105] iddia edən kimsələrin təkfiridir. Ancaq düşmənlərimin mənim haqqımda dedikləri ki, (guya) mən insanları zənn ilə və tərəfkeşliyə görə təkfir edirəm və ya hüccətin iqamə edilmədiyi cahili təkfir edirəm, bunlar böyük böhtanlardır. Bununla insanları Allahın dinindən və rəsulundan qaçırtmaq istəyirlər."*** Sözü bitdi.

Şeyxin sözlərinə xüsusilə sonuncu sətirdə sözünü bu şəkildə ifadə etməsinə diqqət et! ***"və ya hüccətin iqamə edilmədiyi cahili təkfir edirəm"*** (Hüccətin iqamə edilmədiyi (yəni şirkin faili) cahil təkfir olumaz, lakin nə müsəlman, nə də müvahhid adlanmaz. Küfr və ona bağlı olan şeylər ilə şirk və ona bağlı olan şeylərin arasını ayır! Necə ki, **İbni Teymiyyə** demişdir :

***"Allah isimlərdə və əhkamlarda (bəzilərinin) risalətdən öncə və sonra arasını ayırmış və bəzilərinin isə arasını cəm etmişdir."*** **(Məcmuu'l-Fətava, 20/37-38)**

**- Dördüncü nəqil:** Şeyxin bəzi tələbələrinin ondan qeyd etdikləridir. Belə ki, **Şeyx Abdullatif ibni Abdurrahman** özünün *"Misbahuz-Zallam"* kitabının 324-cu səhifəsində **Şeyx Muhəmməd ibni Abdulvəhhab** haqqında danışarkən demişdir :

***"O, yalnız hüccətin iqamə edilməsindən və dəlilin ortaya çıxmasından sonra təkfir edir*** - (Diqqət et! Nəfy sadəcə təkfir üçündür)- ***Hətta rahiməhullah qəbrlərə ibadət edən cahilləri onları xəbərdar edəcək birisinin olmadığı zaman təkfir etməmişdir"***

(Onları təkfir etməməsi ilə yanaşı ***"qəbrlərə ibadət edənlər"*** olaraq adlandırdı. Allahdan qeyrisinə ibadət edən kimsənin müsəlman olması mümkün deyil. Çünki İslam və Şirk ikisi bir-birinə zidd şeylərdir və bir yerdə cəmləşə bilməzlər)

Yenə **Şeyx Abdullatif** *"Minhacut-Tə'sis"* adlı kitabında 187-ci səhifədə demişdir :

***"Şeyximiz məclislərində və məktublarında yalnız, rəsulun dinini bilən və onu bildikdən sonra düşmənçiliyini ortaya çıxaran kimsələri təkfir etdiyini bildirərdi. Bəzən deyərdi ki: "Kəvvazın türbəsinə ibadət edənləri təkfir etmədiyimizdə…"- bəzəndə deyərdi ki: "Yer üzündə iqamə edib qalan və öz həvasına tabe olan kimsənin halının nə olduğunu bilmirəm""***

**Şeyx Abdullatif** demişdir : ***"Hətta o, nəsihət edən birisinin olmadığı zaman və işlənilməsi halında sahibini küfrə salan hüccətin çatmadığı zaman qəbr əhlindən və***

[105] Yəni tövhid və şirk mövzusunda *(T.e)*

***digərlərindən Allahdan qeyrisinə dua edən cahil kimsənin təkfirinə qərar verməmişdir..."***

(İlk öncə nəfyin təkfir üçün olduğuna diqqət et! Sonra isə təkfirin nəfy edildiyi kimsələr haqqında dediyi sözə diqqət et! Onlar haqqında ***"Kəvvazın türbəsinə ibadət edənlər"*** və ya "***qəbr əhlindən və digərlərindən Allahdan qeyrisinə dua edən"***- lər dedi. Heç Allahdan qeyrisinə ibadət edən kimsələri müsəlman adlandırması ağıla sığarmı!? )

(***"Yer üzündə iqamə edib qalan kimsə"*** haqqındakı sözünə gəlincə isə onu nə kafir adlandırdı, nə də müsəlman. Onun haqqında təvaqquf etdi (yəni durdu), lakin eyni zamanda onu müşrik adlandırdı. Çünki o, Allahdan qeyrisinə ibadət etmişdir və şirk ismi onun üzərində doğrulanmışdır və onu əhatə etmişdir.)

**Şeyx Muhəmmədin** sözlərinin xülasəsi budur :

1) O, Allahdan qeyrisinə ibadət edən kimsəni heç vaxt müsəlman adlandırmayıb.
2) O, yalnız küfr ismini və öldürməyi nəfy etmişdir, başqa bir şeyi deyil.
3) O, həmin kimsələri Allahdan qeyrisinə ibadət edənlər və Ondan qeyrisinə dua edənlər olaraq adlandırdı. Onlar haqqında müşrik sifətini doğruladı, lakin hüccətin iqamə edilmədiyi cahili müşrik olmaları və Allahdan qeyrisinə ibadət etmələri ilə vəsf etsə də, yalnız hüccət iqaməsindən sonra onları küfrlə vəsf etdi və (kafir) adlandırdı.[106]

---

[106] **Bu məsələdə Şeyxül-islam İbni Teymiyyənin sözlərinin dəyərləndirilməsi:**
Əslində Şeyx Muhəmməd ibni Abdulvəhhabın bu məsələdə Şeyxül-islam İbni Teymiyyənin sözlərinə əsaslandığı aydın olur. Şeyxül-islamın bu mənada işlətdiyi sözlər həm Muhəmməd ibni Abdulvəhhabın sözlərinə həm də özünün bir çox yerlərdə hüccətdən öncə təkfirin olmamasına dair anlaşılan sözlərinə işıq tutur. Özlərini İbni Teymiyyənin mənhəcinə nisbət edən bəzi cəhalətçilər onun məlum sözlərini irəli sürməklə Şeyxül-islamın da böyük şirkdə cəhaləti üzrlü saydığını iddia edirlər. Bununla da bir çox cahil insanları aldadaraq öz batil düşüncələrinin torlarına salmağı bacarırlar. Əslində onlar Şeyxin bu mövzudakı digər sözlərini göz ardı edirlər və sözlərin arasını cəm etməkdən, mütəşabih olanlarını möhkəm olanların işığında dəyərləndirməkdən qaçırlar. Halbuki məsələ bu şəkildə incələnərsə ortadakı anlaşılmazlıq və çaşqınlıq da aradan qalxar. Faydasını ümid edərəkdən Şeyxül-islam İbni Teymiyyənin yanlış anlaşılan sözlərindən bir ikisinin üzərində duraraq aydınlıq gətirməyə çalışacam. İzaha keçmədən öncə mühim bir məsələni vurğulamaq istəyirəm. İstər Şeyxül-islam İbni Teymiyyə rahiməhullah olsun, istər Şeyx Muhəmməd ibni Abdulvəhhab və ya qeyrisi olsun fərq etməz, əqidə və mənhəc bu şəxslərin zatından alınmaz, əksinə Quran, Sünnə və üzərində sələfin icma etdiyi məsələlərdən alınar. Hətta bu barədə Şeyxül-islamın özü bu cür demişdir: ***"Etiqad nə məndən, nə də məndən daha böyük birisindən götürülməz. Əksinə o, Allahdan, Rəsulundan və ümmətin sələfinin üzərində icma etdiyi şeylərdən götürülər" ("Məcmuu'l-Fətava, 3/161")*** Sanki bu sözü ilə Şeyxül-islam öz nəfsini ondan sadır olan xətalardan bəri tutmuşdur. Ona görə ki, mövzu əqidə mövzusudursa burada zata deyil, onun sözünün hüccətinə baxılar. Alimlər zatı ilə hüccət deyillər, onlar yalnız hüccəti anlamaq üçün bir vasitədirlər. Əgər isabət edərlərsə sözləri alınar, etməzlərsə sözləri atılar, necə ki, bu məlum bir məsələdir. Ola bilsin ki, həmin sözün sahibi daha sonra öz sözündən dönsün və fikrini dəyişsin və yaxud həmin sözünü başqa bir yerdə açıqlasın, bəyan etsin və ya müəyyən istilahlara sahib olsun ki, bunları yalnız şeyxin ümumi sözlərini birlikdə dəyərləndirən və şeyxin mənhəcini doğru şəkildə anlayan şəxslər dərk edə bilər. Yoxsa Şeyxin sözlərinə əhəmiyyət verməyən, yalnız qarşı tərəfi şübhəyə salmaq üçün maqqaşla sözləri seçib alan, ortalığa fitnə salmaq həvəsi ilə vurnuxan kimsələrin bu anlayışdan nəsib almaları imkansızdır. Buna görə İbni Teymiyyənin bu mövzudakı sözlərini cəm etmək, onların möhkəm olanlarını mütəşabih olanarından, müqayyəd olanlarını mütləq olanlarından ayırmaq gərəkir. Həmçinin şeyxin böyük şirkdə və küfrdə cəhalətin üzrlü olub-olmaması barəsində, habelə hüccətin iqamə edilməsi barasindəki təməl görüşünün nə olduğunu düzgün təyin etmək gərəkir. İbni Teymiyyənin yanlış anlaşılan və ya anlaşılması istənilən hər bir sözü ələ alıb incələrkən bunlara diqqət yetirilməsi gərəkir.
Onun bu mövzuda ən çox sitat gətirilən sözlərindən biri budur:

***“Şirkin bir çox növləri İslama (yeni) girən kimsələrə bəzən gizli qalar və onun şirk olduğunu bilməzlər. Belələri azmışlardır və etdiyi əməllər batildir. Lakin onlar hüccət çatdırılana kimi cəzalandırılmağı haqq etməzlər” (əl-İxnəiyyə, s.206)***

Həmçinin ölülərdən və şeyxlərdən yardım istəyən kimsələr barasəindəki suala cavabında demiş olduğu söz:

***“Əgər insanın üzərinə hüccət qaldırılar və o bu şirkə son verməzsə, digər müşriklər kimi öldürülməsi vacib olar. Və o müsəlmanların qəbristanlığında dəfn olunmaz, üzərinə (cənazə) namazı qılınmaz. Ancaq cahil olar, elm ona çatmaz və Nəbi (səllallahu aleyhi və səlləm)-in müşriklərlə savaşdığı şirkin həqiqətini bilməzsə, onun küfrünə hökm verilməz. Xüsusən də bu şirk İslama müntəsib olan kimsələr arasında yayılmışdır, kim onun itaət və Allaha yaxınlaşmaq cinsindən bir əməl olduğuna etiqad edərsə, o müsəlmanların ittifaqı ilə azmışlardır və onlar hüccət iqaməsindən sonra kafirdir.” (Camiu'-l-Məsail, 3/145-148)***

Bu iki nəqli doğru şəkildə anlamamız üçün öncə şeyxin şirk və küfrdə cəhalət mövzusundakı etiqadının nə olduğunu bilməmiz gərəkir. O demişdir:

***“Kim küfr olan bir şeyi deyər və ya işlərsə bununla kafir olar, hətta kafir olmağı qəsd etməsə də (kafir olar). Çünki Allahın diləməsi xaric kimsə kafir olmağı qəsd etməz” (Məcmuu'l-Fətava, 7/273”)***

Küfrü qəsd etmək cəhalətin ziddidir, ona görə ki, cahil kimsə bilmədiyi bir şeyi qəsd etməz. Həmçinin demişdir:

***“Buna görə də Allaha ibadət etməyən hər bir kimsənin mütləq Ondan başqasına ibadət edən birisi olması qaçınılmazdır. Ondan başqasına ibadət etməsi ilə də müşrik olur. Adəm övladları içərisində üçüncü bir qisim yoxdur. Əksinə ya müvahhiddir ya da müşrikdir. Yaxud da nəsranilər və bənzərilərdən olan zəlalət əhlindən dinlərini dəyişdirən, İslama nisbət olunanlar kimi” (Məcmuu'l-Fətava, 14/28”)***

***“Dini Allaha məxsus edərək ibadət etməyən hər bir kəsin Allahdan qeyrisinə ibadət edən birisi olması qaçınılmazdır. O, həqiqətdə şeytana ibadət edir. Adəm övladlarından hər biri ya Rəhmana ibadət edir, ya da şeytana ibadət edir.” (Məcmuu'l-Fətava, 14/284)***

Bu sözlər ilə İbni Teymiyyə Allaha şirk qoşan kimsənin müvahhid olmadığını açıqca ifadə edir. Çünki eyni zamanda həm müşrik, həm də müvahhid olan birisini təsəvvür etmək mümkün deyil. Müşrik olan və ya müvahhid olmayan kimsəyə isə müsəlman deyilməz, hətta İslama nisbət olunsa belə.

Həmçinin sufilərin şeyxləri, dəvətçiləri və onların cahilləri barəsində bu cür demişdir:

***“Dedilər ki: 'Biz insanları tövbə etdiririk' dedim ki: 'onları nədən tövbə etdrirsiniz?' dedilər ki: 'yolları kəsib (insanların mallarını) oğurlamalarından və bu kimi şeylərdən (tövbə etdiririk)' dedim ki: onların tövbələrindən öncəki halları indiki hallarından daha xeyirlidir. Çünki onlar (əvvəl) üzərində olduqları halın haram olduğunu bilən fasiqlər idilər, siz isə onları öz tövbə etdirməyinizlə (yəni üsulunuzla) İslam şəriətindən çıxmış, zəlalətdə olan müşriklər etdiniz” (Məcmuu-l-Fətava, 11/472)***

Həmçinin İslama nisbət olunanlardan öz şeyxləri ilə istiğasə edənlərə şeytanın şeyxlərin sürətində gəlməsindən bəhs edərkən onları müşrik adlandırmışdır:

***“İslama nisbət olunanların çoxu öz şeyxi ilə istiğasə edir və onu minikli halda, havada uçarkən və ya başqa şəkildə görür və zənn edir ki, o şeyxidir. Bəzən də şeyxin öz sürətində gəlir, əgər şeyxinin sürətini tanıyırsa, onu da şeyxi zənn edir. Bu çox insanın başına gəlir, mənim əshabımdan bir neçə nəfərin də başına gəlmişdir. Lakin onlar məni gördüklərini anlatdıqları zaman, onun mən olmadığını açıqladım. Bu, ancaq şeytan idi, sizi azdırmaq üçün mənim sürətimdə gəlmşdir. Məndən soruşdular ki, "nə üçün o mələk olmasın?" Dedim ki: "çünki mələk müşrikin (çağırışna) cavab verməz və sən mənimlə istiğasə edərək şirk qoşmusan."” (Qai'datu a'zima, s.154)***

Həmçinin bu barədə ***(Məcmuu'l-Fətava, 19/47; 10/593)*-də** eyni sözləri demişdir. Yenə bu cür demişdir:

***“Kim olursa olsun hər hansı bir məxluqdan bunları istəyən kimsə mələklərə, peyğəmbərlərə və onların sürətləri üzərinə təsvir edilmiş heykəllərə ibadət edən müşriklərin və Məsihə, onun anasına dua edən nəsranilərin cinsindən Rəbbinə ortaq qoşan bir müşrik olar.” (Məcmuu'l-Fətava, 27/67)***

Bu sözlər şirk qoşan kimsənin hər bir halda, hətda cahil olsa belə müşrik olacağına dair açıq ifadələrdir. Bəs yuxarıda qeyd etdiyimiz, şübhə məsafəsində irəli sürülən nəqllərdəki sözləri necə anlamalıyıq? Burada sanki şeyxin sözlərində ziddiyət görsənir, onların hüccətdən sonra kafir olacağını vurğulayır. Bu qarışıqlıq şeyxin müşrik-kafir isimlərini və hökmlərini hüccət iqaməsindən öncəsinə və sonrasına görə ayırdığını bildiyimiz zaman ortadan qaxacaqdır. Belə ki, bu ayırım Şeyxül-islamın möhkəm və açıq sözlərində ifadə edilmişdir. Əksinə, onun heç bir yerdə “şirk qoşan kimsə əgər cahildirsə o hüccətdən öncə kafir olmaz, lakin müsəlman adlanar” deyə açıq bir sözü keçmir. İndi isə şeyxin bu barədəki sözlərini qeyd edək:

***"Allah isimlərdə və əhkamlarda (bəzilərinin) risalətdən öncə və sonra arasını ayırmış və bəzilərinin isə arasını cəm etmişdir." (Məcmuu'l-Fətava, 20/37)***

Və davamında bu cür demişdir:

***"Şirk (və müşrik) ismi risalətdən öncə sabitdir. Çünki o Rəbbinə şirk qoşur və Ona (başqasını) tay tutur, Onunla bərabər başqa ilahlar götürür və rəsuldan öncə Ona ortaqlar qoşur " (Məcmuu'l-fətava, 20/38)***

Küfr hökmünü isə risalətdən yəni hüccətdən sonrası üçün aid edir:

***"Əzabı gərəkdirən küfr yalnız risalətin çatmasından sonra olur" (Məcmuu'l-fətava, 2/78)***

***"Alimlər İslama yeni girmiş kimsələrdən və ya uzaq bölgələrdə yaşan kimsələrdən haramlardan bir şeyi halal sayan kimsəni təkfir etmirlər. Çünki küfr hökmü yalnız risalətin çatmasından sonra olur" (Məcmuu'l-fətava, 28/501)***

***"Bu işlər hansı ki, islam dinini bilən kimsə onların bütün rəsulların dininə müxalif olduğunda şəkk etməz. Bunlar Allahın və rəsulunun haram etdiyi şirkdəndir, hətta Rəsulullah səllallahu aleyhi və səlləmin müşriklərlə savaşdığı şirkdəndir. Bunun sahibləri əgər onlara hüccət çatmayıbsa rəsulun göndərilmədiyi kimsələr kimi cəhalətləri ilə üzrlü olarlar. Necə ki, Allahu təala demişdir: "Rəsul göndərmədikcə əzab edən deyilik!" (İsra,15). Əgər deyillərsə, müşriklərdən bənzəriləri kimi dünya və axirətdə əzabı haqq edərlər. Allahu təala demişdir: "Bilərək Allaha ortaqlar qoşmayın!" (əl-Bəqərə,22) və hədisdə bu cür deyilmişdir: "Şirk bu ümmətdə qarışqanın ayaq səslərindən də gizlidir" Rəsula iman edən kimsələrdən birinə rəsulun gətirdiyinin həqiqəti aydın olarsa və onun müşrik olduğu aydın olarsa, o, Allaha tövbə edər və İslamını təzələyər. İçərisində bu şirkdən tövbə etdiyi bir İslam ilə müsəlman olar" (əl-Qai'datu A'zima,70)***

Bu sözlərdən açıq bir şəkildə bəlli olur ki, Şeyx küfr hökmü ilə əzabı gərəkdirən, yəni dünyada öldürülməyi və axirətdə əzaba düçar olmağı risalət hüccətinin çatmasına bağlayır. Risalətdən, yəni hüccətdən öncəsi halı üçün bu hökmü inkar edir və cəhalətin üzrlü sayılacağı hal buna aiddir. Lakin şirk haqqında bu cür demir, əksinə hüccətdən öncəsi üçün də onun ismini və hökmünü sabit edir. Müşrik ismi ilə adlandırmasında cəhaləti üzrlü saymır.

Burada şeyxin küfr ismini hüccətdən öncə inkar etməsi heç də şirk ismini də inkar etdiyi mənasına gəlmir. Çünki o demişdir: ***"Bir isim ona bağlı olan əhkamlara görə inkar edilər və isbat edilər. Bir hökmdə o isbat edilsə və ya inkar edilsə bu onun İslamın digər hökmlərində də bu cür olmasını gərəkdirməz" (Məcmuu-l-Fətava, 7/164)*** - Yəni risalətdən öncəsi üçün kafir isminin inkarı eyni zamanda müşrik isminin inkarını da gərəkdirməz. Müşrik isə heç vaxt müsəlman adlandırıla bilməz.

***(əl-İxnəiyyə, s.206)***-dakı sözünə gəlincə, Şeyx bu sözün öncəsində bu cür demişdir:

***"Eləcə də kim Allahdan qeyrisinə dua edərsə və Allahdan başqasına həcc edərsə o da həmçinin <u>əməli küfr olan müşrikdir</u>. Lakin bəzən bu əməlin haram edilmiş şirk olduğunu bilməz. Necə ki, Tatarlardan və onlardan başqa İslam dininə girən insanların çoxunun yanlarında yundan və başqa şeylərdən düzəldilmiş kiçik <u>bütləri</u> var. Onlara (ibadətlərlə) yaxınlaşırlar və təzim edirlər və bunun İslam dinində haram edilmiş olduğunu bilmirlər. Həmçinin atəşə (ibadətlərlə) yaxınlaşırlar və bunun haram edilmiş olduğunu bilmirlər"*** sonra isə ardınca yuxarıda qeyd etdiyimiz sözü zikr edir: ***"Şirkin bir çox növləri <u>İslama (yeni) girən kimsələrə</u> bəzən gizli qalar və onun şirk olduğunu bilməzlər. Beləlləri <u>azmışlardır</u> və etdiyi əməllər batildir. Lakin ona <u>hüccət çatdırılana kimi cəzalandırılmağı haqq etməzlər</u>" (əl-İxnəiyyə, s.206)***

Əgər diqqət edərsəniz Şeyx İbni Teymiyyə ilk başda bu əməlin küfr olduğunu və onu işləyənin də müşrik olduğunu qeyd edir: (***<u>əməli küfr olan müşrikdir</u>***) Sonra isə onlardan bəzilərinə bu əməllərin şirk olduğunun gizli qala biləcəyini və belələrinin azmış kimsələr, yəni zəlalət əhli olduğunu bildirir. Lakin onların kafir olduqlarını demir, eyni zamanda müsəlman olduqlarını da demir. Sadəcə onlara hüccət çatdırılana kimi əzablandırılmağı haqq etməyəcəklərini bildirdi. Bəzi cahillər zənn etdi ki, şeyx burada (***<u>azmışlardır</u>***) sözü ilə onlara müsəlman hökmünü verdi. Bu doğru deyil, çünki sözün siyaqı göstərir ki, şeyx onlara müşrik hökmünü verdi və sonrasında onları bundan istisna tutmadı. Yalnız cəzalandırılmağı onlardan istisna tutdu ki, daha öncə onun sözü ilə keçdiyi kimi cəzalandırma risalətdən sonrakı hal üçündür. Zəlalət (yəni azğınlıq) isminə gəlincə isə bu həm cahil kimsələrə həm də bilərkdən şirk qoşan kimsələrə şamil edilir. Necəki demişdir: ***"Zəlalət ləfzi işlədildiyi zaman doğru yoldan azmış hər kəsi içərisinə daxil edər, istər o bilərəkdən azsın istərsə də cahi olaraq..." (Məcmuu'l-Fətava, 7/166)***

Burada diqqət edilərsə şeyx (***<u>İslama (yeni) girən kimsələr</u>***)-dən bəhs edir və onların yanında bütlərinin olduğunu qeyd edir. Necə ola bilər ki, bir insan həm islama girsin həm də öz bütünə ibadət etməyə davam etsin? Təbii ki şeyx burada (***<u>İslama (yeni) girən kimsələr</u>***)-dən qəsdi zahiri olaraq İslamına hökm edilmiş kimsələri qəsd edir. Bir insanın zahirən islamına hökm verilər, lakin sonradan onun iman etmədiyi ortaya çıxarsa artıq onun islamı batil olar. Ayrıca bir insanın həm müsəlman olması həm də bütlərə, atəşə ibadət etməsi düşünülə bilməz. Lata və Uzzaya ibadət edənin və ya bir

# 6-cı FƏSL :

## Şeyx Muhəmməd ibni Abdulvəhhabın tələbələrinin sözlərindən açıqlayıcı nəqllər :

İlk öncə şeyxlə bir başa əlaqəsi olan və ona bağlı qalanların[107] sözlərindən

(burada 11 nəql və rəvayət var)[108]

---

məcusinin islama girdikdən sonra hələ də Lat və Uzzaya, atəşə ibadət etməyə davam etməsi mümkündürmü? Əlbətdə ki, mümkün deyil, ona görə ki, bu ikisi zidd şeylərdir və zidd şeylər bir yerdə cəmləşə bilməzlər. Allahdan qeyrisinə ibadət edən kimsə eyni anda müsəlman ola bilməz. Necə ki, şeyxin sözü bunu doğrulayır: ***"Kim Allah ilə yanaşı başqasına ibadət edərsə müsəlman olmaz" (Kitabun-Nübuvvə, s.127)***

***(Camiu'l-Məsail, 3/145-148)***-dakı sözünə gəlincə isə Şeyxül-islam İbni Teymiyyə həmin sözlərdən öncə Rəsulullah səllallahu aleyhi və səlləmin savaşdığı və öldürdüyü, mallarını və qanlarını halal saydığı müşriklərin əməlləri Allahdan qeyrisinə ibadət etmələri, vasitələr və şəfaətçilər təyin etmələri olduğunu qeyd edir. Daha sonra isə bu cür deyir:
***"Kim bu yolu izlərsə, içində olduğu şirkə görə müşrik olar. Əgər insanın üzərinə hüccət qaldırılar və o bu şirkə son verməzsə, digər müşriklər kimi öldürülməsi vacib olar və o müsəlmanların qəbristanlığında dəfn olunmaz, üzərinə (cənazə) namazı qılınmaz. Ancaq cahil olar, elm ona çatmaz və Nəbi (səllallahu aleyhi və səlləm)-in müşriklərlə savaşdığı şirkin həqiqətini bilməzsə, onun küfrünə hökm verilməz."*** – diqqət edilərsə müşrik ismini hüccətdən öncəsinə, mücərrəd olaraq şirkin varlığına bağladı. Öldürülmə və buna bağlı olan hökmləri isə hüccətin çatmasına bağladı. Çünki şeyxin daha öncə qeyd etdiyimiz sözlərində dediyi kimi küfr, əzab və ya cəzalandırma hökmü -ki, öldürmə dünyada cəza və ya əzab hökmünün tətbiqidir- risalət hüccətindən sonraya aid edilir. Şeyx burada həmin kimsənin cahil olması halında müsəlman olacağını açıq şəkildə bildirməmişdir və müşrik ismini istisna etməmişdir. İstisna sadəcə küfr hökmünün və öldürülmənin tətbiq edilməsindədir.

Sözün davamında bu cür demişdir:
***"Xüsusən də bu şirk İslama müntəsib olan kimsələr arasında yayılmışdır, kim onun itaət və Allaha yaxınlaşmaq cinsindən bir əməl olduğuna etiqad edərsə, o müsəlmanların ittifaqı ilə azmışdır və o hüccət iqaməsindən sonra kafirdir." (Camiu'l-Məsail, 3/145-148)***

Şeyxin burada və ya digər sözlərində onlar barəsində "cahil müsəlmanlar" deyil ***"İslama müntəsib olan kimsələr"*** deməsi üzərində düşün! Şeyx bununla İslama nisbət olunan, İslamın şüarlarını yerinə yetirən müşrikləri nəzərdə tutur, bununla da onları, məcusi və nəsranilər kimi əsli kafirlərdən fərqləndirməyə çalışır. Çünki əsli kafirlər İslama nisbət olunmurlar, onun şüarlarını yerinə yetirmirlər. Şeyxin onları bu cür adlandırması isə İslamlarına etibar etmədiyini göstərir, ona görə ki, bu ifadə müsəlman hökmü verilən kimsələr haqqında işlədilməz.

Beləliklə də Şeyxul İslam İbni Teymiyyənin sözlərindən onun qəsdi bizlərə aydın olur və onun bu qəbildən olan bütün sözləri məlum olan qayda işığında dəyərləndirilməlidir: "müşrik ilə kafir isimlərini, eləcə də öldürmə və əzab hökmlərini hüccətdən öncəsinə və sonrasına görə ayırmaq." Eləcə də aydın olur ki, Şeyx Muhəmməd ibni Abdulvəhhab bu qaydanı heç də özündən ortaya qoymadı, bu onun Şeyxül-islam İbni Teymiyyədən öyrənmiş olduğu bir metoddur. Bunu həmin alimlərin bütün sözlərini cəm etdiyimiz zaman aydın şəkildə görə bilərik. Qəlblərində xəstəlik olanların həmin şeyxlərin bir-iki mütəşabih və ya mücməl sözlərinə yapışıb, möhkəm sözlərini gözardı etmələri heç də tövhid əhli qardaşlarımızın fikirlərini qarışdırmasın! Bu kimsələrin dərdi haqqı araşdırmaq və ona tabe olmaq deyil, onların məqsədi insanları dinlərində fitnəyə düşürməkdir. **Şeyx İshaq ibni Abdurrahman** *"Təkfirul Muəyyən"* kitabının 19-cu səhifəsində bu cür insanların halına təccüblənərək demişdir: **"*Aman Allah! Necə də qəribədir! Şeyxin Quran və Sünnədən olan dəlillər ilə yanaşı bütün mövzularda demiş olduğu sözlərini və "kimə Quran çatmışsa ona artıq hüccət çatmışdır" - sözündə olduğu kimi İbni Teymiyyənin, İbnul Qayyimin sözlərini tərk edirlər və (şeyxin) bir yerdə dediyi sözü alıb ümumiləşdirirlər ..."*** – Uca Allah bizləri haqqı haqq olaraq göstərib ona tabe olmaqla ruziləndirsin, batili batil olaraq göstərib ondan çəkinməklə ruziləndirsin! *(T.e)*

[107] Yəni şeyxlə görüşüb bir başa ondan elm alan və şeyxin mənhəcinə bağlı qalan tələbələr *(T.e)*

**- 1)** Şeyx Muhəmməd ibni Abdulvəhhabın övladları və **Hamd ibni Nasir**[109]-dən *"Durərus Səniyyə, 10/136-138"* –də soruşurlar ki, "Allaha və Rəsuluna iman edən birisi cahil olaraq küfr sözünü dediyində və ya onu işlədiyində risalət hüccəti iqamə edilincəyə kimi onu təkfir etmirsiniz. Bəs, əgər o bu dəvətin ortaya çıxmasından öncə bu halda ölərsə necə?  O zaman da onun halı bu cürdür yoxsa deyil?" Onlar isə bu cür deyərək cavab vermişlər :

***"Cəhalətindən və onu xəbərdar edən kimsənin olmamasından dolayı küfr və şirk işləyən kimsəyə hüccət iqamə edilincəyə qədər onun küfrünə hökm verməri̇k. Lakin onun müsəlman olmasına da hökm verməri̇k.***[110] ***Əksinə, onun bu əməlinin küfr olduğunu, malını və qanını mübah etdiyini deyirik. Əgər biz ona hüccətin iqamə edilməməsinə görə həmin şəxs haqqında hökm vermiriksə***[111] ***burada deyilməz ki, əgər o kafir deyilsə o zaman müsəlmandır. Əksinə deyirik ki, onun əməli kafirlərin əməlidir və bu şəxsə müəyyən olaraq hökmün aid edilməsi risalət hüccətinin çatmasına dayanır. Elm əhli qeyd etmişlər ki, fətrət əhli qiyamət günü Arasatda imtahan olunacaqlar və onlar haqqında nə kafirlərin hökmünü nə də əbrarların (yaxşıların) hökmünü təyin etməmişlər" (əd-Durərus-Səniyyə, 10/137)***

**- 2)** Muhəmməd ibni Abdulvəhhabın övladları **Şeyx Hüseyn**[112] və **Abdullah**[113] *"əd-Durərus-Səniyyə, 10/142"* –də "bu dəvətdən öncə ölən, İslamı və bu gün insanların

---

[108] Şeyx burada 11 nəql və rəvayətin olduğunu qeyd etsə də, bu fəsldə 10 nəqli qeyd etmişdir. Digər nəqli ya Şeyx unutmuşdur yaxud da risalənin nüsxəsində əksikdir. *(T.e)*

[109] O, **Şeyx Hamd ibni Nasir ibni Osman ibni Muammər ət-Təmimi ən-Nəcdi əl-Hənbəlidir** Uyeynədə anadan olmuşdur, daha sonra isə Diri'yyəyə köçüb. **Şeyx Muhəmməd ibni Abdulvəhhabın** dizinin dibində elm aldı, həmçinin Diriyyədə məskunlaşan və *"Tarixun-Nəcd"*-in sahibi **Şeyx Əbu Bəkr Hüseyn ibni Ğannamdan** və Şeyx Muhəmməd ibni Abdulvəhabın qardaşı **Şeyx Süleyman ibni Abdulvəhhabdan** dərs aldı. Bunlardan əlavə Diriyyə şəhərində tədris fəaliyyətinə başlamış və bir çox insan ondan elm almışdı.

Bəzi kitablar və risalələr yazmışdır. Bunlardan

- *"əl-Fəvakih əl-əzab fi raddi mən ləm yəhkum əs-sunnətə vəl kitab"*
- *"ət-Tuhfətul-Mədniyyə fi aqidətis sələfiyyə"*
- Həmçinin bir çox fiqhi və əqidəvi mövzularda risalələrə sahibdir. Həmin risalələr *"Məcmua'tur-Rəsail vəl Məsail ən-Nəcdiyyə"*, 2-ci cilddə *"Rəsail və Fətava əş-Şeyx Hamd ibni Nasir ibni Osman ibni Muammər"* başlığı altında toplanmışdır. Həmçinin *"əd-Durərus Səniyyə"*-də də şeyxin fətvaları yer alır.

Hicri 1211-ci ildə Məkkənin hakimi **İmam Abdulaziz ibni Muhəmməd ibni Səuddan** dini bir məsələdə Haram bölgəsinin alimləri ilə münazərə etməsi üçün bir alim göndərməsini istədi. İbni Səud da Hamd ibni Nasiri alimlərdən ibarət bir heyətin başında Məkkəyə göndərir. Şeyx Hamd ibni Nasir də onlarla münazərə da qalib gəlir. Daha sonra h.1220-ci ildə İmam Abdulaziz Hicaz bölgəsini də Nəcd dövlətinin tərkibinə qatdığı zaman Şeyx Hamd ibni Nasiri Məkkəyə qazilərin üzərində hakim olması üçün göndərir və ömrünün sonuna qədər orada qalır. Şeyx Məkkədə təxminən dörd il qaldıqdan sonra h.1255-ci ildə ( m. 1839) orada vəfat edir. *(T.e)*

[110] Diqqət et! Burada onun İslamına hökm vermir və onu müsəlman da adlandırmır

[111] Yəni küfr ismini və öldürmək, savaşmaq və əzab etmək kimi küfr əhkamlarını ona aid etmiriksə... Ancaq şirk ismi və bağışlanma dilənməməsi kimi ona bağlı olan məsələlərin isbatına gəlincə bu onlardan nəfy edilməz.

[112] Şeyx Abdurrahman ibni Abdullatif aluş-şeyx *"Məşəhiru uləməi nəcd"* adlı əsərində s.43-də onun haqqında qısa məlumat vermişdir:

etdiklərini idrak etməyən və hüccətin iqamə olunmadığı kimsələr haqqındakı hökm nədir?” sualının cavabında demişlər :

***“Şirk əhlindən olub bu dəvətin çatmasından öncə ölən kimsə, hansı ki, o əgər bu şirki işləməklə və onu özünə din edib, bunun üzərinə ölməsi ilə bilinən kimsədirsə,***

---

*“**Şeyx Hüseyn ibni Muhəmməd ibni Abdulvəhhab** Diri'yyədə anadan olmuş və orada böyümüşdür. Elmini atasından almışdır və İmam Abdulaziz ibni Muhəmməd ibni Səudun zamanında Diri'yyədə qazilik etmişdir. Cümə namazlarını Diri'yyənin böyük camisində, beş vaxt fərz namazlarını isə Buceyri məscidində qıldırardı.*

*Bir çox insan ondan dərs aldı, onlar arasında övladları Şeyx Ali ibni Hüseyn və Şeyx Abdurrahman ibni Hüseyn, həmçinin Şeyx Əhməd Vuheybi və Şeyx Səid ibni Hucə və digərləri ondan elm almşdır.*

*Şeyx h.1224-cü ildə Diri'yyədə vəba xəstəliyindən vəfat edir və geriyə beş övlad buraxır. Onlar: Şeyx Ali ibni Şeyx Hüseyn, Şeyx Abdurrahman ibni Şeyx Hüseyn, Şeyx Həmd ibni Şeyx Hüseyn, Şeyx Abdulməlik ibni Şeyx Hüseyn və Şeyx Həsən ibni Şeyx Hüseyndir. Bu gün Şeyxin nəvələri babaları Hüseynə nisbət olunaraq Ali Hüseyn olaraq tanınırlar*.”

Nəcd ulemasının fətva və əsərlərinin toplandığı kitablarda şeyxin fətvaları da yer alır. *(T.e)*

[113] **Şeyx Abdullah ibni Muhəmməd ibni Abdulvəhhab** hicri 1165-ci ildə (m. 1751) Diri'yyədə anadan olmuşdur. Şeyx Abdurrahman ibni Abdullatif aluş-şeyx *“Məşəhiru uləmai nəcd”* adlı əsərində s.48-də onun haqqında bu cür demişdir:

*“O, bəzənrsiz bir əllamə imamdır, tam güvənilən, təqva sahibi, əcrini Allahdan gözləyən mücahid, böyük əzmə və son dərəcədə cəsarətə sahib birisi idi. Hansı ki, o atası Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhabdan sonra İmam Abdulaziz ibni Muhəmməd ibni Səuda dəstək olmaqda atasının yolunu davam etdirmişdir. Həmçinin elmə və tövhid dəvətinin yayılmasına təşviqdə, tövhid dəvətini qələm, dil və hüccət-bəyanla müdafiə etməkdə atasının yolunu davam etdirdi. O, atasından sonra Nəcdin alimi və müftüsü idi, bir çox sağlam fətva və cavablara, möhtəşəm rəddiyələrə sahib birisidir. O, Nəcdin başqa bölgələrindən yanına səfərlərin edildiyi və Nəcdin bütün kəndlərindən və şəhərlərindən ardıcıl olaraq sualların yönəltildiyi Şeyx Abdullah ibni Şeyx Muhəmməd ibni Abdulvəhhabdır. Bu böyük alim hicri 1165-ci ildə Diri'yyədə anadan oldu və orada atasının himayəsində saleh din üzərinə böyüdü. Quranı əzbərləyənə kimi oxudu, sonra atası Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhabdan dərs almağa başladı. Belə ki, onu islam məzhəblərində fəqih etdi, üsul və furu elmlərində mahirləşdi. Bununla yanaşı o təfsir elmində, əqidə və usuluddində də önə çıxmış alim idi, hədis, fiqh, fiqh üsulu, nəhv və lüğət elmini bilirdi.”*

Şeyx Abdullahdan bir çox alimlər elm almışdır: onlardan üçü elə şeyxin öz övladları idi, Şeyx Süleyman, Şeyx Abdurrahman və Şeyx Ali. Həmçinin şeyxin qardaşı oğlu Şeyx Abdurrahman ibni Həsən, şeyxin digər qardaşı Hüseynin oğlu Şeyx Ali ondan dərs almışdır. Bunlardan əlavə Şeyx Muhəmməd ibni Sultan, Şeyx Osman ibni Abdulcabbar ibni Şəbənə, Qazi Abdulaziz ibni Həmd ibni İbrahim ət-Təmimi, Əhsanın hakimi Şeyx Əhməd əl-Vuheybi, *“Minhətul-qaribil mucib fir-raddi alə ibadis-salib”*-in sahibi Şeyx Abdulaziz ibni Həmd ibni Nasir ibni Osman ibni Muammər, Şeyx Abdulah ibni Əhməd ibni Abdulqadir əl-Əhsai və digər şeyxlər odan dərs almışlar.

Şeyx Abdullah bir çox kitablar və risalələr yazıb. Bunlardan,

- *“Cavabu əhlis-sünnəti ən-nəbəviyyə fi naqdi kələmiş-şiiati vəz-zəydiyyə”* - burada şeyx sələfi tövhid dəvətinə qarşı çıxan bəzi Zeydiyyə məzhəbinin alimlərinə cavab verib.
- *“əl-Kəlimətun-nəfia'tu fil-mukəffirati vəl vaqia'ti”* - burada insanlar tərəfindən işlənən küfr və onun sahibinin hökmüə dair elm əhlindən sözlər nəql edib.
- Bunlarla yanaşı şeyxin bir çox fətvaları *“Məcmua'tur-Rəsail vəl Məsəil ən-Nəcdiyyə”* və *“Durərus-Səniyyə”*-də keçməkdədir.

Muhəddis alim **Muhəmməd Abid əs-Sindi** *“Hasruş-şəərid min əsəənid Muhəmməd Abid”* adlı kitabında ondan rəvayət etmişdir.

Şeyxin üç oğlu var idi: Şeyx Süleyman, Şeyx Abdurrahman və Şeyx Ali

Şeyx alim olması ilə yanaşı eyni zamanda öyrəndiyi elmi ilə yaşayan və öyrəndiklərini həyatda tətbiq edən, cəsur və igid mücahid idi. İbrahim Paşanın başçılığında Misir ordusu Diri'yyəyə daxil olduğu zaman Şeyx oranın əl-Buceyri adı ilə tanınan qapısında duraraq öz şücaəti və qəhrəmancasına direniş göstərməsi ilə məşhur olmuşdu. Beləki, şeyx düşmənlə savaşdığı zaman demiş olduğu söz çox məşhurdur: ***“İzzət üzərinə olan yerin altı, zillət üzərinə olan üstündən daha xeyirlidir”***

İbrahim Paşa Diri'yyəni işğal etdikdən sonra h.1242-ci ildə Şeyx Abdullahı və oğlu Abdurrahmanı əsir alaraq Misirə aparır və şeyx həmin il orada vəfat edir. Şeyxin digər oğlu Süleyman ibni Abdullah isə İbrahim Paşa ilə döyüşdə şəhid olur. *(T.e)*

***bu kimsənin zahiri küfr üzərinə ölməsidir[114]. Onun üçün dua edilməz, adına qurban kəsilməz və sədəqə verilməz. Onun işinin həqiqəti[115] isə Allahu Təalaya aiddir. Əgər həyatda ikən onun üzərinə hüccət iqamə edilibsə və o buna inad edibsə bu kimsə zahirdə də batində də kafirdir. Əgər ona hüccət iqamə edilməyibsə onun işi Allahu Təalaya aiddir.”***

(Burada onların zahirdə küfr üzərinə ölmələrinə hökm vermişlər)

**- 3)** Dir'iyyənin qazisi, **Şeyx Abdulaziz**[116] *“ər-Rəsail vəl məsəil Nəcdiyyə, 5/576”*-də “Allaha və Rəsuluna iman edən birisi cahil olaraqdan küfr bir sözü söylər və ya küfr bir fe'li işləyərsə ona hüccət iqamə etmədən təkfir etmirsiniz” - ilə bağlı soruşulan suala cavabında demişdir:

***“Əgər cəhaləti səbəbi ilə və ona bildirən bir kimsənin olmamasından dolayı küfr və şirk işlərsə, ona hüccət iqamə edilincəyə qədər küfrünə hökm verməri̇k. Lakin onun müsəlman olmasına da hökm verməri̇k.[117] Əksinə onun bu əməli malı və qanı mübah edən küfr olduğunu deyirik. Əgər biz bu şəxsə hüccətin iqamə edilməməsinə görə onun üzərinə (küfr) hökmünü verməzsək, burada deyilməz ki, əgər o kafir deyilsə, o zaman müsəlmandır. Əksinə, onun əməlinin kafirlərin əməli olduğunu deyirik. Bu şəxsin üzərinə müəyyən olaraq hökmü[118] aid etmək, ona risalət hüccətinin çatmasının üzərində dayanır. Elm əhli fətrət sahiblərinin qiyamət günü Arasatda imtahan olunacaqlarını qeyd etmişlər və onlar haqqında nə kafirlərin, nə də əbrarların (müsəlmanların) hökmünü verməmişlər.”***

---

[114] Öncə onu müşrik adlandırmasına diqqət et! Çünki o şirki işləyir və onu özünə din edir. *“Onun zahiri küfr üzərinə ölməsidir”* sözündəki küfr şirkdir. Buna görə də daha sonra *“Onun adına qurban kəsilməz”* demişdir, bu isə müşriklərin əhkamıdır. ***“yaxın qohumları olsa belə peyğəmbərə və möminlərə müşriklər üçün bağışlanma diləmək yaraşmaz”***(Tövbə, 113)

[115] Onları müsəlman adlandırmadığına diqqət et!

[116] O, Şeyx Muhhəmməd ibni Abdulvəhhabın nəvəsidir və qızlarından birinin oğludur. **Şeyx Abdurrahman ibni Abdullatif aluş-şeyx** *“Məşəhiru uləməi nəcd”* adlı əsərində s.209-212-də onun haqqında bəhs etmişdir. Adı **Abdulaziz ibni Şeyx Həmd ibni İbrahim ibni Həmd Vəhbi ət-Təmimidir**, “qazi” ləqəbi ilə tanınır. Atası Şeyx Həmd ibni İbrahim ibni Həmd bölgədə dəfələrlə qazilik fəaliyyəti ilə məşğul olmuşdur. Sonra isə olduğu yeri tərk edrək Şeyx Muhəmməd ibni Abdulvəhhabın yanına Diriyyə şəhərinə gələrək, şeyxin qızı (yəni Abdulazizin anası) ilə evlənir və orada şeyxin yanında məskunlaşır, ondan elm alır.

Şeyx Abdulaziz ibni Həmd təxminən h. 1190-cı ildə anadan olub. Şeyx Abdullah ibni Ali ibni Ğarib, Şeyx Abdullah ibni Muhəmməd ibni Abdulvəhhab və Diriyyənin bir çox alimlərindən dərs alıb. İmam Səudun və oğlu İmam Abdullah ibni Səudun zamanında qazi olaraq çalışdı. İmam Səud onu İmam Səna'inin yanına səfərə göndərmişdi.

Diriyyənin işğalından və xərabəyə çevirilməsindən sonra Şeyx Abdulaziz ibni Həmd U'neyzə şəhərinə köçdü və orada qazilik fəaliyyətinə davam etdi. Daha sonra isə İraqaın Suquş-Şuyux şəhərinə yönəldi və ömrünün sonuna kimi orada qazi olaraq çalışdı. H.1240-cı ildən sonra orada vəfat etmişdir. *(T.e)*

[117] Diqqət et! Onu müsəlman adlandırmadı, üstəlik mömin və müvahhid də adlandırmadı. Bir kimsədən küfrün nəfy edilməsi, onun müsəlman olduğunu isbatlamağı gərəkdirməz. Bu, onların (yəni nəcdlilərin) bütün sözlərində bu cürdür.

[118] Yəni küfr və ona bağlı olan əzab hökmünü. *(T.e)*

- **4) Abdullah ibni Muhammәd ibni Abdulvahhaba** gәldikdә isә onun bu mövzuda ayrıca kitabı var: *"әl-Kәlimәtun Nafia'tu fil mukәffaratil vaqia'ti"* hәmin kitab *"әd-Durәrus-Sәniyyә, 10/149"*- dә müsәlmanın küfrә girib dindәn çıxması ilә bağlı dörd mәzhәbin sahiblәri müctәhid alimlәrin sözlәrini qeyd etdiyi yerdәdir. Belәki, hәmin alimlәr mürtәdin hökmü haqqındakı babda sözlәrinә ilk olaraq böyük şirk vә onun әhlinin tәkfiri vә onların cәhalәtlәrinin üzrlü olmaması ilә başlamışlar.

Orada Şafiilәrin sözlәrini qeyd etmişdir vә onlardan **İbni Hacәr әl-Heytәminin** *"әz-Zәvacir a'n iqtirafil-kәbәir"* adlı kitabındakı ilk böyük günah (böyük şirk) haqqındakı sözlәrini qeyd etmişdir. Böyük şirki açıqlarkәn cәhalәtin üzrlü olmadığını ifadә etmişdir vә insanlar arasında çox yayğınlaşmasından dolayı vә şirk olduğunu bilmәdәn (yәni cahil olaraqdan) çoxlarının dillәrindә olan şirkin növlәrini ümumәn zikr etmişdir.

**Nәvәvinin** Müslimin şәrhindәki ***"Tәzim edәrәkdәn Allahdan başqasına qurban kәsmәk şirkdir vә bunu edәn kimsә qurban kәsmәyi ilә mürtәd olmuşdur."*** - sözünü nәql etmişdir.

(Bu söz müәyyәndir,[119] çünki, qurban kәsmәyә olan qadağa onunla bağlı müәyyәn kimsә üçündür.)

Sonra **Әbu Şamәnin** *"әl-Bai's"*-dәki sözünü nәql etmişdir.

Vә *"Tәbәyyunil-mәharim"* adlı kitabın sahibinin küfr babındakı sözlәrini nәql etmişdir vә orada böyük şirkin bәzi növlәrini qeyd etmişdir. Bunlardan; kim Allahdan başqasına sәcdә edәrsә vә ya ibadәtindә yaratdıqlarından hәr hansı birisini Ona ortaq qoşarsa, hәmin kimsәnin icma ilә kafir olduğunu, әgәr bunun üzәrindә israr edilәrsә öldürülәcәyini qeyd etmişdir.

Sonra **Şeyx Qasimin** *"Şәrhud-Durәr"*-dәki Allahdan qeyrisinә dua edәn vә ya nәzir verәn kimsәnin kafir olması haqqındakı sözünü nәql etmişdir.

Malikilәrin sözlәrindәn isә **Әbu Bәkr әt-Tartuşinin** sözlәrini qeyd etdi. Onun zamanında ağaclara vә bәnzәri şeylәrә yönәlmәnin müşriklәrin fe'llәri kimi olmasını açıqladı.

Daha sonra isә Hәnbәlilәrin sözünü qeyd etdi vә **İbni Aqilin** qәbrlәri tәzim edәn vә ehtiyaclarından ötrü ölülәrә xitab edәnlәrin tәkfiri haqqında onların bununla kafir olduqları sözünü nәql etdi.

Sonra **İbni Teymiyyә**, **İbnul Qayyim** vә atasının sözlәrini zikr etdi vә burada Allaha şirk qoşan kimsәnin tәkfiri vә cәhalәtinin üzrlü olmaması ilә bağlı sözlәri uzunca qeyd etdi. (İxtisarla)[120] [121]

- **5)** Hәmçinin *"әr-Rәsail vәl Mәsail"*-dә birinci qismin 1-ci cüzündә sәhifә 79-da demişdir:

***"İnad etmәdәn, cahil olaraqdan şirk işlәyәrәk ölәn kimsәyә gәldikdә, onun işini Allaha hәvalә edirik.[122] Onun üçün dua etmәk, üzәrinә rәhmәt dilәmәk vә onun***

---

[119] Yәni müәyyәn tәkfirdir *(T.e)*

[120] Şeyx Xudayr burada Şeyx Abdullah ibni Muhammәd ibni Abdulvәhhabın *"Durәrus Sәniyyә, 10/149"*- dakı sözlәrini müxtәsәr olaraq qeyd etdi *(T.e)*

[121] Daha öncә bu nәql 3-cü fәsldә cәhalәtin üzrlü olmaması ilә bağlı nәqllәr arasında da keçmişdir *(T.e)*

[122] Onu müsәlman adlandırmadı vә buna görә dә sonrasında ***"onun üçün dua etmәk gәrәkmәz"*** dedi, әgәr müsәlman olsaydı bunu demәzdi. Әksinә, o kimsәyә duanın edilmәmәsi kimi müşriklәrin hökmünü verdi.

***üçün bağışlanma diləmək gərəkli olmaz. Bu, ona görədir ki, alimlərin çoxu "Quranın çatdığı kimsəyə hüccət iqamə olunmuşdur" demişlər. Necə ki, Allahu Təala buyurmuşdur:***

***«Bu, Quran mənə sizi və onun çatdığı kimsələri xəbərdar edib qorxutmağım üçün vəhy olunmuşdur»[123] "***

Bundan öncə isə bu cür demişdir: ***"Lakin fətərat[124] və cəhalətin hökm sürdüyü zamanlarda risalət hüccəti ona iqamə edilib, açıqlanıncaya və bunun Allah və Rəsulunun haram etdiyi şirk olduğunu ona bildirincəyə kimi müəyyən şəxs kafir olmaz. Əgər ona hüccət çatmışsa və Quran ayələri ilə nəbəvi hədislər oxunmuşsa, sonra da o şirki üzərində israr edərsə,[125] həmin kimsə cəhaləti (səbəbi ilə) və bildirən kimsənin olmaması səbəbi ilə bunu edənin əksinə kafir olmuşdur. Cahilin fe'li küfrdür, lakin yalnız hüccət çatdıqdan sonra onun küfrünə hökm verilər.[126] Əgər ona hüccət iqamə edilib, sonra da şirki üzərində israr edərsə, Allahdan başqa ilah olmadığına və Muhəmmədin Allahın Rəsulu olduğuna şahidlik edib, namaz qılıb, zəkat versə və altı əsaslara iman etsə .. belə, o kafirdir"*** (Bax: *"Durərus Səniyyə, 10/274*" )

**- 6)** Həmçinin **Şeyx Abdullah ibni Muhəmməd ibni Abdulvəhhab** *"ər-Rəsail vəl Məsail"*-də birinci qismin 1-ci cüzündə səhifə 201-də şirk olmağından cahil olaraq və Allahdan qeyrisininin ucalığını Onun ucalığı ilə eyni olduğuna etiqad etmədən Allahdan qeyrisinə and içən kimsənin hökmü barəsində soruşulduqda demişdir:

***"Zahir olan budur ki, bu şəkildə cahil olan kimsə cəhaləti ilə üzrlüdür[127], çünki şəriətlər yalnız risalət hüccətindən sonra bağlayıcı olur."***[128] Sonra davam edərək demişdir: ***"Həmçinin and içməkdən başqa, şirk olan hər hansı bir şeyi onun hökmündən cahil olaraq və xəta ilə işləyərsə, əgər bu barədə xəbərdar edildiyində anlayar, tövbə edər və çəkinərsə - necə ki, bu Musa (aleyhissəlam)-ın qövmü barəsində gerçəkləşmişdi və necə ki, Rəsulullah (səllallahu aleyhi vəsəlləm)-ə "bizim üçün də Zantu Ənvat təyin et" deyən səhabələr barəsində gerçəkləşmişdi. Ancaq bunu cahil olaraqdan, inad etməyərəkdən işləyərsə və ona bunun şirk olduğu çatmazdan öncə bu halda ölərsə, onun İslamına hökm verilərmi, onun üçün əfv və məğfirət ümid edilərmi və həyatda olanların onun haqqında istiğfar diləmələri ona fayda verərmi? Bu barədə deyiləcək cavabların ən gözəli (budur):***

---

[123] Ənam surəsi, 19

[124] Burada cəm şəklində ***"fətərat"*** demişdir və bu dəvət imamlarının məzhəbidir. Onlar, peyğəmbərin gəlişindən sonra fətrət zamanının təkrarlanacağını düşünürlər. (Onlara görə) cəhalətin hökm sürdüyü və böyüdüyü, dəvətin yerinə yetirilmədiyi hər bir zaman fətrət zamanı olub onun hökmündədir.

[125] Diqqət, et, onu şirk üzərində inadkar olaraq adlandırdı və o əslində isrardan öncə də şirki işləyəndir. Buna görə də onu müşrik adlandırdı və təkfir ismini ondan nəfy etdi.

[126] (Cahildən) təkfiri nəfy etməyinə diqqət et! (Bir kimsədən) təkfiri nəfy etmək, (onun haqqında) İslam ismini isbat etməyi gərəkdirməz.

[127] Bu (söz) kiçik şirk barəsindədir, çünki burada qeyd edilən (Allahdan qeyrisinə) and içmək kiçik şirkdir.

[128] Yəni bu kimi digər əhkamlar yalnız mükəlləfə risalətin gəlib çatmasından sonra yükümlü olur ***(T.e)***

***Allah onların halını ən doğru biləndir.***[129]***Necə ki, Musa (aleyhissəlam)-dan soruşulduqda bu cür demişdir:***

***«(Firon) dedi : Bəs əvvəlki nəsillərin halı necədir? (Musa) dedi: Onların (halının) elmi Rəbbimin yanındakı Kitabdadır. O, xəta etməz və unutmaz»***[130]***”***

**- 7) Abdullah ibni Muhəmməd ibni Abdulvəhhab** *“əd-Durər,10/274”*-də nəql edərək demişdir:

***“Ölüdən bir şey istəmək, ehtiyacların yerinə yetirilməsi və sıxıntıların ortadan qaldırılması üçün ondan yardım diləmək Allah və Rəsulunun haram etdiyi böyük şirkdəndir. Onun haramlığında və failinin təkfirində, ondan bəraət edilib, düşmənçilik göstərilməsində ilahi kitablar və nəbəvi dəvətlər ittifaq etmişdir. Lakin fətərat zamanında risalət hüccəti iqamə edilib, açıqlanıncaya və bunun böyük şirk olduğu bildirilincəyə qədər müəyyən şəxs bununla kafir olmaz. Əgər (bundan sonra) şirki üzərində israr edərsə, o kimsə kafirdir”*** (İxtisarla)

**- 8) Şeyx Hamd ibni Nasir** *“Durər, 10/336”*-da demişdir:

***“Bütlərə ibadət edən və bu dinin ortaya çıxmasından öncə bu hal üzərinə ölən kimsəyə gəlincə, onun zahiri küfrdür.***[131] ***Hətta cəhaləti və xəbərdar edən kimsənin olmaması səbəbi ilə ona risalət hüccətinin iqamə edilmədiyi ehtimal olunsa da bu cürdür. Çünki biz zahirə görə hökm veririk, batininə görə hökm verməyə gəlincə, bu Allaha aiddir və Allahu təala yalnız üzərinə hüccət iqamə edilən kimsələrə əzab verəcəkdir. Necə ki, Allahu təalanın bu sözündə olduğu kimi:***

***«Biz elçi göndərincəyə kimi (heç kimə) əzab verməri»***[132]

***Ancaq onlardan halı məçhul***[133] ***olaraq ölən kimsələri incələmərik və onların nə küfrnə, nə də İslamına hökm verməri.***[134]***Bu, bizim mükəlləf olduğumuz şeylərdən deyil.***

***«Bunlar bir ümmət idilər, ötüb keçdilər. Onların qazandıqları özlərinə, sizin qazandıqlarınız sizədir. Siz onların etdiklərindən sorğu sual edilməyəcəksiniz»***[135]***”***

---

[129] Diqqət et! Onları müsəlman adlandırmadı və bu (söz) bizim üçün şahiddir.
[130] Taha, 51-52
[131] Çünki o bütlərə ibadət edirdi və buradakı küfr olaraq adlandırılan şirk küfrüdür.
[132] İsra, 15
[133] Diqqət et! Halının məçhul olması ilə yanaşı onu müsəlman adlandırmadı. Onu nə müsəlman nə də mömin adlandırmadı. Ondan küfrü nəfy etmək, onun haqqında islamı isbat etməz, çünki o bütlərə ibadət edir.
[134] Diqqət et! Onu müsəlman adlandırmadı, üstəlik mömin də, üstəlik müvahhid də adlandırmadı.
[135] Bəqərə, 134

**- 9)** Həmçinin *“Durər, 11/75-77”*-də demişdir:

***“Əgər bu sabit olarsa, o zaman deyirik ki, bu İslam dəvətinin ortaya çıxmasından öncə ölən kimsələrin[136] hallarının zahiri şirkdir,[137]onların (batini hallarını) incələmərik və nə küfrlərinə, nə də ki, İslamlarına hökm vermərik[138]”*** *“Fətava əl-Əimmətin Nəcdiyyə, 3/99”*

**- 10) Şeyx Hamd ibni Nasir** rafizilərin əsli kafirlər olduğunu və cəhalətlə üzrlü olmadıqları (görüşünü) qəbul edib. *“Durər, 10/335”*

## Şeyx Abdurrahman ibni Həsən[139]in sözlərindən nəqllər:

---

[136] Yəni Şeyx Muhəmməd ibni Abdulvəhhabın dəvətindən öncə cəhaləti səbəbiylə şirk qoşan və bu hal üzəriə ölən kimsələr. *(T.e)*

[137] Deməli onlar müşriklərdir. Zahiri halı şirk olan kimsə müsəlman deyil.

[138] Burada küfr və islamı nəfy etmişdir. Geriyə (nəfy edilməyən şey) onu əhatə edən şirk ismi qaldı. Çünki o şirki işləmiş və o hal üzərinə ölmüşdür

[139] O, Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhabın Həsən adlı oğlundan olan nəvəsidir. Hicri təqvimlə 1193 cü ildə (m. 1779) Diri'yyədə, sələfi dəvətin yayıldığı və mərkəzi olan bir yerdə doğulmuşdur. Atası Həsən ibni Muhəmməd Ğarabə döyüşündə şəhid olmuşdur və onu Şeyx İmam Muhəmməd ibni Abdulvəhhab özü kəfənləmişdi. Atasının vəfatından sonra Abdurrahman babası Muhəmməd ibni Abdulvəhhabın qucağında böyüdü və o vəfat edənə kimi yanından heç ayrılmadı. Babası vəfat edəndə isə onun on üç yaşı var idi.

Şeyx Abdurrahman ibni Həsən babasının elmindən çox faydalandı və Şeyx Muhəmməd ibni Abdulvəhhab onun ilk şeyxi oldu. Babasından tövhidə dair dərslər aldı və “*Kitabut Tövhidi”* onunla birlikdə oxudu, Quranı əzbərlədi, fiqh oxudu və babasının tələbələrindən təfsir, hədis və s. mövzularda dərslər dinlədi. Hələ büluğ çağına çatmamış elmdə irəliləməyi bacardı, babası Şeyx Muhəmməd ibni Abdulvəhhabın vəfatından sonra Diri'yyənin alimlərindən dərs aldı. Həmin alimlərdən bəzisi bunlardır:

- Əmisi **Abdullah ibni Muhəmməd ibni Abdulvəhhab**,
- **Şeyx Hamd ibni Nasir ibni Muammər**,
- **Şeyx Abdullah ibni Fazil**,
- **Şeyx Əhməd ibni Həsən ibni Rəşid əl-Ayyaş**,
- **Şeyx Abdurrahman ibni Xumeys** və
- **Şeyx Hüseyn ibni Ğannam**.

Təxminən h. 1233-cü ildə Osmanlınn tərkibində olan Misir, **İbrahim Paşanın** başçılığı ilə Nəcdi işğal edir və həmin vaxt Şeyx Abdurrahmanın 20 yaşı var idi. Bundan sonra şeyx bəzi adamlar ilə birlikdə Misirə aparılır və orada yaşamağa başlayır. Şeyx elm tələbini Misirdə də davam etdirir və Əzhər şeyxlərinin bir çoxundan dərs alır, lüğət, fiqh və hədis elmində dərinləşir. Şeyx orada Hənbəli məzhəbini dərindən öyrənir və onun əli ilə bir çox alim və tələbələr yetişir. **Şeyx Əmin ibni Həsən əl-Hilvani** özünün *“Muxtasaru mataliu's-su'udi”* adlı kitabında bu cür demişdir:

***“Şeyx Abdurrahman ibni Həsəni Əzhər camisində gördüm, Hənbəli məzhəbindən dərs keçirdi və o alim, fəqih birisi idi, üzərində təqva və salehliyin göründüyü gözəl bir xüsusiyyət sahib idi”***

Şeyx Abdurrahman ibni Həsən Misirdə aşağıdakı əzhər şeyxlərindən dərs aldı:

- **Şeyx Həsən əl-Quveyni:** Onun yanında üsul elmindən **Cəlaləddin əl-Muhallinin** *“Şərhu Cəmu'l Cəvami'”*- kitabını, bəyan və məani elmində isə *“Muxtasarus-Sa'd”*-ı oxudu və şeyxindən icazətini aldı.
- **Şeyx Abdullah ibni Suveydan**: Ondan öyrəndiyi bütün fənlərdən icazətini aldı.
- **Şeyx Abdurrahman əl-Cəbri**: Ondan peyğəmbərimiz (səllallahu aleyhi və səlləm)-ə kimi çatan sənədi ilə hədislər əzbərlədi və icazətini aldı. Bu da şeyxin rəvayət elmində nə dərəcədə güvənilən bir alim olduğuna əsas verir.
- Əlcəzairin müftüsü **Şeyx Muhəmməd ibni Mahmud əl-Cəzairi əl-Hənəfi əl-Əsəri**-dən öyrəndiyi bütün fənlərdən icazət aldı.
- Misirin tanınmış qarilərindən **Şeyx İbrahim əl-Ubeydidən** qiraətlər mövzusunda dərs aldı.

(O, babasının həyatının sonlarında, özünün isə tələbəliyinin başlanğıcında birbaşa Şeyx Muhəmməd ibni Abdulvəhhabdan dərs alan tələbələrdən birisidir)

Onun bu babda ayrıca kitabları var. Böyük şirkdə cəhalət üzrlüdür şübhəsini ortaya atan Davud ibni Cərcis, Osman ibni Mansur və bənzəriləri ilə bir zamanda yaşamışdır - necə ki irəlidə bu barədə gələcəkdir inşəallah. - Həmçinin onun bu babda ümumi və xüsusi risalələri vardır.

Onun bu mövzudakı kitablarından[140]:

**- 1)** *"əl-Qavlul faslun nəfis fir raddi ala davud ibni cərcis"* adlı kitabıdır, bəzən *"Tə'sisut təqdis"*-də adlandırılır.

---

- Yenə Quran elmlərində əzhər şeyxi **Şeyx Əhməd ibni Salamuna əl-Maliki:** Onun yanında *"əl-Şatibiyyə"*-nın çoxunu və **Şeyx Zəkəriyyə əl-Ənsarinin** *"əl-Cəzəriyyə"*-nin şərhini oxudu.
- **Şeyx Yusuf əs-Savi** və **Şeyx Bacuridən** də dərs aldı.

Şeyx öz elmindən faydalandıraraq çoxlu tələbələr yetişdirmişdir. Bunlardan,

- Övladı **Şeyx Abdullatif, Şeyx Həsən ibni Hüseyn Aluş-şeyx, Şeyx Hüseyn ibni Həmd Aluş-şex, Şeyx Abdulməlik ibni Hüseyn Aluş-şeyx, Şeyx Abdurrahman ibni Hüseyn Aluş-şeyx, Qazi Şeyx Abdullah ibni Nasir, Qazi Şeyx Nasir ibni İ'd, Şeyx Abdurrahman ibni Həmd ət-Tumeyri, Şeyx Abdullah ibni Cəbr ibni Muhəmməd ibni A'tiq, Şeyx Muhəmməd ibni A'clan, Şeyx Abdurrahman ibni Abdullah ibni Abdurrahman ibni Advan, Şeyx Muhəmməd ibni Suleym, Şeyx Əhməd ibni İsa** və s.

H.1241-ci ildə İmam Turki ibni Abdullah yenidən Nəcd bölgəsində hakimiyyəti ələ keçirir və Misir-Türk qoşunlarını oradan qovub çıxarır. Daha sonra Şeyx Abdurrahman ibni Həsən başda olmaqla Nəcdən kənarda olan digər şeyxləri ora hicrət etməyə dəvət edir. Şeyx Abdurrahman da bu dəvətə qarşılıq verərək Misiri tərk edir və Nəcdə yola düşür, orada dəvət- təlim fəaliyyətinə başlayır.

Şeyx Abdurrahman bir sıra əsərlər təlif etmişdir. Bunlardan,

1) *"Fəthul məcid li şərhi Kitabut Tövhid"* – bu kitab **Şeyx Muhəmməd ibni Abdulvəhhabın *"Kitabut-Tövhid"***-inə şərh olaraq yazılmış *"Təysirul Azizul Həmid"*-in müxtəsəri və əlavəsidir. Həmin kitabın sahibi isə **Şeyx Abdurrahmanın** əmisi oğlu **Suleyman ibni Abdullah ibni Muhəmməddir**.

2) *"Qurratu Uyunil Muvahhidin"* – bu da ***"Kitabut Tövhidin"*** müxtəsər şərhidir.

3) Babası Şeyx Muhəmməd ibni Abdulvəhhaba aid *"Asluddinil-İslam və qai'datuhu əmran"* adlı risalənin şərhi

4) *"əl-Qavlul-Faslun-nəfis fir-Raddi a'la Osman ibni Mansur"* və *"ər-Raddu ala Davud ibni Cərcis"*- bu iki əsər böyük şirkdə cəhaləti üzrlü görən cəhmi əqidəsinə sahib və **Şeyx Muhəmməd ibni Abdulvəhhabın** dəvətinə düşmənçilik göstərən **Osman ibni Mənsur** və **Davud ibni Cərcisə** qarşı yazılmış rəddiyələrdir.

5) *"Muxtasarul-aql vən-Nəql"* – **Şeyxül-islam İbni Teymiyyənin** *"Dur'u təa'rudil-aql vən-naql"* əsərinin müxtəsəridir.

6) *"Muxtasaru təfsiri suratul-ixlas"*

7) *"əl-Maqamat"*- burada **Osman ibni Mansurun** *"Şeyxul İslam ibni Abdulvəhhab heç bir alimdən elm almamışdır"* iftirasına cavab verir. Həmçinin orada Osmanlı Misir dövləti ilə Nəcdin dəvət əhli arasındakı savaşlardan bəzi məqamları vurğulamışdır.

Bunlardan başqa bir çox risalələrə və fətvalara da sahibdir. Həmin fətvalar və risalələr üçün *"Məcmuatul Məsail vər Rəsail ən-Nəcdiyyə", "əd-Durərus Səniyyə"* və *"əl-Fətava Əimmətun Nəcdiyyə"* kitablarına baxıla bilər.

Şeyxin 5 oğlu var idi: 1) Şeyx Muhəmməd – Diri'yyənin İbrahim Paşa tərəfindən xərabəyə çevirilməsi zamanı şəhid olmuşdur. 2) Şeyx İsmail 3) Şeyx Abdullatif – *"Minahcutt-Təsis"* və *"Misbahuz-Zallam"*- kitablarının sahibidir. 4) Şeyx İshaq – *"Təkfirul Muəayyən"*- kitabının sahibidir və 5) Şeyx Abdullah

Şeyx Abdurrahman ibni Həsən hicri təqvimlə 1285-ci ildə (m. 1869) 90 yaşını keçdiyi bir halda Riyadda vəfat etmişdir. Allah rəhmət eləsin! *(T.e)*

[140] Şeyx Abdurrahmanın kitab və risalələrinə baş vurulacaq qaynaq **Şeyx Xalid Ğuneyman** *"əl-Mucəddidis-sani"* – İkinci mücəddid kitabıdır.

**- 2)** *“əl-Mavridul azbiz-zulal fi kəşfi şubəhi əhlid-daləl”* (*“Durər, 9/109-128”* – Darul ifta)

**- 3)** *“İrşadu talibi huda” “Durər, 8/204”*-də mövcuddur.

**- 4)** *“ər-Raddu alə ibni Mansur” “Durər, 9/187,194,200”*- də mövcuddur

**- 5)** *“Durər, 9/135,151”* (Darul ifta )-da keçən Əhsa əhlindən olan şübhələrə rəddiyə olaraq yazdığı risalədir.

**- 6)** *“Məcmuatut Tövhid”*-də keçən *“Aslul İslam və qaidatuhu”*[141] – risalənin şərhi barəsindəki risaləsi

**-7)** *“Durər, 9/163,179”* (Darul ifta)-da keçən təkfirdən çəkindirmək barəsində yazdığı risaləsidir.

**- 8)** *“Fətava əl-əimməti-n-nəcdiyyə, 3/155”* –də demişdir:

***“Məqsəd Şeyxül-islamın və onun əhli sünnə vəl camaatdan olan qardaşlarının öz zamanlarında gerçəkləşən böyük şirkə qarşı çıxmaları və bu şirki işləyənin və ya ona etiqad edənin kafir olmasına***[142] ***dair Kitab və Sünnədən dəlilləri qeyd etmələrini açıqlamaqdır. Allaha həmd olsun ki, (bu cahil iftiraçının) uçurumun kənarında bina etdiyi şey bununla yerlə bir edilir.”***

**- 9)** Həmçinin *“3/162”* -də[143] **İbni Teymiyyənin** Misir Fətvasında fəlsəfəçilər barəsindəki cavabına dair demiş olduğu sözüdür. (İbni Teymiyyə) onların üzərində olduqları hallarını qeyd etdikdən sonra demişdir: ***“Onlar (fəlsəfəçilər) yəhudi və nəsranilərdən daha kafirdirlər”***

Şeyx Abdurrahman onun fətvasına yorum edərək demişdir:

***“Şeyxül-islam onların cəhalətləri ilə üzrlü olduqlarını demədi.***[144] ***Əksinə onları təkfir etdi və dindən çıxdıqlarını söylədi. Onlardan kim etiqadlarını gizlərsə onun münafiq olduğunu və alimlərin əksəriyyətinin yanında tövbəyə çağırılmadığını dedi”***

**- 10)** Həmçinin demişdir:

***“Hər bir kafirin xəta etdiyi və müşriklərin (şirklərində) təvillərinin olmasının qaçılmaz olduğu deyilər. Onlar salehləri şərik qoşmalarının onları ucaltmaq***

---

[141] Həmin, risalə (yəni *“Aslud-dinil İslam və qai'datuhu əmran”*) babası şeyx Muhəmməd ibni Abdulvəhhaba məxsusdur. *(T.e)*
[142] Diqqət et! Küfrü şirk fe'linə bağladı və bunun üzərinə icma nəql etdi.
[143] Yəni öncəki kitabda *(T.e)*
[144] Qəbrlərə ibadət edənlər də onlara qiyas edilir, habelə dində bilinməsi zəruri olan məlumatlarda müxalif olanlar da qiyas edilir.

***olduğuna və onlara fayda və zərər verdiklərinə inanırlar. Onlar bu xəta və təvil ilə üzrlü hesab olunmadılar.[145]"*** *"Fətaval əimmətin nəcdiyyə, 3/168"*

- **11) İbnul Qayyimin** insanların təbəqələrindən bəhs edərkən 17-ci təbəqədə kafirlərin[146] cahil və təqlidçiləri və onlara tabe olanlar barəsindəki sözünü nəql etmişdir. Orada (İbnul Qayyim) demişdir[147] :

***"Onlar öz başçılarını və alimlərini təqlid edən cahillər olsalar dahi bu təbəqənin kafir olmasında ümmət ittifaq etmişdir. Yalnız bəzi bidət əhlindən onlar haqqında (cəhənnəm) atəşinə girmələrinə hökm edilməyəcəyinə dair söz nəql edilir. Bu şəkildə onları dəvətin çatmadığı kimsələr maqamına qoyurlar. Bu isə, nə müsəlmanların imamlarından, nə səhabədən, nə tabiinlərdən, nə də ki onlardan sonra heç kimin demədiyi bir görüşdür. Bu, ancaq İslamda sonradan ortaya çıxmış olan kəlam əhlindən bəzilərinin sözü olaraq bilinir.[148] Nəbi (səllallahu aleyhi və səlləm)-dən səhih olaraq varid olan hədisdə o demişdir:***

***"Hər doğulan uşaq, fitrət üzərinə[149] doğar. Sonra onu ata-anası ya yəhudiləşdirər, ya nəsraniləşdirər və ya məcusiləşdirər"***

***Burada uşağı tərbiyələndirən və yetişdirən ata-anasının üzərində olduğu (dindən) başqa bir şeyə etibar edilmədi."***[150]

Şeyx Abdurrahman isə demişdir:[151] ***"Bunu*** (yəni tövhidi) ***gətirməyən kimsə müsəlman deyil. Əgər o, inadkar kafir olmazsa, o zaman cahil[152] kafirdir"-*** bunu kafirlərin təqlidçiləri haqqında demişdir. *"Fətaval əimmətin nəcdiyyə, 3/170"*

## Şeyx Abdullah Əba Buteyn[153]in sözlərindən nəqllər:

[145] Burada müşrikləri və qəbrlərə ibadət edənləri təvilləri ilə üzrlü saymadı. Cəhalət isə təvilin bir növüdür. Hətta xətakarın təvili ancaq cəhalətindən dolayı hasil olur.
[146] Yəni əsli kafirlər
[147] İbnul Qayyimdən nəql edilən bu sözlər onun *"Tariqul-Hicrəteyn"* adlı kitabının 1/411-ci səhifəsində keçir. *(T.e)*
[148] Son cümlə tərcümə etdiyimiz kitabın nüsxəsində yoxdur, lakin İbnul Qayyimə aid olan bu sözlərin qaynağında (yəni *Tariqul-Hicrəteyn"* kitabında) keçir. Əhəmiyyətinə görə həmin cümləni kitabın tərcüməsində əlavə etməyi uyğun gördüm. *(T.e)*
[149] Yəni İslam dini üzərinə doğular *(T.e)*
[150] Yəni uşaq yəhudi və nəsrani adlandırılır və onun bu şəkildə adlandırılması onu tərbiyə edən və yetişdirən kimsədən dolayıdır. Yəni işlənən əməldən dolayıdır, çünki o, (yəni uşaq) onların əməllərini işləməkdədir. Yəhudi və onun kimi isimlərin hüccət ilə əlaqəsi yoxdur.
[151] Yəni İbnul Qayyimin yuxarıda keçən sözlərini nəql etdikdən sonra demişdir. *(T.e)*
[152] Və cəhalət təkfirə mane olmadı.
[153] O, **Əba Buteyn** ləqəbi ilə tanınmış, **Şeyx Abdullah ibni Abdurrahman ibni Abdulaziz əl-Hənbəli ən-Nəcdidir**. H.1994-cü ildə Ravzatu Sudayr adlı yerdə doğulmuş və orada böyümüşdür. İlk elmini oranın qazisi və fəqihi olan **Şeyx Muhəmməd ibni Tarad əd-Dusari əl-Hənbəlidən** aldı. Şeyx Abdullah həmin alimə tam bir bağlılıq göstərdi və onun yanında fiqh elmində ustalaşdı. Sonra isə Nəcddə əl-Vəşəm bölgəsinin mərkəzi sayılan Şaqraya köçdü və oraya yerləşdi. Oranın qazisi və **Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhabın** tələbəsi **Şeyx Abdulaziz ibni Abdullah əl-Husayyin ət-Təmimidən** dərs aldı. Onun yanında təfsir, hədis, fiqh və usuluddinə dair elm aldı. Həmçinin şeyx

ona qaziliklə bağlı bir çox məsələlərdə kömək etmişdir. Bundan başqa **Allamə Əhməd ibni Həsən ibni Raşid əl-Əhsaidən** və *"əl-Fəvakihul-azab fi raddi alə mən ləm yəhkum əs-sünnətə vəl kitab"*-ın sahibi **Şeyx Həmd ibni Nasir ibni Osman ibni Muammər ət-Təmimidən** dərs alıb.

Şeyx Əba Buteyn elmə və tədrisə çox düşkün birisi idi, durmadan çalışmış və öz zamanının imamı, güvənilən alimi ola bilmişdi. H.1220-ci ildə İmam Səud ibni Abdulaziz Harameyn bölgəsini də Nəcd dövlətinin tərkibinə qattığı zaman onu Taifə və Hicaz qəbilələrindən ora aid olan yerlərə qazi olaraq təyin etdi. Şeyx orada təlim və tədris işləri ilə də məşğul oldu, bir çox insan ondan dərs aldı. Orada **əs-Seyyid Hüseyn əl-Cəfərinin** yanında nəhvə dair elm aldı. Sonra isə İmam Abdullah ibni Səud onu Oman sahillərinə qazi olaraq təyin etdi. **Şeyx Osman ibni şeyx Abdullah ibni Bişr** öz ktabında **İmam Abdullah ibni Səud ibni İmam Abdulazizin** qaziləri barəsində danışarkən bundan bəhs edir.

Daha sonra ikinci Səud dövlətinin vaxtında **İmam Turki** Əba Buteyni Şaqraya əl-Vəşəmin digər bölgələrinə qazi kimi təyin etmişdir. Sudayr adlı yerin qazisi vəfat edincə İmam Turki ona Sudayrın qazisi olmağını əmr etdi. Şeyx orada da təlim və tədris işlərinə davam etdi və bir çox insan ondan elm aldı. H.1248-ci ildə İmam Turki onu əl-Qasim bölgəsinə qazi olaraq göndərdi və Şeyx Uneyzə şəhərinə yerləşdi. İmam Turkinin şəhid edilməsindən sonra yenidən Şaqraya döndü, lakin İmam Faysalın əmri ilə yenidən əl-Qasim bölgəsinin qazisi kimi çalışmışdır. İbni Bişr (v.e/h.1251)*"Həvadis"*-də bu cür demişdir:

*"əl-Qasımın böyükləri İmam Faysaldan Şeyx Abdullah ibni Abdurrahman Əba Buteyni öz yanlarına qazi olaraq göndərməsini və yurdlarında elm tələbələrinə müəllim kimi göndərməsini istəyirlər. İmam da ona getməyi əmr edir, həmin vaxt şeyx əl-Vəşəm tərəflərində Şaqrada qazi idi. Onların yanına gedir və Uneyzədə yerləşir, onlar da şeyxə son dərəcə yüksək səviyyədə ikram edirlər və elmindən faydalanırlar"*

H.1270-ci ildə şeyx yenidən Şaqraya döndü və ömrünün sonuna kimi (h.1282/m.1865) orada qaldı.

Beləliklə Şeyx Əba Buteynin elm aldığı şeyxlər bunlar idi:

- **Şeyx Muhəmməd ibni Tarad əd-Dusari əl-Hənbəli** - Şaqrada olarkən fəqih olana kimi ondan dərs aldı.
- **Şaqranın qazisi Şeyx Abdulaziz ibni Abdullah əl-Husayyin**,
- **əs-Seyyid Hüseyn əl-Cəfəri,**
- **Allamə Şeyx Həmd ibni Nasir ibni Osman ibni Muammər ət-Təmimi**,
- **Allamə Əhməd ibni Həsən ibni Raşid əl-Əhsai**,
- **Şeyx Abdullah ibni Muhəmməd ibni Abdulvəhhab**

Şeyx bir çox tələbə və alim yetişdirmişdir. Onlardan,

- **Şeyx Muhəmməd ibni Abdullah ibni Səlim:** Uneyzədə səfərə çıxdığı vaxtlarda qazi kimi onu öz yerinə təyin edərdi.
- **Şeyx Muhəmməd ibni Amr ibni Səlim,**
- **Şeyx Muhəmməd ibni İbrahim əs-Sinani,**
- **Şeyx Muhəmməd ibni Abdulah ibni Mani'** və oğlu **Abdurrahman**
- *"əs-Səhəbul-Vabilə"*-nin sahibi Şeyx Muhəmməd ibni Abdulah ibni Həmid
- **Şeyx Əli ibni Muhəmməd ibni Əli ibni Raşid,**
- **Şeyx İbrahim ibni Həmd ibni İsa** və oğlu **Şeyx Əhməd**
- **Şeyx Əli ibni Abdullah ibni İsa,**
- **Şeyx Süleyman ibni Abdurrahman,**
- **Şeyx Adullah ibni Abdulkərim,**
- **Şeyx Saleh ibni Həmd ibni Nasrullah,**
- **Şeyx Süleyman ibniAli ibni Muqbil** və Nəcdin bir çox qazi və alimləri ondan elm almışdır.

Şeyx bir çox fətva və əsərlərin sahibidir. Bunlardan,

- İbnul Qayyimin *"Bədaiu'l-Fəvaid"* əsərini müxtəsər etmişdir.
- *"Haşiyətu nəfsiyyə alə şərhil- muntəhə"*
- İbnul Qayyimin *"İğasətul Ləhfan"* əsərini də müxtəsər etmişdir.
- *"ər-Ravdatul Murbi' şərhu zadul mustaqni'"* kitabına bəzi təliqlər yazmışdır.
- *"Şərhud-durratul-mudiə"* və *"Aqidətus-səfaraniyyə"* kitablarına da təliqlər yazmışdır.
- *"əl-İntisar li hizbilləhil-muvahhidin var raddi aləl-mucadili anil-muşrikin"* bu iki kitabda böyük şirkdə cəhaləti üzrlü sayan və Şeyx Muhəmməd ibni Abdulvəhhabın dəvətinə qarşı çıxan Davud ibni Cərcisə rəddiyə yazmışdır.
- *"Dahzu şubuhati alət-təvhid min suil-fəhmi li sələsəti əhadiis"*
- *"Risalətu fi təcvidil-Quranil-Kərim"*

Onun böyük şirkdə cəhalətin üzrlü olmaması barəsində kitabları var:

**- 1)** Bu mövzudakı ayrıca olan kitablarından birisi *“Kitabul-İntisar”*- dır və bu mövzudakı ən mühim kitablardandır. Bu kitabda **Davud ibni Cərcis** və onun bu mövzudakı tərəfdarlarına rəddiyə vermişdir.

**- 2)** Onun böyük şirkdə müəyyən təkfir və cəhalətin üzrlü olmaması barəsində risalələri var. Onlardan *“Durər, 10/360”* – də keçən müəyyən təkfir və böyük şirkdə cəhalətin üzrlü olmaması barəsindəki risaləsidir.

**- 3)** Həmçinin onun **İbrahim ibni A′clana** göndərdiyi bu mövzudakı risaləsidir. Həmin mövzu isə böyük şirkdə cəhalətin üzrlü olmamasıdır. Risalə *“Durər, 10/376”* –də yerləşir.

**- 4)** Həmçinin **Şeyx Əba Buteyn** *“Durərus Səniyyə, 10/352”*-də demişdir:

***“Allahın hüccətlərini (yəni dəlillərini) anlamamasından dolayı Nəbi (səllallahu aleyhi və səlləm)-in göndərilməsindən sonra ona və onun gətirdiklərinə imanın olmamasında heç kimsənin üzrü yoxdur.”***

**- 5)** *“əd-Durəru-s-Səniyyə, 10/355”*- də **İbni Teymiyyədən** onun cahilin təkfirində dayanmamasına dair söz nəql etmişdir.

**- 6)** Və *“əd-Durəru-s-Səniyyə, 10/359”*- da demişdir :

***“Küfr işləyən kimsə yalnız inadkar olsa o zaman kafir olar – bu (söz) Kitab, Sünnə və ümmətin icmasına müxalifdir”***

**- 7)** Və *“əd-Durəru-s-Səniyyə, 12/69-70”*- da demişdir :

***“Yəhudi və nəsraniləri təkfir etməyənin və ya onların küfründə şəkk edənlərin kafir olmasında müsəlmanlar icma etmişdir. Biz isə yəqinik ki, onların çoxu cahildir.”***

**- 8) Şeyx Əba Buteyn** *“Məcmuatur Rəsail vəl məsail, 1/660”*- da **Qadı İyadın** *"əş-Şifa"* kitabınakı bu sözünü nəql etmişdir:

***“"Küfr olan sözlər haqqındakı fəsl"- Sözünə davam edərək[154] dedi ki: "Allahın Rübubiyyətini və ya vəhdaniyyətini inkar etməyi və ya Allahdan başqasına ibadət etməyi və ya Allah ilə bərabər başqasına ibadət etməyi açıq bir şəkildə ifadə edən bütün sözlər küfrdür."- Sonra sözünə davam edərək dedi : "Ərəb müşriklərindən, Hind və ya Sudan əhlindən və ya bunlardan başqa bütlərə, mələklərdən, şeytanlardan birinə və ya günəşə, ulduzlara, atəşə və ya Allahdan qeyri birisinə ibadət etməklə şirk qoşanlar…"- Sonra sözünə davam edərək dedi: "Və ya***

- bunlardan başqa bir çox fətva və risalələrə sahibdir. Onları nəcd alimlərinin fətva və risalələrinin toplandığı kitablarda tapmaq mümkündür.

Şeyxin Abdulaziz adlı oğlundan başqa övladının olub-olmadığı bilinmir. Allah rəhmət eləsin! *(T.e)*

[154] Yəni Qadı İyad *(T.e)*

***Allahdan savayı aləmi yaradan və idarə edən birisinin olduğunu (demək və yaxud etiqad etmək), bütün bunların hamısı <u>müsəlmanların icması ilə küfrdür</u>"- (Qadı İyadın) mələklərdən və başqalarından ibarət Allahdan qeyrisinə ibadət edənin küfrü üzərinə <u>müsəlmanların icmasını</u> nəql etməsinə bax!"***

**- 9) Şeyx Əba Buteyn** *"Durərus-Səniyyə, 12/72-73"*-də və *"Məcmuatur-Rəsail, 1/659"*- da demişdir:

***"Təvil edərəkdən və ya ictihad edərəkdən və ya xəta edərəkdən və ya təqlid edərəkdən və ya cahil olaraqdan[155] küfr işləyənin üzrlü olduğunu iddia edən kimsə heç bir şəkk yoxdur ki, Kitaba, Sünnəyə və icmaya müxalif olmuşdur. Bununla onun öz əslini[156] pozması gərəkir, əgər öz əslini ümumiləşdirərsə - necə ki, əgər Muhəmməd (səllallahu aleyhi və səlləm)-in risalətində şəkk edənin təkfirində duraqsaması və bu kimi digər məsələlərdə (olduğu kimi) - şübhəsiz kafir olar"***

**- 10)** Həmçinin *"Durərus-Səniyyə, 10/359"*-də demişdir:

***"Bu (yəni tövhidi pozan şeylərdə cəhaləti üzrlü sayan kimsə) Rəb subhanəhu təalanın varlığında və ya vəhdaniyyətində şəkk edən və yaxud Muhəmməd (səllalahu aleyhi və səlləm)-in peyğəmbərliyində və ya ölümdən sonra dirilməkdə şəkk edən kimsə haqqında necə deyir? Əgər bunda öz əslini ümumiləşdirərsə şübhəsiz o kafir olar, necə ki Muvaffaquddin (yəni İbni Qudamə) daha öncə keçən sözündə bunu bildirmişdir. Əgər bunda öz qaydasını ümumiləşdirmirsə, bəs nə üçün bu şeylərdə şəkk edəni üzrlü saymır və İslam dinin əsli olan Lə iləhə illəllaha şəhadəti pozan böyük şirkin failini cəhaləti ilə üzrlü sayır?! Bu açıq bir çəlişkidir."***

**- 11) Şeyx Əba Buteyn** *"Məcmuatur-Rəsail, 2/211-213"*- də demişdir:

***"Fətrət zamanında ölən və Rəsulun dəvətinin çatmadığı kimsə isə onun halını Allah subhanəhu təala daha doğru bilir. Fətrət ismi sadəcə bir ümmətə xas deyil.[157] Necə ki, İmam Əhməd zındıqlar və cəhmilər barəsindəki xütbəsində demişdir: - "Rəsulların arasının kəsildiyi hər fətrət zamanında[158] elm əhlindən bəzisini göndərən Allaha həmd olsun" – Bu ləfz Ömərdən də rəvayət edilir"***

Əba Buteyn İbnul Qayyimdən 14-cü təbəqəni nəql etmişdir:

---

[155] Burada cəhaləti üzrlü saymadı, həmçinin, bundan öncə də. Onun cəhalətinin üzrlü olmasını çəlişki və icmaya müxalif olduğunu ifadə etdi.

[156] Yəni özünə əsl kimi təyin etdiyi cəhalətin üzrlü olması fikrini. *(T.e)*

[157] Bu onun seçimidir və dəvət imamları da bu görüş üzərindirlər ki: fətrət zamanının bir daha geri qayıtması mümkündür, əgər cəhalət yayğınlaşar, böyüyər və dəvət mövcud olmazsa (həmin dövr fətrət zamanı hesab olunar).

[158] Bu İmam Əhmədin seçimidir: fətrət zamanı hər dövrdə olur.

***“İtaati və üsyanı olmayan, küfrü və imanı olmayan qövm[159]:***

***Onlar bir neçə sinifdir. Bunlardan, heç bir şəkildə dəvətin çatmadığı və heç bir şəkildə xəbəri eşitməyənlər var. Heç bir şeyi əql etməyən dəli, heç bir şey eşitməyən kar və (doğru ilə yanlışı, haqq ilə batili bir-birindən) ayırmaq gücünə malik olmaqdan öncə ölən müşriklərin uşaqları[160] bunlardandır. Ümmət bu təbəqənin hökmündə ixtilaf etmişdir.”[161]***

O, (yəni **İbnul Qayyim**) və şeyxi **İbni Teymiyyə** onların qiyamət günü imtahan olunacaqları görüşünü seçmişdir. **Əba Buteyn İbni Kəsirdən** nəql edir ki, imtahan olunmaq barəsindəki görüş **əl-Əşarinin**[162] əhli sünnədən nəql etdiyi bir görüşdür.

**- 12) Şeyx Əba Buteyn** *“Risalətul İntisar, s.11”* –də demişdir:

***“Allah bütün rəsulları tövhidə dəvət etmək və onun ziddi olan şirki bildirmək üçün göndərmişdir. Hansı ki, Allah onu (yəni şirki) bağışlamaz və bundan cahil olmaqda mükəlləf üçün üzr yoxdur”[163]***

**- 13)** Və demişdir:

***“Alimlərin mürtədin hökmü babında (sözə) ilk başladıqları şey şirkdir. Kim Allaha şirk qoşarsa kafir olar deyirlər. Çünki şirk onların yanında küfrün növlərindən ən böyüyüdür və ondan başqaları barəsində dedikləri kimi: 'əgər onun kimisi cahil olmazsa o zaman (kafir olar)'[164]- demirlər”[165]***

---

[159] Burada İbnul Qayyimin vəsf edilən və özündən itaətin və üsyanın, küfrün və imanın nəfy edildiyi kimsələr barəsindəki sözünə bax! İbnul Qayyim onlardan bu 4 şeyi nəfy etdi, lakin şirk və müşriklər ismini onlardan nəfy etmədi. Əgər onları müsəlman adlandırmış olsaydı, bu sözü demiş olmazdı.

[160] Burada qəsd edilən təmyiz çağına çatmadan vəfat edən kafirlərin uşaqlarıdır. *(T.e)*

[161] *Tariqul Hicrəteyn, 1/387*

[162] O, **Əbul Həsən əl-Əşaridir**. Həmçinin bu sözü **İbnul Qayyim** *“Tariqul Hicrəteyn,1/399”*-da bu təbəqəyə dair ixtilafları gəitirərkən qeyd etmişdir *(T.e)*

[163] Bu, cəhalətin üzrlü olmamasına dair açıq ifadədir.

[164] Öncəki (nəqldəki) kimi (söz) təkrarlananır.

[165] Alimlər fiqh kitablarında *“Mürtədin hökmü”* babında İslamdan çıxaran söz və əməlləri zikr edərkən bu ifadəni işlətmişlər. Məsələn,*“Zadul Mustaqni' ”* kitabının müəllifi hənbəli alimi **Haccavi** *“Mürtədin Hökmü”* babında bu cür demişdir:

***“Kim Allaha şərik qoşarsa və ya Onun rübubiyyətni və ya vəhdaniyyətini inkar edərsə və yaxud Allahı və ya Rəsulunu söyərsə bununla kafir olar. Kim zinanın haramlığını və ya üzərində icma edilmiş haramlandan hər hansı bir şeyi cahil olaraq inkar edərsə ona bildirilər. Əgər onun kimisi bundan cahil olmazsa kafir olar.”***

Yəni üzərində icma edilmiş olan haramlardan hər hansı bir şeyi cahil olmadan, bilərək inkar edən kimsə bununla kafir olar. Bildirilmə, yəni hüccət çatdırma yalnız haramlardan cahil olan kimsə üçündür. Allaha şirk qoşmaq, rübubiyyətini və ya vədaniyyətini inkar etmək, Allaha və ya peyğəmbərə söymək kimi küfrün növlərində isə cahil olub-olmamaqdan bəhs etməmişlər. Burada cahil olmağına etibar edilməz, sahibi dərhal kafir olar. *(T.e)*

**- 14) Şeyx Əba Buteyn** *“Durərus-Səniyyə, 10/392”*-də Allahu təalanın : ***“(Allah) bir qrupa hidayət verdi, bir qrup isə azğınlığı haqq etdi. Onlar Allahı qoyub şeytanları özlərinə dost tutdular və (bununla belə) özlərinin doğru yolda olduqlarını hesab edirlər.”*** [166] ayəsinin təfsirində **İbni Cəririn** sözünü nəql etmişdir:

***“İbn Cərir dedi ki: "Bu (ayə) cahilin üzrlü olmadığına dəlildir." ”*** [167]

**- 15)** *“Durərus Səniyyə, 10/393”*-də **Adiy ibni Hatimin** ***“Biz onlara ibadət etmirdik”*** sözünə qarşılıq peyğəmbər (səllallahu aleyhi və səlləm) demişdir: ***“Onlar Allahın haram etdiklərini halal saydıqlarında siz də onları halal qəbul etmədinizmi….”*** hədisini nəql edərkən **Şeyx Əba Buteyn** demişdir:

***“Allah onları azarladı və onlarla bərabər etdikləri bu (şeyin) (əslində) onlara ibadət etmək olduğunu bilməmələri ilə yanaşı onları müşriklər adlandırdı və cəhalətlərini üzrlü saymadı”*** [168]

**- 16)** Və **İbni Teymiyyənin** sözünü nəql edərkən demişdir:

***“Özü ilə Allah arasında vasitələr təyin edən və onlara təvəkkül edib, onlardan istəyən kimsənin kafir müşrik olub, cahil və başqalarının da buna daxil olmasında icma vardır”*** [169] Həmçinin bax: *“Durərus-Səniyyə, 10/355”*

**- 17) Əba Buteyn** *“Durərus-Səniyyə, 12/69-74”*-də, həmçinin *“10/365”*-də demişdir:

***“Əgər böyük şirki işləyən cəhalətinə görə üzrlü olsaydı, bəs üzrlü olmayan kəs kimdir? Bu iddianın gərəyi budur ki, inadkardan başqa kimsənin üzərində Allahın bir hüccəti yoxdur. Bununla yanaşı bu iddianın sahibinin öz əslindən uzaqlaşması mümkün deyil, əksinə ziddiyətin olması qaçılmazdır. Beləki, (bu iddia sahibinin) Muhəmməd (səllallahu aleyhi və səlləm)-in risalətində şəkk edən və ya ölümdən sonra dirilməkdə və yaxud da dinin digər əsllərində şəkk edən barəsində (təkfirində) dayanması mümkün deyil və şəkk edən kimsə də cahildir”***

Və demişdir: ***“Bunun (yəni cəhalətin üzrlü olması iddiasının) gərəyi olaraq yəhudilərin, nəsranilərin və günəşə, aya, bütlərə cəhaləti səbəbi ilə ibadət edən cahilləri və Əli ibni Əbi Talibin atəşdə yandırdığı kimsələri təkfir etməməyimiz lazımdır, çünki biz kəsin şəkildə bilirik ki, onlar cahillərdir. Müsəlmanlar yəhudi və***

---

[166] (Ə'raf surəsi, 30)

[167] Diqqət et! Burada İbni Cəririn sözünə əlavə var. Bu, cəhalətin üzrlü olmaması, həmçinin İbni Cəririn seçdiyi görüşdür. Lakin Şeyx Əba Buteyn burada İbni Cəririn sözünü məna olaraq qeyd etmişdir və İbni Cərir bu barədəki sözünü Əraf surəsindəki həmin ayənin təfsirində demişdir.

[168] Bu, cəhalətin üzrlü olmaması barədə açıq bir ifadədir.

[169] Öncəki nəqldəki kimi təkrarlanan açıq ifədədir.

***nəsraniləri təkfir etməyən və ya onların küfründə şəkk edən kimsənin küfründə icma etmişlər və biz yəqin olaraq bilirik ki, onların əksəriyyəti cahillərdir”***

**- 18) Əba Buteyn** *“Durərus-Səniyyə, 10/394-395”*-də demişdir:

***“Sənin - ona imam və ya onun naibi tərəfindən risalət hüccəti çatdırılıncaya kimi (üzrlüdür)- sözünün mənası budur ki, İslam hüccəti yalnız imamdan və ya onun naibindən qəbul olunar. Bu, alimlərdən heç kimsənin demədiyi çirkin bir xətadır. Əksinə, kim olursa olsun haqqı deyəndən onu qəbul etməsi hər bir kəsin üzərinə vacibdir. Bunun gərəyi isə budur ki, haram, şirk və ondan başqasını cəhaləti səbəbi ilə işləyən kimsəyə elm sahibi olan birisi tərəfindən ona işlədiyinin haram olduğu şəriətin dəlilləri açıqlanarsa və bunun dəlilləri Quran və Sünnədən ona açıqlanarsa, həmin şəxsin bunu yalnız imam və onun naibi olması halında qəbul etməsi gərəkər. Və yalnız imam və ya onun naibi tərəfindən olarsa Allahın hüccəti onun üzərinə çatmış sayılar. Zənnimcə sən bunu bəzi batil əhlindən eşitmisən və buradakı eybi anlamadan onu təqlid etmisən. İmamın və ya naibinin vəzifəsi ancaq İslam ölkələrində hədləri tətbiq etmək və tövbəyə çağırmaq, mürtədin öldürülməsi kimi şəriətin hökmünü yerinə yetirməkdir. Zənn edirəm ki, bu ifadə bəzi fəqihlərin imam və ya onun naibi çağırılıncaya kimi namazı tərk edənin öldürülməyəcəyinə dair sözlərindən götürülmüşdür. Bir işi etməyə (kimisə) çağırmaq, onun xətalı və ya doğru olmasına, haqq və ya batil olmasına dair şəri dəlillər ilə hüccəti açıqlamaqdan fərqlənir. Məsələn, alim namazı tərk edənin öldürülməsinin vacibliyinə dair şəri dəlilləri açıqlayır, sonra isə imam və ya naibini bunu yerinə yetirməyə və tövbəyə çağırması üçün dəvət edir”***

**- 19) Şeyx Əba Buteyn** *“Məcmuatur Rəsail vəl Məsail, 1/657”*- də (Cahil olsa belə Allaha şirk qoşanın müəyyən təkfiri barəsindəki risaləsində) demişdir:

***“Kitab və Sünnənin dəlalət etdiyi, alimlərin üzərində icma etdiyi şey budur ki, Allah subhanəhu təalaya ibadətdə başqasını ortaq qoşmaq küfrdür. Kim bu növdən olan bir şeyi işlərsə və ya gözəl hesab edərsə, onun küfründə heç bir şəkk yoxdur və bundan bir şeyi gerçəkləşdirən kimsə haqqında sənin “filankəs bu fe'li ilə kafir oldu”[170] deməyində bir problem yoxdur. Bunu açıqlayan şey isə budur: fəqihlər mürtədin hökmü babında müsəlmanı kafir mürtəd edən bir çox şeyləri zikr edirlər və həmin baba bu sözləri ilə başlayırlar: "Kim Allaha ortaq qoşarsa kafir olar, onun hökmü tövbəyə çağırılmasıdır, əgər tövbə etməzsə öldürülər." - Tövbəyə çağırma isə ancaq müəyyən kimsə haqqında olur.”***

Həmçinin orada demişdir:

***“Alimlərin müəyyən təkfir barəsindəki sözləri çoxdur. Bunlardan ən böyüyü: Allahdan qeyrisinə ibadət şirkidir və bu müsəlmanların icması ilə küfrdür. Bu***

[170] Diqqət et! Hökmü fe'lə bağladı və üzərində ismin icra edilməsinə cəvaz verdi.

***sifətə[171] sahib olanın təkfirinə bir əngəl yoxdur. Çünki kim zina etsə filankəs zinakardır deyilər, kim faiz yesə, filankəs faiz yedi deyilər"***

(Bax: *"Məcmuatur Rəsail, 1/657"*)

**- 20)** Həmçinin **Şeyx Əba Buteyn** *"Durərus-Səniyyə, 10/401"* – də demişdir:

***"Müəyyən təkfir haqqında deyirik ki, ayələrin və hədislərin zahiri və alimlərin cumhurunun sözü Allaha şərik qoşan və Onunla yanaşı başqasına ibadət edənin küfrünə dəlalət edir və dəlillər müəyyən ilə qeyrisi arasında bir fərq qoymur.[172] Allahu təala demişdir: «Allah Özünə ortaq qoşulmasını bağışlamaz» və demişdir: «Müşrikləri harda ələ keçirsəniz öldürün» - Bu, müşriklərin hər biri haqqında olan ümumi hökmdür. Bütün alimlər fiqh kitablarında mürtədin hökmünü qeyd edirlər, küfrün və riddətin növlərindən ilk qeyd etdikləri şey şirkdir. Demişlər ki: "kim Allaha şərik qoşarsa kafir olar" və cahili bundan istisna etməmişlər.[173] Kim Allahın yoldaşı və ya övladı olduğunu iddia edərsə kafir olar və cahili bundan istisna etməmişlər. Kim Aişə anamıza zina iftirası atarsa kafir olar və kim Allah ilə, rəsulu ilə və ya kitabları ilə istehza edərsə icma ilə Allahu təalanın bu ayətinə görə kafir olar: «Üzr istəməyin! Siz artıq imanınızdan sonra kafir oldunuz» Alimlər sahibinin kafir olması üzərində icma edilmiş kufrün bir çox növlərini qeyd edirlər, müəyyən ilə başqası arasında bir fərq qoymurlar.[174] Sonra isə belə deyirlər: "Kim İslam dinindən irtidat edərsə tövbəyə çağırıldıqdan sonra öldürülər." Tövbəyə çağırılmasından öncə haqqında riddət hökmünü vermişlər. Tövbəyə çağırma isə riddət hökmündən sonra olur və tövbəyə çağırma müəyyən (şəxs) üçün olur. Həmçinin bu babda beş ibadətdən birinin vacibliyini inkar edənin və ya içki, donuz əti kimi digər haramlardan bir şeyi halal sayan və ya bunda şəkk edən kimsənin hökmü barəsində "əgər bu kimi şeylərdə cahil olmazsa kafir olar" demişlər. Bunu şirk və bəzisini qeyd etdiyimiz bənzəri şeylərdə deməmişlər, əksinə onun barəsində küfr sözünü işlətmişlər, cəhalət ilə bağlı bir şərt qoymamışlar və müəyyən ilə başqası arasında fərq qoymamışlar. Qeyd etdiyimiz kimi tövbəyə çağırma müəyyən üçündür. Müsəlmanın Allahın yoldaşı (zövcəsi) var və ya övladı var deyənin və ya Cəbrayıl (mələk) risaləti gətirməkdə xəta etmişdir deyənin və yaxud da ölümdən sonra dirilməyi inkar edən və ya peyğəmbərlərdən birini inkar edən kimsənin küfrü barəsində şəkk etməsi caizdirmi? Müsəlman bu və bənzəri məsələlərdə müəyyən[175] ilə qeyrisi arasında fərq qoyarmı? Peyğəmbər (səllallahu aleyhi və səlləm) demişdir:***

---

[171] Diqqət et! Hökmü bu sifətə sahib olması ilə əlaqələndirdi və onu cəhaləti ilə üzrlü saymadı

[172] Yəni şirk sahəsində müəyyən ilə qeyrisi arasında fərq yoxdur. Onlar arasında fərq qoymaq zikr etdiklərinin (yəni alimlərin) sözlərinə müxalifdir.

[173] Bu, cəhalətin üzrlü olmamasına dair açıq ifadədir, hətta bunun üzərinə icma nəql etmişdir.

[174] Bu, böyük şirkdə müəyyən ilə başqası arasında fərq qoyulmamasına dair icmanın nəql olunmasıdır. Əksinə bu fərqləndirmənin özü bidətdir.

[175] Onun müəyyən ilə qeyrisi arasında ayırımın olmaması (məsələsəindəki) sərtliyinə bax! Tövbəyə çağırmaq barəsində önəmli bir məsələni açıqlamışdır ki, o ancaq müəyyən şəxs üçündür. Əgər "tövbəyə çağılır" deyilsə başa düş ki, bu müəyyən şəxs haqqındadır. Sonra isə belə deməsi gərəklidir: tövbəyə çağırmaq yalnız bundan öncə barəsində şirk və ya küfr isminin icra edildiyi kimsə haqqındadır.

***“Kim dinini dəyişdirərsə onu öldürün!” –  bu isə müəyyəni və başqasını da əhatə edir. Dini dəyişdirmənin növlərinin ən böyüyü Allaha şərik qoşmaq və Ondan qeyrisinə ibadət etməkdir...”*** - sözə davam edərək demişdir:

***“Və biz bilirik ki, İslama nisbət olunanlardan kim bunu (yəni şirki) işlərsə, onu buna düşürən şey yalnız cəhalətdir. Əgər onlar bilsələr ki, bu (əməlləri) onları Allahdan son dərəcədə uzaqlaşdırır və bu Allahın haram etdiyi şirkdəndir, onu işləməzlərdi. Bütün alimlər onları təkfir etmişlər və bəzi azğınların: "Onlar üzrlüdürlər, çünki cahildirlər"- dedikləri kimi cəhalətlərini üzrlü saymamışlar.[176]”*** - sözə davam edərək demişdir:

***“Şeyxin (İbni Teymiyyənin) sözünə gəlincə: "Sonradan gələnlərin çoxunda cəhalət yayğınlaşdığı üçün onların təkfiri mümkün deyildi"  i.a. – O, demədi ki, onlar üzrlüdürlər,[177] lakin bəyandan öncə onlara küfr sözünü işlətməkdə durdu.[178] Onun sözləri cəm edilərək deyilər: Onun qəsdi budur ki, əgər biz bir insandan küfr sözü eşitsək və ya insanların mənzum (yəni şe'r) yaxud nəsr şəklində olan bəzi sözlərində küfrə rast gəlsək, ona şəri hüccəti bəyan edincəyə kimi bunu (yəni küfr sözünü) gördüyümüz və ya eşitdiyimiz həmin şəxsin təkfirinə tələsmərik. Bu isə bizim: "ehtiyaclarını yerinə yetirmələrini istəyərəkdən qəbrdəkilərə, mələklərə və ya qeyrisinə dua edənlər müşriklərdir" - sözümüz ilə yanaşı deyiləcək bir sözdür.”[179]***

**- 21) Şeyx Əba Buteyn** *“Durərus-Səniyyə, 10/360,375”* – də demişdir:

***“Şeyx Taqiyyuddinin: 'Təkfir və qətl hüccətin çatmasına bağlıdır.'[180] – sözü bu iki şeyin - təkfir və qətlin -  mütləq olaraq hüccətin fəhminə deyil, əksinə onun çatmasına bağlı olduğuna dəlalət edir. Onun anlaşılması ilə (sadəcə) çatması fərqli şeylərdir. Əgər bu hökm hüccətin fəhminə bağlı olsaydı, xüsusən inadkarlardan başqa heç kimi təkfir etməzdik və savaşmazdıq. Bu (həmin iddianın) batilliyini açıqlayır. Hətta rahiməhullahın sözünün sonu insanların çoxuna gizli qalan məsələlərdə onun hüccətin fəhminə etibar etdiyinə dəlalət edir. Həmin məsələlərdə tövhidi və risaləti pozan şey yoxdur, məsələn bəzi sifətlərdən cahil qalınması kimi***.

***Tövhidi və risalətə imanı pozan məsələlərdə isə (İbni Teymiyyə) rahiməhullah bir çox yerdə bunun sahiblərinin küfrünü və tövbədən sonra öldürülmələrini açıqca ifadə etmişdir və cəhalətlərini üzrlü saymamışdır[181]. Bununla yanaşı biz yaxşı bilirik ki, onların bu məsələlərə düşmələrinin səbəbi bunların həqiqətindən cahil***

---

[176] Bu, özündən sonra (heç) bir təliqi olmayan çox açıq bir ifadədir.

[177] Bu, mühim bir işarədir

[178] Diqqət et! Sadəcə küfr sözündə duruldu. Bununla bərabər onlar müsəlman adlandırılmırlar,  çünki onlar şirk işləyirlər. Necə ki, bu sözündən öncə demişdir.

[179] Diqqət et! Onları kafir adlandırmadı, lakin müşrik adlandırdı.

[180] Şeyxin İbni Teymiyyənin sözünü fəhm etməsinə bax! Bu nəql onun başqa yerlərdə işlətmiş olduğu ifadələrini təxsis edir.

[181] Onun İbni Teymiyyənin sözünü anlatmasına bax! Hansı ki, İbni Teymiyyə tövhidi və risalətə imanı pozan və ya  daha sonra anlatılan (sözdəki) kimi rübubiyyətə xas olan şeylərdə cəhaləti üzrlü saymır.

***qalmalarıdır. Əgər bunların İslamdan çıxaran küfr olduqlarını bilsələrdi onları işləməzlərdi..."***

Sonra isə peyğəmbər və ya saleh kimsələr barəsində aşırıya gedən və onlar haqqında uluhiyyətdən bir növ təyin edənlər barəsində misallar gətirdi. Sonra davam edərək dedi:

***"Bu kimi sözlər – hansı ki, onlar sadəcə Allaha aid edilməsi doğru olan rübubiyyətin xüsusiyyətlərindəndir - bunların hamısı şirk və zəlalətdir. Bu sözlərin sahibi tövbəyə çağırılar, əgər tövbə etməzsə öldürülər..."***

Sonra davam edərək dedi:

***"İbni Teymiyyənin: "onlara rəsul (səllallahu aleyhi və səlləm)-in gətirdiyi bəyan edilincəyə qədər onların bununla təkfiri mümkün deyil" - sözünə bax! Onlara bəyan ediləne kimi və bilgidən sonra onlardan inadkarları öyrənməyimizə kimi demədi..."***

Sonra davam edərək dedi:

***"Onun xəfi olan sözlər ilə zahir olan işlər arasındakı ayırımına bax! Xəfi olan sözlər barəsində - hansı ki, onlar küfrdür - bu cür demişdir: "Burada ona sahibini kafir edən hüccətin çatmadığı azmış bir xətakar olduğu deyilər. Zahir olan işlərdə isə bu deyilməz." Onun zahir olan işlər ilə xəfi olanlar arasındakı fərq ilə bağlı sözü açıqdır. Zahir olan işlərdə mütləq hökm ilə və müsəlmandan cahil olaraq bunlardan ortaya çıxan şeylər ilə təkfir edir, məsələn, bildirildikdən sonra haram olan bir şeyi, şirk olan fe'li və ya sözü halal saymaq kimi...***

***Cahil olaraq işlənən xəfi işlərdən dolayı isə təkfir etmir, məsələn, bəzi sifətlərdən cahil olmaq kimi. Bununla cahili mütləq olaraq təkfir etmir, hətta (buna) dəvət edən birisi olsa da. Onun cəhmilərə dediyi bu sözü kimi: "Siz mənim yanımda kafir olmursunuz, çünki siz cahilsiniz." Onun (yəni ibni Teymiyyənin) onların təkfirinin olmadığını açıqlayan "mənim yanımda" sözü, üzərində icma edilmiş bir məsələ deyil, lakin bu onun seçdiyi görüşdür. Onun bu məsələdəki sözü məzhəbdə (Hənbəlilərdə) məşhur olanın xilafınadır. Məzhəbin səhih olan görüşü isə Quranın məxluq olması sözünə və ya ru'yənin (Allahın qiyamət günü görülməsini) inkar etməyə və ya rafiziliyə və bunun kimi şeylərə dəvət edən muctəhidin təkfiridir, (bunlarda) təqlid edən kimsələrin isə fasiq olmasıdır.***

***Məcduddin[182] (rahiməhullah) dedi ki: "Doğru olan budur ki, hər bidətdə ona çağıranı təkfir edərik, onda təqlid edəni isə fasiq sayarıq. Məsələn, Quranın məxluq olduğunu deyənlər kimi və ya Allahın elminin məxluq olduğunu deyənlər kimi və ya Allahın isimlərinin məxluq olduğunu deyənlər kimi və ya Onun axirətdə görülmədiyini deyənlər kimi və ya səhabəyə söyməyi özlərinə din edənlər kimi və ya iman mücərrəd etiqaddır deyənlər kimi və ya buna bənzər digər şeylərdə. Hər kim bu bidətlərdən hər hansı bir şeyin alimi olarsa, ona dəvət edər və onun üzərində***

---

[182] Şeyxül-islam İbni Teymiyyənin babasıdır. *(T.e)*

***mübahisə edərsə, onun küfrünə hökm edilir. Əhməd bir çox yerdə bunu bildirmişdir."*** **Sözü bitdi.**

***Cəhalətləri ilə yanaşı onların küfrünə necə hökm etdiklərinə bax!***[183] ***Şeyx (İbni Teymiyyə) rahiməhullah onların kafir olmadığı görüşünü seçmişdir, onun yanında onlar fasiq olurlar. İbnul Qayyim (rahhiməhullahın) sözü də bunun kimidir:***

***"Etiqadi fisq bidət əhlinin fisqi kimidir Allaha və axirət gününə iman edən, Allahın haramlarını haram qəbul edib, vaciblərini vacib qəbul edən, lakin Allahın və Rəsulunun isbat etdiklərinin bir çoxunu cəhalətindən, təvilindən və şeyxlərini təqlidindən dolayı inkar edən və eləcə də Allahın və Rəsulunun isbat etmədiyini isbat edənlər. Onlar, (oxun yaydan çıxması kimi dindən çıxan) Xəvariclər və Rafizilərin, Qədəriyyələrin, Mötəzilənin çoxu və təcəhhümdə ğulat***[184] ***olmayan cəhmilərin bir çoxu kimidilər. Amma cəhmilərin ğulatı və rafizilərin ğulatı kimiləri***[185] ***isə, bu iki tayfanın İslamdan nəsibləri yoxdur. Buna görə sələfdən bir qrup onları 72 firqədən çıxarmışlar və demişlər ki onlar millətdən uzaqlaşmışlar"***

**Əba Buteyn** sözü və nəqli bitti

Dedim ki: Haqqa daha yaxın olan (görüş) hüccətin və elmin ortaya çıxması yönündən İbni Teymiyyənin zamanı ilə ondan öncəki zamanın arasında fərqin olmasıdır. İki seçimin[186] arasındakı fərqliliyin səbəbi iki zaman arasındakı fərqlilikdir. İbni Teymiyyənin zamanı cəhalətin yayğınlaşdığı və fətrət zamanıdır.

## Şeyx Abdullatif ibni Abdurrahman alu şeyx[187]in sözlərindən nəqllər:

---

[183] Bu söz cəhalətin üzrlü olmadığına şahiddir və bu, zikr etdiyi kimsələrin görüşüdür.

[184] Ğulat, yəni aşırı deməkdir *(T.e)*

[185] Sələf cəhmiyyənin ğulatını və rafizilərin ğulatını təkfir etmişdir. Dəvət imamları qəbrlərə ibadət edənlərin təkfirini zəruri elm ilə bilinən bütün əməlləri işləmələrinə görə onlara qiyas etmişlər. Buradakı qiyas qiyasu şəbəhdir. Rafizilərlə olan qiyas isə qiyasu əvladır.

[186] Yəni bidət əhlinin alimlərinin təkfiri məsələsində Hənəbəlilərin görüşü ilə İbni Teymiyyənin seçdiyi görüş arasındakı fərq nəzərdə tutulur. *(T.e)*

[187] O, Şeyxül-islam **Muhəmməd ibni Abdulvəhhabın** nəvəsi **Şeyx Abdurrahman ibni Həsənin** oğlu **Şeyx Abdullatif ibni Abdurrahman ibni Həsən ibni Muhəmməd ibni Abdulvəhhab ət-Təmimidir**. Anası isə atasının əmisi **Şeyx Abdullah ibni Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhabın** qızıdır. Şeyx Abdullatif h.1225-ci ildə (m.1810) həmin dövrdə tövhid dəvətinin və nəcd alimlərin beşiyi sayılan Diri'yyədə doğulmuş və uşaqlığını orada keçirmişdir. Hələ uşaq yaşlarında ikən Quranı əzbərləmişdi. Müharibənin gətirdiyi bəla Diri'yyəyə də çatınca təxminən h.1233-cü ilin sonunda Şeyx Abdullatif atası Şeyx Abdurrahman ibni Həsən və ailəsindən bir neçə nəfərlə birlikdə Misirə köçdülər. Həmin vaxt Şeyx Abdullatif 8 yaşında idi. Şeyx elmini orada da davam etdirdi, həm Nəcdli həm də Misirli bir çox alimlərdən dərs aldı. Onlar arasında, nəcd alimlərindən

- Şeyxin atası və *"Fəthul Məcid"*-kitabının sahibi **Şeyx Abdurrahman ibni Həsəndən** və
- Atasının əmisi oğlu və şeyxin eyni zamanda dayısı olan **Şeyx Abdurrahman ibni Şeyx Abdullah ibni Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhabdan** elm aldı.

Misirli alimlərdən,

- **Şeyx Muhəmməd ibni Mahmud ibni Muhəmməd əl-Cəzairi əl-Hənəfidən,**
- Zamanında Əzhər Camisinin böyük şeyxi sayılan **Şeyx İbrahim əl-Bacuridən,**
- **Şeyx Mustafa əl-Əzhəridən və**
- **Şeyx Əhməd əs-Saididən** və digər Misir alimlərindən elm aldı.

Onun bu məsələdə bir çox kitabları var. Belə ki, şeyx böyük şirkdə cəhaləti üzrlü sayan kimsələrlə bir dövrdə yaşamışdır.

**- 1)** Onun bu mövzudakı kitablarından ən böyüyü **Davud ibni Cərcisə** rəddiyə olaraq yazdığı *“Minhacut-Tə'sis”* – dir.

---

Şeyx Abdullatif 31 ilə yaxın Misirdə qaldı və orada evləndi. Misirdə imamlıq səviyyəsinə yüksəlincəyə qədər elm aldı və təqribən h.1264-ci ildə Nəcdə geri dönməyə qərar verdi. Ora geri dönüncə Riyada İmam Faysal ibni İmam Turkinin və atası Şeyx Abdurrahman ibni Həsənin yanına getdi. Atası artıq 23 il bundan öncə oraya yerləşmişdi. Riyadda bir neçə ay qaldı və elm, təlim-tədris işləri ilə fəaliyyət göstərdikdən sonra İmam Faysal və atası Şeyx Abdurrahman ibni Həsən onun elmi fərasətinə və bacarığına şahid oldular və onu Əhsaya şəri elmi nümayəndə kimi göndərmək qərarına gəldilər. Şeyx Abdullatif h.1264-h.1267-ci illər ərzində Əhsada təlim, islah və dəvət işləri ilə məşğul olduqdan sonra Riyada dönməyə qərar vedi və dəvət işlərini orada davam etdirdi.

Şeyxdən bir çox insan dərs alır və onun elmindən, fərasətindən faydalanır. Şeyxin tələbələrindən,
- Şeyxin öz oğlu **Şeyx Abdullah ibni Şeyx Abdullatif,**
- Şeyxin öz oğlu **Şeyx Muhəmməd ibni Şeyx Abdullatif,**
- Şeyxin qardaşı **Şeyx İshaq ibni Şeyx Abdurrahman ibni Həsən aluş-şeyx,**
- Fəqih **Şeyx Həsən ibni Hüseyn ibni Əli ibni Şeyx Hüseyn aluş-şeyx,**
- Məşhur İmam **Şeyx Süleyman ibni Sahman,**
- **Şeyx Həmd ibni Faris** ondan nəhv elmindən dərs almışdır və o, Nəcdin nəhv elmində ən bilgili alimlərindən idi,
- Fəqih **Şeyx Muhəmməd ibni İbrahim ibni Mahmud,**
- **Şeyx Abdurrahman ibni Abdulməlik aluş-şeyx,**
- **Şeyx Sa′b ibni Abdullah ət-Tuveyciri,**
- **Şeyx Abdurrahman ibni Mani′,**
- **Şeyx Muhəmməd ibni Abdullah ibni Səlim,**
- **Şeyx Muhəmməd ibni Umar ibni Səlim,**
- **Şeyx Abdullah ibni Mufəddə,**
- **Şaqra əhlindən Şeyx Əli ibni İ′sa,**
- Əhsanın hakimlərindən **Şeyx Abdurrahman əl-Vuheybi,**
- Muhəqqiq alim **Şeyx Əhməd ibni İbrahim ibni İ′sa** və daha çox alim və şeyxlər ondan elm almışlar.

Şeyx Abdullatif bir çox əsərlər və risalələr yazmışdır. Onlardan,
- *“Minhacut-Təsisi vət-təqdis fi raddi alə ibni Cərcis”,*
- *“Tuhfətut-talib vəl-cəlis fi raddi alə ibni Cərcis”* - bu iki kitabı Bağdadın azdırıcı cəhmiyyə alimlərindən Davud ibni Süleyman ibni Cərcisə qarşı yazmışdır.
- “*Misabahuz-Zallam fi raddi alə mən kəzibə alə şeyxil-islam”* – azdırıcı cəhmiyyə alimlərindən **Osman ibni Mansurun** *“Cəlaul-ğummə an təkfiri həzihil ummə”* adlı kitabına rəddiyə olaraq yazmış və orada Osman ibni Mansurun **Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhab** haqqındakı yalan və iftiralarına cavab vermişdir.
- *“əl-Bərahinul-İslamiyyə fi raddi alə əş-şubuhatil-farisiyyə”*
- *“əl-İthaf fi raddi alə əs-Sihaf”*- Bəhreynin qazisi **Abdullatif ibni Abdulmuhsin əs-Sihaf əl-Malikiyə** qarşı yazmışdır. O, Şeyxül-islam Muhəmməd İbni Abdulvəhhabın dəvətinə qarşı çıxanlardan idi.
- *“Muqaddimətu li şərhi Nuniyyəti İbnil Qayyim”*- **İbnul Qayyimin** *“ən-Nuniyyə”*-sini şərh etməyə başlamış, sadəcə müqəddiməsini şərh edə bilmişdir. Şərh tamamlanmadan öncə ölüm onu yaxalamışdı.
- Bunlarla yanaşı şeyxin bir çox fətva və risalələri mövcuddur. Onları nəcd alimlərinin fətva və risalələrinin toplandığı kitablarda tapmaq mümkündür.

Şeyx Abdullatif ibni Abdurrahman h.1292-ci ildə (m.1876) Riyad şəhərində vəfat etmişdir, geriyə 8 oğul buraxdığı bilinməkdədir. Onlar: Əhməd, Şeyx Abdullah, Abdulaziz, Şeyx Muhəmməd, Şeyx İbrahim, Şeyx Ömər, Saleh və Şeyx Abdurrahman. Bunlardan, sadəcə Əhməd Misirdə doğulmuşdur, atası oranı tərk etmək istədiyində o, orada qalmağa qərar verdi və vəfat edənə kimi orada qaldı. Digər övladları isə Riyadda doğulmuş və orada böyümüşlər. Allah azzə və cəllə şeyxin zürriyətinə bərəkət verir və övladlarından çoxlu nəvələri olur. Onların çoxu da elm və dəvət işləri ilə məşğul olan saleh kimsələr idi. Allah rəhmət eləsin! *(T.e)*

Həmçinin onun bu məsələdə *“əd-Durərus-Səniyyə”*-də və *“Məcmuu'r-Rəsail”*-də mövcud olan risalələri də var, biz inşəallah onlardan bəzi alıntıları qeyd edəcəyik:

**- 2) Şeyx Abdullatif ibni Abdurrahman** demişdir:

***“Hər kimdən onun küfrünü və ya şirkini və ya fisqini gərəkdirən bir söz və ya fe'l ortaya çıxarsa, - o kimsə iki şəhadəti iqrar etsə də -ona bunun gərəktirdiyi şey ilə hökm ediləcəyində elm və iman əhli ixtilaf etməmişdir.”*** *“ər- Rəsail vəl Məsail, 3/225”*

**- 3) Şeyx Abdullatif** *“əd-Durərus-Səniyyə, 12/260, 265”* -da demişdir:

***“Bu ümmətdən birisini təkfir edən kimsə əgər onun təkfirində Allahın Kitabından və nəbisi (səllallahu aleyhi vəsəlləm)-in sünnəsindən olan bir nassa və bürhana dayanarsa və Allaha şirk qoşmaq, Ondan başqasına ibadət etmək, Allah ilə və ya ayələri ilə və ya rəsulu ilə istehza etmək kimi və ya onları yalanlamaq kimi və ya Allahın hidayət və haqq dindən nazil etdiyini xoş görməmək kimi və ya Allah cəllə cəlaluhu təalanın sifətlərini inkar ermək kimi açıq küfr görərsə, o zaman təkfir edən kəs isabət edərək əcrini almışdır, Allaha və rəsuluna itaət etmişdir...”***

Və davam edərək demişdir: ***“Bu əsllərin tərkinə və onlara imanın olmamasına görə təkfir etmək, İslam dinini öyrənməyə həvəsli olan hər kəsin bildiyi dinin ən böyük dirəklərindəndir.”***

Və davam edərək demişdir: ***“(İmam) Qadinin Malikdən xəvariclər barəsindəki hədisi (onların təkfirinə) aid etməsinə dair nəql etdiyi söz, İmam Əhməddən xəvariclərin təkfirinə dair olan iki rəvayətdən birisinə uyğundur və bu görüşü səhabə və onlardan başqalarından ibarət bir tayfa da seçmişdir. Çünki onlar səhabələrin çoxunu təkfir etmişlər və mallarını halal saymışlar. Onlar bunu Allaha yaxınlaşmaq niyyəti ilə etmişlər və onların batil təvilləri üzrlü sayılmamışdır. Lakin fəqihlərin əksəriyyəti təvilləri səbəbi ilə onların təkfir olunmadığı görüşündədir. Deimişlər ki: "kim heç bir şübhə və təvil olmadan məsumların öldürülməsini və mallarının alınmasını halal sayarsa kafir olar. Əgər onların halal saymaları xəvariclər kimi təviləri səbəbi ilə olarsa kafir olmazlar." ”***

**- 4) Şeyx Abdullatif** *“Minhacut-Tə'sis, 315”* -də demişdir:

***“İki şeyxin (İbni Teymiyyə və İbnul Qayyimin) hər yerdə (dedikləri) sözlərində aşkar bir açıqlama var ki, sözlü və fe'li küfrləri işləyənlərin təkfirinin nəfyi dəlili gizli qalan və failinin üzərinə hüccətin iqamə edilmədiyi məsələlərdədir. Belə ki, nəfy ilə hüccətdən öncə failinin təkfiri və cəzalandırılmasının nəfy edilməsi qəsd edilir və təkfirin nəfy edilməsi ümmət arasında mübahisə olunan məsələlərə məxsusdur. Amma salehlərə dua etmək, sıxıntılı və şiddətli anlarda onları çağırmaq və onlarla istiğasə etmək isə, bunların haram olması və böyük şirkdən olması***

***barəsində heç bir müsəlman mübahisə etməz.[188] Daha öncə şeyxin (İbni Teymiyyənin) onun failinin tövbəyə çağırılması və tövbə etməzsə öldürülmsinə dair sözü keçdi."***

**- 5) Şeyx Abdullatif** *"Minhacut-Tə'sis, 320"* -də demişdir:

***"Axı, necə iki şeyx (İbni Teymiyyə və İbnul Qayyim) heç kimə küfr və şirklə hökm vermir?! Allah və rəsulu, elm əhlinin hamısı[189] bir yerdə buna hökm vermişdir və bu iki şeyx də küfrü, riddəti və şirki vacib edən bir şeyi işləyən kimsəyə bunun gərəktirdiyi ilə hökm verirlər. Həmin hökmün işlədilməsinə mane olan şəri bir əngəl olduğu zaman küfrü və ya şirki və ya fisqi işləyənə hökm verməmişlər. Bunun üçün isə xüsusi hallar var ki, bütə və ya qəbrə və ya bəşərə və ya daş-kəsəyə ibadət edən kimsə bürhanın açıq olması və hüccətin elçilər vasitəsi ilə qaim olmasından dolayı bunlara daxil deyil."***

## Şeyx İshaq ibni Abdurrahmanın[190] sözlərindən nəqllər:

[188] Şeyxin İbni Teymiyyənin və İbnul Qayyimin sözlərini necə fəhm etdiyinə bax! Hətta icma nəql edərək heç kimin bunda mübahisə etmədiyini bildirir.

[189] Onun alimlərin hamısından etdiyi nəqlə bax! Bütə və ya bəşərə ibadət edən kimsə - necə ki, o demişdir- heç vaxt cəhaləti ilə üzrlü olmaz. *(T.e)*

[190] O, **Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhabın** nəvəsi **Şeyx Abdurrahman ibni Həsənin** oğlu və **Şeyx Abdullatif ibni Abdurrahmanın** qardaşıdır, **Əbu Abdurrahman** künyəsi ilə tanınmışdır. Allamə mühəddis **Şeyx İshaq ibni Abdurrahman** h.1276 (m.1859) cı ildə Riyadda doğulmuşdur. Orada saleh və elmlə dolu bir mühitdə böyümüşdür. Atası Şeyx Abdurrahman hələ uşaq vaxtında onun qəlbini elmə açması üçün qayğı göstərdi və o, təmyiz yaşına çatdığında artıq Quranı oxuyub xətm etmiş və sonra da onu hifz etməyə başlamışdı. Şeyx elm tələbinə uşaq yaşlarında başladı, ilk öncə Nəcdin tanınmış alimlərindən faydalandı, daha sonra isə Hindistana, Misirə elm ardınca yola çıxdı. Nəcd alimlərindən,

- ilk öncə qardaşı **Şeyx Abdullatifdən** və qardaşı oğlu **Şeyx Abdullah ibni Abdullatifdən** dərs aldı. Daha sonra isə,
- **Şeyx Həmd ibni Atiq**,
- Fəqih **Şeyx Muhəmməd ibni Mahmud,**
- Xatib və vaiz şeyx **Abdullah ibni Hüseyn əl-Maxdub** və
- **Şeyx Abdulaziz ibni Saleh ibni Mürşiddən** dərs almışdı.

Atası şeyx Abdurrahmanın vəfatından sonra h.1309-cu ildə Hindistana elm dalınca getdi və orada dörd il qaldı. Hindistanın böyük hədis alimlərindən dərs aldı. Bunlardan,

- **Allamə Muhammməd Nazir Hüseyn əd-Dəhləvi.** Onun yanında *"Nuxbətul Fikər"*-i şərh ilə bərilikdə əzbərlədi, *Buxari-Müslimi* və *Kutubu-Sittəni* oxudu, həm qiraət və də eşitmə yolu ilə şeyxindən icazət aldı. Şeyx əd-Dəhləvi yazdığı icazətdə bu cür demişdir:

*"Yanımda "**Kutubu-Sittə", İmam Malikin "Muvatta" –sını, "Buluğul Məra'm", "Muşkatul Məsabih", "Təfsiru Cəlaleyn"** və **"Şərhu Nuxbətul Fikər"**-i oxudu. Bu kitabları oxutması və öyrətməsi onun üzərinə vacibdir. O, həqiqətən bunun əhlidir və mötəbər şərtlər ilə bunu haqq edir"* (Bax: **Suleyman ibni Hamdan**- *"Təracimu mutəxxiri əl-hənəbilə,s.100"*)

Daha sonra isə,

- **Şeyx Hüseyn ibni Muhsin əl-Ənsari**,
- **Şeyx Muhəmməd Bəşir əs-Səhsavani,**
- **əl-Məvləvi Salamətullah əl-Ciracfuri** – **İbni Macənin** *"Sünən"*- və digər hədis kitablarını oxudu və icazət aldı. Bunlar kimi bir çox alim və mühəddislərin yanında elm almışdı.

Sonra isə Şeyx İshaq Misirə gedir və təxminən h.1315-ci ilə qədər orada qaldı. Orada olduğu müddətdə ərzində əzhərin böyük şeyxlərinin yanında elmini davam etdirdi. Misirdən sonra şeyx Riyada

- **1)** Onun cəhalətin üzrlü olmaması və böyük şirkdə (söylənən) söz ilə onu söyləyənin arasını ayırmağın sonradan ortaya çıxarılmış bir bidət olması barədə yazdığı *"Müəyyən Təkfir"* adlı böyük risaləsi var. Burada ondan nəql olunan bütün nəqllər həmin risalədəndir.

Şeyx yaşadığı dövrdə Əhsa əhlindən cəhaləti üzrlü sayan və özlərini Şeyx Muhəmməd ibni Abdulvəhhabın yoluna nisbət edən bir qrup tərəfindən imtahan olunmuşdur. Onlara nə Şeyx Muhəmmədin, nə İbni Teymiyyənin, nə İbnul Qayyimin, nə dəki onlardan başqa sələfdən heç kimin yolu üzərində olmadıqlarını açıqlamış və bu barədə bir çox icma nəql etmişdir.

- **2) Şeyx İshaq ibni Abdurrahmanın** müəyyən təkfirin hökmü barəsindəki risaləsindən:

Demişdir ki:

***"Bizə çatdı və eşitdik ki, elm və din iddiasında olan və öz zənninə görə Şeyx Muhəmməd ibni Abduvəhhabı özünə örnək alan bir qrup: "Kim Allaha şirk qoşarsa və bütlərə ibadət edərsə onun üzərinə müəyyən olaraq küfr və şirk ismi işlədilməz."[191]Bu, onlardan bəziləri ilə danışdığım zaman eşitdiyim sözlərdir. Onlardan kimsə qardaşlarımızdan bəzisinin Allah Rəsulu səllallahu aleyhi və***

---

qayıtdı və orada təlim-tədris, dəvət işləri ilə məşğul oldu. Allah azzə və cəllə onun elmi ilə bir çox insanları bərəkətləndirdi və şeyxin əli ilə bir çox tələbə yetişdirdi. Bunlardan,
- **Şeyx İbrahim ibni Abdullatif aluş-şeyx,**
- **Şeyx Abdullah əl-A′nqari,**
- **Şeyx Abdullah ibni Faysal,**
- **Şeyx Falih ibni Sağir,**
- **Şeyx Salim əl-Hanaki,**
- **Şeyx Abdulaziz ibni A′tiq,**
- **Şeyx Şeyx Abdurrahman ibni Davud,**
- **Şeyx Favzan əs-Sabiq** və
- **Şeyx Saleh ibni Osman əl-Qadi** və s.

Şeyx İshaq bir çox risalə və əsərlər təlif etmişdir. Onlardan,
- *"əl-Ucvubətus-Səiyyət li hallil-əsilətir-ravafiyyət"*,
- *"İzahul-məhəccəti vəs-səbil və iqamətil-huccəti vəd-dəlil"*,
-*"Məsələtu əl-uzri bil cəhl fiş-şirkil-əkbər"*,
- *"Təkfirul Muayyən vəl-farqu beynə qiyamil-huccəti və fəhmil-huccə"*,
- *"Nabzatu nəfsiyyə fi haqiqati davatiş-Şeyx Muhamməd bin Abdulvəhhab"*,
- *"Risalatu fi haqiqatid-dua"*,
- *"Risalatu an aqidati əhlis-sunnəti fi əsmaiilləhi və sifatihi"*,
- *"əl-Urcuzatul-mufidə fi məsəilit-təvhid"* və bir çox fətva və risalələrə sahibdir, onları nəcd ulemasının fətvalarının toplandığı kitablardan əldə etmək mümkündür.

Şeyx geriyə iki oğlan: Abdurrahman və Muhəmməd və bir qız övladı buraxdı. Muhəmməd atasının vəfatından bir neçə il sonra dünyasını dəyişmişdi. Abdurrahman isə onun böyük oğlu idi və elm tələbi ilə məşğul idi. O, əmr bil maruf və nəhy anil munkər heyətinin rəisi idi. Onun Muhəmməd adlı oğlu da atası və babası kimi alim və imam idi.

Şeyx İshaq ibni Abdurraahman h.1319-cu ildə Riyad şəhərində vəfat etmişdir. Allah rəhmət eləsin! *(T.e)*

[191] Bu söz cəhalətin üzrlü olmaması barəsində çox açıq bir ifadədir. Bu açıqlıqdan sonra daha izaha ehtiyac qalırmı?

***səlləmə dua edən və onunla istiğasə edən kimsənn üzərinə şirk və küfr sözünü işlətdiyini eşitdi və bir nəfər ona dedi ki: "o adama bildirincəyə kimi üzərinə küfr sözünü işlətmə""*** *"Fətava Əimmətil Nəcdiyyə, 3/116"*

**- 3)** Həmçinin kitabında demişdir:

***"İşarə etdiklərimdən bəzisi ilə bu məsələdə bəhs etdim və mənə dedi ki: Bu türbələrə və içindəkilərə ibadət edənlərə deyirik ki, sizin bu fe'liniz şirkdir. Lakin o müşrik deyil "***[192]

Bu sözün bidət olduğunu bildirdi. Sonra isə bu cür dedi:

***"Bu barədə mənə danışan dedi ki, o, bəzi tələbələrdən bu söz və onun dayanağı (dəlili, sənədi) barəsində soruşdu və o demişdir:***

***"(Əməlin) növünü təkfir edirik və müəyyən şəxs barəsində isə yalnız ona bildirdikdən sonra (bunu) tətbiq edirik. Bunu Şeyx Muhəmmədin (Allah ruhunu pak etsin!) bəzi risalələrindən gördüklərimizə dayanaraq edirik. Belə ki, o, Kəvvazın türbəsinə və Abdulqadirin qəbrinə ibadət edənlərin cahil olmaları və onları xəbərdar edənin olmaması səbəbiylə onların təkfirindən imtina etmişdir"”***

**Şeyx İshaq** bu batil sözü, inkar etmək surəti ilə qeyd etmişdir.

**- 4)** ***"Bizim bu məsələmiz, hansı ki o, heç bir şəriki olmadan sadəcə Allaha ibadət etmək, Ondan qeyrisinə olan ibadətdən bəri olmaqdır, Allah ilə yanaşı başqasına ibadət edən kimsə dindən çıxaran böyük şirk işləmişdir. Bu məsələ, əsllərin əslidir, rəsullar bununla göndərilmişdir, kitablar nazil edilmiş və hüccət insanlara rəsul (səllallahu aleyhi vəsəlləm) və Quran vasitəsi ilə çatmışdır. Beləcə, sən din imamlarının bu əsldəki cavabını Allaha şərik qoşan kimsənin təkfiri olaraq görərsən. O kimsə tövbəyə çağırılar, əgər tövbə etməzsə öldürülər. Onlar əsli olan məsələlər də bildirməyi***[193] ***qeyd etməzlər.***[194] ***Bunu yalnız, dəlilinin bəzi müsəlmanlara gizli qaldığı xəfi məsələlərdə bildirməyi qeyd etmişlər. Məsələn, Qədəriyyələr və Murciələr kimi bəzi bidət əhlinin çəkişdiyi məsələlərdə və ya sarf və atf kimi xəfi məsələlərdə. Axı, necə qəbrpərəstlərə bildirməyi (yəni hüccəti) şərt qoşsunlar?! Onlar müsəlman deyillər***[195] ***və İslam məfhumunun içərisinə daxil deyillər. Heç şirklə yanaşı (saleh) əməl qalarmı?!"***

---

[192] Bu və ondan sonra gələn sözə diqqət et! Onun bidət olduğunu bildirdi.

[193] Yəni hüccəti bildirməyi. Burada bildirmək sözü ilə hüccətin iqamə edilməsi qəsd olunur və bu söz risalədə çox təkrarlanır. *(T.e)*

[194] (Hüccəti) bildirməyin (şərt qoşulmasının) əsl olan məsələlərdə olmadığını alimlərə nisbət etməyinə diqqət et!

[195] Bu, Qəbrpərəstlərin müsəlman olmadığı və cəhalətlərinin üzrlü sayılmadığı barədə özündən sonra heç bir açıqlığın olmadığı açıq bir ifadədir.

**- 5)** Və demişdir: ***“ «Kim Allaha ortaq qoşarsa əməli boşa gedər»*** [196] ***və bu kimi bir çox ayələrdə Allahu təala (şirkin əməlləri puç etdiyini) buyurmuşdur. Lakin bu etiqad çirkin bir etiqadı gərəkdirir, o da: "bu ümmətin üzərinə rəsul və Quran vasitəsi ilə hüccət qaim olmamışdır." Kitabı və rəsulu unutdurmağı gərəkdirən belə bir pis anlayışdan Allaha sığınırıq!”***

**-6)** Və demişdir: ***“Qeyd etdiyimiz şübhənin bənzəri və ya ondan başqası Şeyx Muhəmməd (rahiməhulah)-ın zamanında insanlara bulaşmışdır. Lakin kimə bulaşdısa onu şübhə olaraq görər və ortadan qaldırılmasını istəyərdi. Ancaq qeyd etdiyimiz kimsələr bunu əsl olaraq təyin edər və müşriklərin hamısına (hüccətin) bildirilməsi (şərti) ilə hökm verirlər və onlara müxalif olanları cahil sayarlar, beləcə doğruya müvafiq olmurlar”***

**-7)** Və demişdir: ***“Onun*** [197] ***həmin alimlərin təkfiri və Yusufun qəbri üzərindəki bütə ibadət edənlərin küfrü barəsindəki sözü üzərində düşün! Bu, İbnul Qayyimin (rahiməhullah) sözündə və onun məktubun sahibi barəsində anlatdığı sözündə açıqdır. Həmin şəxs barəsində münafiqlər haqqında (enən) ayələr ilə hökm verdi və bu hökm ümumidir.”***

Və demişdir: ***“O*** [198] ***demişdir: "Sonra isə, onların başçılarından çoxunun bu (küfr) növlərinə düşdüyünü və mürtəd olduqlarını görərsən. Onların çoxu bəzən açıq bir***

---

[196] Hər halda şeyx iki ayəni bir-biri ilə qarışdırmışdır. Birinci ayə Maidə surəsi 5-ci ayədəki ***“İmanı inkar edənin əməlləri boşa çıxar”***, ikincisi isə Maidə surəsinin 72-ci ayəsidir ***“Həqiqətən də Allaha şərik qoşan kimsəyə Allah cənnəti haram etmişdir”*** *(T.e)*

[197] Yəni Şeyx Muhəmməd ibni Abduvəhhabı qəsd edir. Şeyx İshaq *“Təkfirul Muəyyən”* risaləsində Şeyx Muhəmməd ibni Abdulvəhhabın əl-Əhsanın alimlərindən biri olan Əhməd ibni Abdulkərimə yazdığı məktubdan sitatlar gətirir. Həmin məktub *“Tarixun-Nəcd*, s. 346-də mövcuddur və bununla bağlı kitabımızın 4-cü fəslində 9-cu nəqldə bəhs edilir.

Əhməd ibni Abdulkərim daha öncələri haqqa tabe olan saleh birisi idi. Sonra isə müəyyən təkfirlə bağlı şübhələrə düşərək haqqdan azmışdır. Onun şübhəyə düşməsinə səbəb İbni Teymiyyənin və İbnul Qayyimin müəyyən təkfirin olmaması ilə bağlı bəzi sözlərini yanlış anlamasıdır. Öncə bu problemi ortadan qaldırması üçün Şeyx Muhəmmədə məktub yazıb ondan açıqlama istədi, sonra isə daha bir məktub yazaraq Şeyxin (yəni İbni Teymiyyənin) bəzi sözlərinə agah olduğunu və problemin ortadan qalxdığını bildirir. Əslində isə hüccətdən öncə müəyyən təkfirin olmaycağı ilə bağlı İbni Teymiyyənin sözləri xəfi məsələlər ilə bağlıdır. Şeyx Muhhəməd ibni Abdulvəhhab ona yazdığı məktubunda təəccüblənərək bu cür deyir:

***“Onun (yəni İbni Teymiyyənin) sözü hansı şeylə Lata və Uzzaya ibadətdən daha böyük olan bütlərə ibadət edənin və şəhadət etdikdən sonra Əbu Cəhlin söyməsi kimi rəsulun dininə söyən kimsənin müəyyən olaraq kafir olmayacağına dəlalət edir?! Əksinə ifadə İbni Feyruz və Saleh ibni Abdullah kimi dindən açıq küfrlə çıxanların təkfirinə dair açıq və aydındır, üstəlik onlardan başqalarına dair də.. Bu sənin qeyd etdiyin İbnul Qayyimin sözündə və səndəki problemi ortadan qaldıran Şeyxin (yəni İbni Teymiyyənin) sözündə də açıqdır. Hansı ki, o Yusufun qəbri üzərindəki bütə və bənzərilərinə sıxıntılı və rahatlıq anlarında ibadət edənin, rəsulu qəbul etdikdən sonra ona söyənin və (kəliməi şəhadəti) qəbul etdikdən sonra bütlərə ibadəti özünə din edən kimsələrin küfrü barəsindədir. Mənim bu sözümdə cürətkarlılıq yoxdur, əksinə sən də onlara qarşı bununla şahidlik edirsən. Allah bir qəlbi kor edərsə, onda çarə yoxdur və mən sənin üçün Allahın bu sözündən qorxuram: “Bu ona görədir ki, onlar iman gətirdikdən sonra kafir oldular. Sonra da onların qəlbinə möhür vuruldu. Artıq onlar anlamırlar.” (Munafiqun,3)***

Şeyx burada məktubu ünvanladığı şəxsin imanından sonra küfrə düşməsindən qorxaraq münafiqlər barəsində enən ayəti ona aid edir. *(T.e)*

[198] Yəni İbni Teymiyyə (rahiməhullah) demişdir. Burada onun sözünü nəql edir. *(T.e)*

***riddətlə İslamdan çıxır." Və davam edərək demişdir: "Bundan daha böyüyü isə onlardan riddət mövzusunda[199] əsərlər yazanların olmasıdır. Necə ki, ər-Razi ulduzlara ibadət mövzusunda əsər yazıb və bu müsəlmanların ittifaqı ilə İslamdan çıxmaqdır."***

(Yəni (İbni Teymiyyə) onu təvili səbəbi ilə üzrlü saymadı. Əhkamlarda təvil cəhalət kimidir, həttа cahildən başqası təvil etməz.)

**- 8)** Və demişdir : ***"Sonra Şeyxül-islamın onlar haqqında küfr hökmünü verməsi üzərində düşün! Məgər belə bir söz dedimi ki: "Onlar bildirilincəyə qədər kafir olmazlar və yaxud müşrik adlandırılmazlar"[200] - Əksinə onların əməlləri şirkdir[201].- Nəcə ki, bizim işarə etdiyimiz şəxs bu cür demişdir."***

**- 9)** Və demişdir: ***"Sonra şeyxin Şeyxül-islamdan kəlam əhli və bənzəriləri barəsindəki sözünü anlatması üzərində düşün: "Əgər xəfi olan sözlərdə olarsa, bu cürdür. O zaman deyilər ki, tərkinin kafir olduğu hüccətin çatmadığı kimsə ona bildirilincəyə kimi azmış bir xətakar adlanar. Lakin zahir olan işlərdə bu belə olmaz" Sonra ilə davam edərək demişdir: "Yəhudilər, nəsranilər və müşriklər (belə) Muhəmmədin (səllallahu aleyhi vəlləm) onunla göndərildiyini və buna qarşı çıxanı təkfir etdiyini bilirlər: Yalnız Allaha ibadət edib, Ona heç bir şeyi ortaq qoşmamağı əmr etməsi və Ondan başqa peyğəmbərlərdən və mələklərdən olan kimsəyə ibadət etməkdən çəkindirməsi kimi... Sonra görürsən ki, onların başçılarından çoxu bu növ (küfrlərə) düşürlər və mürtəd olurlar" Sonra isə Şeyx (yəni Muhəmməd bin Abdulvəhhab) davam edərək demişdir: "Onun (yəni İbni Teymiyyənin) xəfi olan sözlər ilə bizim içərisində olduğumuz (mövzu) müəyyən küfr arasındakı ayırım barədəki sözü üzərində düşün! Və onların başçılarını təkfir etməsi üzərində düşün! Burada dur və Şeyxin necə dediyi barədə düşün!""*** [202]

Sonra isə davam edərək demişdir: ***"Şeyx Suleyman ibni Abdullah[203] (rahiməhullah) "Kitabut-Tövhid"-in şərhində bir çox yerdə demişdir. Bunlardan:***

---

[199] Yəni onları riddətə salan əsərlər *(T.e)*

[200] İbni Teymiyyənin sözündə buna diqqət et! Hansı ki, o şirk işləyənin müşrik adlandırılmasıdır.

[201] Yəni İbni Teymiyyə onlar barəsində bu cür demədi, əksinə onların əməllərinin şirk olduğunu bildirdi. Kimin əməlləri şirk olarsa, o, hüccətdən öncə də müsəlman deyil müşrik adlandırılar. İbni Teymiyyənin mənhəci də bu cürdür *(T.e)*

[202] Buraya qədər anlatdıqları Şeyx Muhəmməd bin Abdulvəhhabın Əhməd bin Abdulkərimə yazdığı məktubundan gətirdiyi nəqllər idi. *(T.e)*

[203] O, **Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhabın** nəvəsi, *"Təysirul-a'zizil həmid"* adlı kitabın müəllifidir. H.1200-ci ildə (m.1785) Diri'yyədə anadan olmuşdu. Həmin illərdə Diri'yyə elmin çiçəkləndiyi dövrü yaşayırdı və şeyx elmlə çevrələnmiş bir mühitdə böyüdü. Uşaq yaşlarında Quranı əzbərlədi və bir çox alimlərdən dərs aldı. Onlardan,
- Atası **Şeyx Abdullah ibni Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhab,**
- **Şeyx Hamd ibni Nasir ibni Osman ibni Mua'mmər,**
- *"Neylul Əvtar"*-ın sahibi **Şeyx Muhəmməd ibni Əli əş-Şəvkani** ona hədis kitablarından rəvayətə dair icazət verib.
- **Şeyx Abdullah ibni Fazil,**
- **Şeyx Muhəmməd ibni Əli ibni Ğarib,**

***"Kim tövhid kəliməsini deyər, namaz qılar və zəkat verər, lakin salehlərə dua etmək, onlarla istağasə etmək və onlara qurban kəsmək kimi əməlləri və sözləri ilə buna (yəni tövhid kəliməsinə) müxalif olarsa, həmin kimsə tövhid kəliməsini söyləyən və ona müxalif olan yəhudi və nəsranilərə bənzəyir."***

***Bunun üzərinə, "şirk qoşanlara (hüccəti) bildirmədən (təkfir olunmazlar")[204] deyənlərin tövhid kəliməsini söyləyib və ona müxalif olmalarına görə yəhudi və nəsranilərə də bildirməyin gərəkdiyini, bildirmədən onları təkfir etmədiklərini - deməlәri gərəkir. Bu etibarla, onların sözlərinin bunu gərəktirməsi çox açıqdır."***

**- 10)** Və demişdir: ***"O, (yəni əl-İraqi)[205] əsl istənilən (məsələni) əksildir və onu əhli sünnə vəl camaaat ilə xəvariclər, rafizilər arasındakı çəkişməli və ixtilaflı məsələlərdəki təkfirdən hesab etdi. Hansı ki, onlar əhli sünnəni və müsəlmanları özlərinin bidət olaraq ortaya çıxartdıqları, təməl olaraq qoyduqları, özlərinə məzhəb təyin etdikləri və mənimsədikləri şeylərdə onlara qarşı çıxdıqlarına görə təkfir etmişlər. O, bunu qəbr əhlinə dua etmənin və onlarla istiğasə etmənin bu babdan olmadığının deyilməsindən qorxduğu üçün sözündə əksiltmişdir. Bu, mövzuda müsəlmanlar çəkişməmişlər, əksinə onun küfrə düşürən şirk olması üzərində icma***

---

- **Şeyx Hüseyn ibni Ğannam,**
- **Şeyx Abdurrahman ibni Xumeyyis** və başqaları.

Şeyx Süleyman dərin elmə və iti zəkaya sahib birisi idi. Bir çox insan onun elmindən faydalanıb. Təəssüf ki, şeyxin tələbələrinin adlarının qeyd olunduğu bir mənbəyə rast gəlinmir.

Şeyx bir çox faydalı əsərlər təlif etmişdir. Bulardan,

1) - *"Təysirul-azizil-həmid şərhi kitabut-tövhid"*- babası Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhabın *"Kitabut-Tövhid"* kitabının şərhidir.

2) - *"əd-Dəlailu fi a'dami muvalati əhliş-şirk"* – Osmanlı Türk dövlətinin küfrünü və onlarla birlikdə müsəlmanlara qarşı əlbir olmanın küfründən bəhs edir.

3) - *"Risalətu fi bəyani təaddudil-cuma'"*

4) - *"ət-Tavdihu an təvhidil-xalaiqi fi cavabi əhlil-İ'raq"*- Süleyman Paşa məscidinin xatibi **Abdullah Əfəndi ər-Raviyə** rəddiyədir.

5) – **İbni Qudamə əl-Maqdisinin** *"əl-Muqni'"*- kitabına 3 cilddən ibarət haşiyəsi var.

Bunlardan əlavə bir çox fətva və risalələri var ki, onları nəcd alimlərinin fətva və risalələrinin toplandığı mənbələrdən əldə etmək mümkündür.

Şeyx dininə çox bağlı olan, halal və haramlara riaəyət edən, yaxşılığı əmr edib pislikdən çəkindirməyə həris olan və dini qeyrəti şiddətli olan birisi idi. H.1233-cü ildə (m.1818) ildə İbrahim Paşa Diri'yyəni işğal edərkən bəzi xain münafiqlər şeyxi ona xəbərləyir. Ibrahim Paşa da Şeyx Süleymanı yanına çağırtdırır və onunla danışır. Şeyxin mərdliyini və dinə bağlılığını görür, onu özündən çıxartması üçün çalğı və musiqi alətlərini gətizdirib gözünün qabağında mahnı çaldırıb-oxutdurur. İbrahim Paşa Hicaz və Nəcd savaşına gələrkən özü ilə birlikdə müğənnilər və çoxlu musiqi alətləri də gətizdirmişdi. Hətta deyilən görə yanında Allaha və axirət gününə iman etməyən bəzi fransız zabitləri də var idi. Şeyxə acıq olaraq, onun qarşısında müğənnilərə mahnılar oxutdurub, musiqi alətləri çaldırtdıqdan sonra onu qəbristanlığa aparırlar və İbrahim paşanın əmri ilə əsgərlər tüfənglərindən atəş açaraq şeyxin cəsədini parçalayırlar. Beləliklə də, Allah azzə və cəllə Şeyx Süleyman ibni Abdulvəhhabı şəhadət zirvəsi ilə ruziləndirir. Allah rəhmət eləsin! *(T.e)*

[204] Bu susdurucu gərəkçəyə diqqət yetir!

[205] O, **Davud ibni Cərcisdir**, **Şeyx Abdullatif** *"Minhacut-Təsis"* kitabında ona cavab verir. Burada **Şeyx İshaq əl-İraqinin**: ***"Siz iki Haram bölgəsini və əhlini təkfir etdiniz"*** sözü üzərinə **Şeyx Abdullatifin** cavabını qeyd edir. əl-İraqi ixtilaflı məsələlərdə ictihad xətasının müsəlmanların təkfirinin əngəllərindən biri olduğunu deyir və isabət edənin iki əcir, xəta edənin isə bir əcir aldığına dair **İbni Teymiyyənin** *"Məcmuul fətava, 35/103"* -dəki sözünü qeyd edir. Lakin əl-İraqi qəbrlərə dua etməni, onlardan yardım istəməni həmin ixtilaflı məsələlərdən istisna etmir və İbni Teymiyyənin sözünü təhrif edərək dolayısı ilə bu mövzunu da müsəlmanların ixtilaf etdiyi məsələlərə daxil edir. *(T.e)*

***edilmişdir[206], necə ki, bunu Şeyxül-islam İbni Teymiyyə anlatmışdır və onu, təkfirində ixtilaf olmayan məsələlərdən saymışdır. Onun buradakı sözünü (alıb) qəti şəkildə bildirdiyi üzərində icma edilmiş küfrlərə aid etmək doğru olmaz. Əgər əl-İraqinin bunu etməsi doğru (bir şey) olsaydı onun sözü[207] ziddiyyətli olardı. Allahu təala onu bundan uzaq tutmuş və qorumuşdur. Onun sözləri bir-birinə şahidlik edərək ittifaq halındadır.***

***Sonra yenə (İbni Teymiyyə) demişdir: "Kim hər hansı bir bəşər haqqında onun ilah olduğuna etiqad edərsə və ya hər hansı bir ölüyə dua edər və ondan ruzi, kömək və hidayət istəyərsə, ona təvəkkül edər və səcdə edərsə, həmin kimsə tövbəyə çağırılar. Əgər tövbə etməzsə boynu burular" "[208] [209]***

Və (Şeyx İshaq) dedi: ***"Beləcə əl-İraqinin (İbni Teymiyyənin adından onun sözünü) dəlil (kimi) gətirməsi batil oldu və təməlindən çökdü. Axı, salehlərə dua edən, Allah ilə yanaşı onlarla istiğasə edən, sadəcə Allahın haqq etdiyi ibadətləri onlara sərf edən kimsələri müsəlmanların təkfirinə olan qadağanın içərisinə necə daxil edir ?! Bu, Kitab və Sünnənin nassları və ümmətin alimlərinin icması ilə batildir." Və demişdir: "(Şeyx Muhəmməd ibni Abdulvəhhabdan) həmin cahillər kimisi barəsində soruşuldu və o, bildirmişdir ki, üzərinə hüccətin qaim olduğu və onu bilməyə əhil olan kimsə qəbrlərə ibadət etməsi ilə kafir olar.[210] Amma yer üzündə yaşayıb öz həvasına tabe olanın halının necə olduğunu bilmirəm" "***

Və demişdir: ***"Daha öncə onun[211] içərisində kifayət edəcək (izah olan) sözü keçdi və bununla yanaşı, küfrə düşürən məsələlərdə öz şeyxlərini təqlid edənlər, əgər haqqı öyrənmək və bilmək imkanına malik olub, buna əhil olarlarsa və (ondan) üz çevirib, (haqqa) yönəlməzlərsə, İbnul Qayyim rahiməhullahın onların kafir olmalarını qəti şəkildə bildirdiyi sözü də (keçdi). Rəsulların gətirdiklərini bilmək imkanına malik olmayan və buna əhil olmayan kimsələr isə onun yanında rəsulların dəvətinin çatmadığı fətrət əhlindən hesab olunur. Hər iki növün nə İslamına hökm olunar, nə də müsəlmanların isminə daxil olmazlar. (Bu,) hətta onlardan bəzisinin kafir olmadığını (yəni kafir ismini almadığını) düşünənlərə görə də belədir.[212] Bu barədəki sözü irəlidə gələcəkdir. Lakin şirkə gəlincə bu onların üzərində doğrulanar və (müşrik) ismi onları əhatə edər. İslamın əsli və ən böyük qaydası olan Lə iləhə illəllaha şahidliyi pozan şeylə bərabər hansı İslam qalsın ki?! Fəqihlərin mürtədin hökmü babında zikr etdiklərindən bəzisi ilə bərabər İslamın və***

---

[206] İcma nəqlinə bax!

[207] İbni Teymiyyənin sözünü qəsd edir. *(T.e)*

[208] Bax: *"Məcmuul Fətava, 3/422" (T.e)*

[209] Şeyx Abdullatifdən gətirilən nəql burda bitir. *(T.e)*

[210] Diqqət et! Burada söz həmin kimsəyə küfr isminin işlədilib işlədilməməsi barəsindədir. Şirk isminə gəldikdə isə, o kimsə müşrikdir. Bu sabit olan bir şeydir və buna etiraz etməmişdir.

[211] Yəni Şeyx Muhəmməd ibni Abdulvəhhabın *(T.e)*

[212] Yəni bəziləri bu növ insanların hüccət iqamə edilmədən kafir olmazlar desə də, onları müsəlman adlandırmamışlar *(T.e)*

***(müsəlman) isminin qalması, onun salehlərə ibadət və dua ilə bərabər qalmasından daha açıqdır."[213]***

**- 10)** Və demişdir: ***"Onun[214] (rahiməhullah) bu sözü üzərində düşün: "qəbrlərə dua etmək, onlardan istəmək və onlarla istiğasə etmək bu babdan[215] deyil və müsəlmanlar bunda çəkişməmişlər. Əksinə, bunun küfrə düşürən şirklərdən olması üzərində icma etmişlər. Necəki, bunu İbni Teymiyyənin özü nəql etmişdir və onu təkfirində ixtilaf edilməyənlərdən saymışdır." "***

Və demişdir: ***"Həmçinin Şeyx Abdullatifin İbnul Qayyimdən nəql etdiyi (söz) barədə dediklərini idrak et! Onların ən az halları peyğəmbərin göndərilməsindən öncəki zamanda yaşayan və həlak olmuş fətrət əhli kimsələrin və heç bir peyğəmbərin dəvətinin çatmadığı kimsənin halı kimidir. Hər iki növ insanların İslamına hökm verilməz,[216] hətta onların bəzisini kafir görməyənlərin yanında belə onlar müsəlmanların isminə daxil olmazlar. Lakin şirkə gəlincə, bu, onlar üzərində doğrulanar və (müşrik) ismi onları əhatə edir. İslamın əsli və ən böyük qaydası Lə iləhə illəllaha şahidliyi pozan şeylə bərabər hansı İslam qalsın ki?! "***

## Şeyx Abdullatifin övladları Abdullah və İbrahimin sözlərindən və Suleyman ibni Sahman[217]ın sözlərindən nəqllər:

---

[213] Yəni əgər küfrə düşürən amilləri işləyən kimsədə bununla yanaşı onun müsəlman olaraq qalması və ya adlandırlması doğru bir şey olsaydı, o zaman İslamı pozan digər amilləri işləyən kimsələrdə islamın və müsəlman isminin qalması, şirk işləyən kimsədə bunların qalmasından daha uyğun olardı. Halbu ki, belə deyil. Ona görə ki, şirk işləyəndən müsəlman isminin ortadan qalxması və onun müşrik olaraq adlandırılması çox açıq bir şeydir. *(T.e)*

[214] Yəni Şeyx Abdullatifin *(T.e)*

[215] Yəni təkfiri ixtilaflı olan məsələlərdən *(T.e)*

[216] Onlardan İslamın nəfy edildiyinə diqqət yetir. Şahid olan, mühim olan və çəkişmənin olduğu yer burasıdır.

[217] Çoxlu əsər və rəddiyələr sahibi kimi tanınan alim **Şeyx Suleyman ibni Sahman ibni Muslih ibni Hamdan əl-Xasa'mi əl-A'siri ən-Nəcdi** h.1266 (m. 1852)-ci ildə Səudiyyə Ərəbistanının cənub qərbində yerləşən A'sir adalanan məntəqəsinin əs-Səqa kəndində anadan olmuşdur. Orada atası Sahmanın riayətində saleh bir mühitdə böyüdü, Quranı xətm etdi və əzbərlədi. Daha sonra atası ilə birlikdə İmam Faysal ibni Turkinin zamanında Riyad şəhərinə köçdü. Orada alimlərdən tövhid, fiqh və lüğətə dair dərslər aldı, Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhabın nəvəsi **Şeyx Abdurrahman ibni Həsən** ilə onun oğlu **Şeyx Abdullatif ibni Abdurrahmandan** dərs aldı. Şeyx Süleyman onlara tam bir bağlılıq göstərdi və elmlərindən faydalandı. İmam Faysal ibni Turkinin vəfatından sonra isə h.1284-cü ildə atası ilə birlikdə Nəcdin əl-Əfləc məntəqəsinin əl-A'mar kəndinə köçdü. Orada **Şeyx Həmd ibni A'tiq** ilə tanış olur və 17 ilə yaxın onun yanında tam bağlılıq göstərərək elm aldı. Şeyx Həmdin vəfatından sonra isə h.1301-ci ildə yenidən Riyada qayıtdı və orada **Şeyx Abdullatifin** oğlu **Şeyx Abdullah ibni Şeyx Abdullatif** ilə əlaqələri möhkəmləndirdi, onun dərslərinə qatıldı.

Beləliklə, Şeyx Süleymanın elm aldığı şeyxlərdən,

**- Şeyx Abdurrahman ibni Həsən aluş-şeyx,**
**- Şeyx Abdullatif ibni Şeyx Abdurrahman aluş-şeyx,**
**- Şeyx Həmd ibni A'tiq,**
**- Şeyx Abdullah ibni Şeyx Abdullatif aluş-şeyx,**

Şeyxin elmindən bir çox insan faydalandı və şeyxə layiqli tələbələr yetişdi. Bunlardan,
- **Şeyx Süleyman ibni Abdurrahman ibni Hamdan,**
- **Şeyx Abdullah ibni Abdulaziz əl-A′nqari,**
- **Şeyx Omar ibni Həsən,**
- **Şeyx Abdullatif ibni İbrahim** və
- **Şeyx Abdulaziz ibni Saleh əl-Mürşid** və digərləri.

Şeyx Süleyman ibni Sahman gözəl xəttə sahib olduğu üçün İmam Abdullah ibni İmam Faysal onu özünə katib olaraq təyin etdi və onun üçün bir çox məktublar yazmşdı. H.1307-ci ildə İmam onunla birlikdə Hail şəhərinə səfər etdi və şeyx orada qalaraq gecə-gündüz kitabların nüsxəsini yazmağa başladı. Həmin vaxtlarda şeyx bir çox kitabların əlyazmasını əldə edə etmək fürsətinə nail oldu. H.1309-cu ildə yenidən Riyada qayıtdı və artıq təlif işlərinə, rəddiyələr yazmağa başladı. Şeyxin yazmış olduğu kitab və risalələrdən,
1) - *"əl-Əsinnətul-həddad fi raddi alə Ulvi əl-Həddad"*- bu kitabı Yəmənli əşari-sufi əqidəsinə sahib Abdulah ibni Ulvi əl-Həddadın *"Misbahul-ənəm və Cəlaiz-Zalam"* adlı əsərinə rəddiyə olaraq yazıb. İki dəfə nəşr olundu, 1-cisi h.1332-cı ildə İmam Abdulazizin infaq etməsi ilə Hindistanın Bombey şəhərində çap olundu. 2-ci dəfə isə 1376-cı ildə Riyadda çap olundu.
2) - *"əs-Savaiqul-mursələ əş-Şihabiyyə fi raddi aləş-şubəhiş-şəmiyyə*" Dəməşqdən Əhməd A′ta adlı birisinin Şeyx Muhəmməd ibni Abdulvvəhabın dəvəti haqqında ortaya atdığı şübhələrə cavab olaraq yazıb. Risalənin digər adı bu cürdür: *"əs-Savaiqul-mursələ əl-Vahabiyyə aləş-şubəhid-dahidatiş-şəmiyyə"*
3) - *"Kəşfu ğiyahəbiz-zalam a'n əvhami cəail- əvham"* – bu isə Dəməşqli alim **Muxtar ibni Əhmədin** (v.e. h.1340) *"Cəlaul-əvham a'n məzəhibil-əimmətil-İ'zam"* adlı kitabına rəddiyə olaraq yazılıb.
4) - *"əd-Diyauş-şariq fi raddi şubuhatil-maziqil-mariq"* burada Bağdadlı şair **Cəmil Sidqi əz-Zahavinin** *"əl-Fəcrus-sadiq fi raddi alə munkiri ət-təvəssuli val kəramati val xavariq"* adlı batil kitabına rəddiyə yazıb.
5) - *"Kəşfuş-Şubuhati Abdulkərim əl-Bağdadi"*
6) - *"İrşadut-Talib ilə əhəmmil-matalib"*
7) - *"Nazmu mə infrada bihi İbni Teymiyyə"*
8) - *"Nazmu ixtiyarati Şeyxül-islam ibni teymiyyə"*
9) - *"Təmyizus-sidqi minəl-məyni fi muhavaratir-raculeyni"*
10)-*"Tənbihu zavil-əlbabis-səliməti anil-vuqui fil-əlfazi əl-mubtədiatil-vaximəti"* – Şeyx Muhəmməd ibni Abdulaziz ibni Mani′-in *"Aqidatu əs-Səfariniyyə"*-yə etdiyi şərhin üzərinə qeydlərdir.
11) - *"İqamətul-huccə vəd-dəlilu və izahul-məhəccə"*
12) - *"Kəşfuş-şubhəteyn a'n risaləti Yusuf bin Şəbib val-qasidəteyn"* Cəhmilərin və qəbrpərəstlərin təkfirində dayanan və buna dair İbni Teymiyyənin sözlərindən istifadə edib avam insanların başını aldatan Küveytli azğın **Yusuf ibni Şəbib** adlı birisinə rəddiyə olaraq yazılıb.
13) - *"Kəşful əvhami val-iltibasi an təşbihi ba'dil-əğbiyai minən-nəs"*- cəhmilərin təkfirində ixtilaf olduğunu iddia edərək onların təkfirində duranlara üzr gətirməyə çalışan **Hüseyn ibni Həsən** adlı birisinə rəddiyədir.
14) - *"Hallul-vasaaq fi əhkamit-talaq"*
15) - *"Minhacu əhlil-haqq val-ittibau' fi muxalafati əhlil-cəhl val-ibtida'"*
16) - *"əl-Cavabul-mənki fi raddi alə-l-Kanki"*
17) - *"ət-Tibyanul-məbdi li şanaa'til-qavlil-məcdi"* – **Muhəmməd Səid əl-Hadramiyə** rəddiyədir.
18) - *"Tə'yiidu məzhəbis-sələfi va kəşfi şubuhati mən haaddə va inharafə"*
19) - *"əl-Cuyuşur-rabbaniyyə fi kəşfi şubəhi amriyyə"* – **Abdullah ibni Amr** adlı birisinə rədiyyədir.
20) - *"Raddu aləl-A'amili sahibi kəşfil-irtiyab"* – **Muhsin əl-Əmin əl-A′amili** adlı birisinin *"Kəşfu-l-irtiyab fi ittibai' Muhəmməd bin Abdulvəhhab"* adlı kitabına rəddiyədir.
21) - *"əl-Cəvabu-l-fasil fi-s-saa'ti beynə mən yəquli innəhə sihrun va mən yəquli innəhə sinaa'tun"* – Qiyamət saatın bir sehir olduğunu iddia edən birisinə qarşı yazdığı rəddiyədir.
22)- *"əl-Hucəcul-vadihatul-islamiyyə fi raddi şubuhatir-ravafidi val-imamiyyə"*- **Muhəmməd Həsən əl-Qəzvini əl-İraqiyə** yazdığı bir rəddiyədir və bu onun ən son yazdığı əsərdir.

Bunlardan əlavə şeyx bir çox risalə və fətvalara sahibdir ki, onları nəcd alimlərinin fətva və risalələrinin toplandığı kitablarda görmək mümkündür.

Həmçinin Şeyx Suleyman bir çox qəsidə və şerlərin sahibi gözəl şair idi. Onun *"U'quudul-cəvahiril-mindadatil-hisan"* adlı divanı var, h.1333-cu ildə Hindistanda nəşr olundu. Əksəriyyəti rəddiyələrdən ibarət olan bu divanda şeyx sələfi-tövhid dəvətinə qarşı hücüm edən azğın şairlərə cavab verib.

Bu barədə çox danışmışlar və böyük şirkdə cəhaləti üzrlü görən kimsələrlə bir zamanda yaşamışlar. Bu fitnəyə qarşı uğurlu mübarizə verən Şeyx Suleyman ibni Sahman oldu, beləki bir sıra kitablar yazdı. Bunlardan:

**- 1)** *"Kəşfuş-Şubhəteyn"*

**- 2)** *"Kəşful-Əvham vəl İltibas"*

**- 3)** *"Təmyizus-Sıdq min əl-Məyn"*

Bu 3 kitab bu babda çox dəyərli kitablardır. Əslində onlar bu mövzuda dəvət imamlarının sözlərinin xülasəsidir və iki böyük imam olan İbni Teymiyyə ilə İbnul Qayyimin sözlərini izah edir.

**- 4) Şeyx Abdullatifin** oğulları **Abdullah[218] və İbrahim[219] və Suleyman ibni Sahman** demişlər:

---

Şeyx Süleyman ibni Sahman h.1349 (m.1930)-cu ildə Riyadda vəfat etdi. və Şeyx Abdurrahman ibni Həsən ilə Şeyx Abdullatif ibni Abdurrahman ibni Həsənin qəbri yanında dəfn edildi. Allah hamısına rəhmət eləsin! *(T.e)*

[218] **Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhabın** nəvəsi **Şeyx Abdurrahman ibni Həsənin** nəvəsidir. H.1265-ci ilə Əhsanın əl-Hufuf şəhərində anadan olmuşdur. Uşaq vaxtlarından Quranı həm gözü həm də qəlbi ilə əzbərlədi. 4 yaşına çatınca atası **Şeyx Abdullatif** onu özü ilə birlikdə Riyada gətirdi və atası ilə babası **Şeyx Abdurrahman ibni Həsənin** yanında tövhid, fiqh, hədis və təfsirə dair oxudu. Atası vəfat etdikdən sonra onu itirdiyinə görə dərin kədərlənən Şeyx Abdulah əl-Əflaca səfər etdi və orada üç ilə yaxın qaldı. Həmin müddət ərzində **Şeyx Həmd ibni A'tiqdən** dərs aldı. Daha sonra isə öz doğulduğu yerə qayıtdı və orada təlim-tədris və dəvət işləri ilə məşğul oldu. Şeyx artıq orada məşhurlaşmış və elmdə ustalaşmışdı, fərqli bölgələrdən insanlar elm tələb etmək üçün onun yanına gəldi. Bir çox alim və tələbələr şeyxin elmdən faydalanaraq yetişib. Onlardan bəziləri,
- Zamanında nəcdin böyük alimlərindən sayılmış, Səudiyyənin müftisi və baş qazisi olmuş və şeyxin qardaşı oğlu **Şeyx Muhəmməd ibni Şeyx İbrahim ibni Şeyx Abdullatif** rahiməhullah,
- **Şeyx Saleh ibni Abdulaziz ibni Abdurrahman ibni Həsən aluş-şeyx ,**
- **Şeyx Muhəmməd ibni Osman əş-Şavi,**
- Qardaşı oğlu **Şeyx Abdullatif ibni İbrahim ibni Şeyx Abdullatif,**
- Vusta və Şarqiyyə məntəqələrindəki əmr bil-maruf heyətinin rəisi olmuş **Şeyx Ömər ibni Şeyx Həsən,**
- Yaşadığı dövrdə baş qazi olmuş **Şeyx Abdullah ibni şeyx Həsən,**
- **Şeyx Abdulaziz ibni Saleh ibni Mürşid,**
- **Şeyx Abdurrahman ibni Salim əd-Dusari,**
- **Şeyx Salim əl-Hanaki** və s. bir çox alim və şeyxlər ondan dərs almışlar.

Şeyx bir çox risalələrin və fətvaların sahibidir ki, onları nəcd alimlərinin risalə və fətvalarının tolandığı mənbələrdən əldə etmək mümkündür. Bunlarla yanaşı Şeyx bir neçə qəsidə də yazıb.
Şeyx Abdullah ibni Abdullatif geriyə dörd oğlan övladı buraxdı: Abdulməlik, Abdullatif, Muhəmməd və Saleh. Şeyx h.1339-ci ildə Riyadda vəfat etmişdir. Allah rəhmət eləsin! *(T.e)*

[219] O, **Şeyx Abdurrahman ibni Həsənin** digər nəvəsi, **Şeyx Abdullatifin** oğlu **Şeyx İbrahim ibni Şeyx Abdullatif ibni Şeyx Abdurrahman ibni Həsən ibni Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhab ət-Təmimi ən-Nəcdidir.** H. 1280ci ildə (m.1863) Riyadda anadan olmuş və orada böyümüşdür. Uşaq vaxtlarından Quranı hifz etmiş, atası Şeyx Abdullatifin riayəti ilə elm tələbinə başlamışdır və ilk elmini ondan almışdır. Daha sonra isə qardaşı Şeyx Abdullahdan elm almış və ondan faydalanmışdır. Şeyx İbrahim ibni Abdullatifin elm aldığı digər şeyxlər də var. Onlar
- Şeyxin əmisi **Şeyx İshaq ibni Abdurrahman ibni Həsən aluş-şeyx,**

***“Cəhmilərin və qəbrlərə ibadət edən kimsələrin təkfir edilməməsinə dair islamın həqiqətini bilməyəndən başqası dəlil gətirməz.”***

Və demişlər: ***“Çünki şirk olan bir şeyi yerinə yetirmək (onun) söyləmiş olduğu kəliməi-tövhidə ziddir.”***

**- 5)** Bu üç imamın izlədiyi yol qəbrlərə ibadət edənlərin küfrünü sələfin cəhmilərin təkfirinə qiyas etmələri və sələfin cəhmilərin təkfirində cəhalətlərini üzrlü saymamalarıdır. Bax: *“əd-Durərus Səniyyə, 10/432”*

**- 6) Şeyx Abdullatifin** oğulları **Abdullah və İbrahim və Suleyman ibni Sahman** *“əd-Durərus Səniyyə, 10/433-437”*-də demişlər:

***“Elm və hədis əhli cəhmiyyənin təkfirində ixtilaf etməyib”***

Davam edərək demişlər: ***“Şeyxül-islam və onun şagirdi İbnul Qayyim birdən çox yerdə qeyd etmişlər ki: sözlü və fe'li olaraq küfrə düşürən amillər səbəbi ilə təkfirin nəfy edilməsi dəlilinin gizli qaldığı və failinin üzərinə hüccətin qaldırılmadığı hallarda olur. Nəfy ilə qəsd olunan hüccətin qaldırılmasından öncə failinin təkfiri və əzabının nəfy edilməsidir. Təkfirin nəfy edilməsi ümmət arasında çəkişilən məsələlər ilə bağlıdır. Salehlərə dua, onlarla istiğasə etmək və sıxıntı, müsibət anlarında onlara yönəlmək, bunların haramlığında və böyük şirk olmasında***

---

- **Şeyx Hamd ibni Faris,**
- **Şeyx Muhəmməd ibni Mahmud** və bir çox digər alim və şeyxlərin yanında üsul, furu, hədis, təfsir və nəvh-lüğət kimi elmlərdən dərs almış və mahirləşmişdi.

Şeyx İbrahim h.1321-ci ildə kral Abdulaziz ibni Abdurrahman ibni Faysalın zamanında Riyadın qazisi vəzifəsində işə başladı və həyatının sonuna kimi bu işdə çalışmışdır. Bununla yanaşı eyni zamanda təlim-tədris işləri ilə də məşğul olmuş, bir çox tələbə yetişdirmişdir. Onlardan,

- **Şeyx İbrahim ibni Hüseyn,**
- **Şeyx Abdurrahman ibni Davud,**
- **Şeyx Şeyx Abdullah ibni Hamd əd-Dusari,**
- **Şeyx İbrahim ibni Hüseyn ibni Fərəc,**
- **Şeyx Sa′d ibni Su′ud ibni Muflih,**
- **Şeyx Abdullah ibni Abdulaziz əl-A′nqari,**
- **Şeyx Abdurrahman ibni Salim** və başqaları.

Şeyx bir çox risalə və fətvaların sahibidir ki, bunları nəcd alimlərinin fətvalarının toplandığı mənbələrdən əldə etmək mümkündür.

Geriyə 4 oğlan övladı buraxmışdı: Şeyx Abdullah, Şeyx Muhəmməd, Şeyx Abdulməlik və Şeyx Abdullatif.

Şeyx İbrahim ibni Abdullatif h.1329-cu ildə (m.1911) vəfat etdi. Onun vəfat etməsinə insanlar çox üzülmüşdür, hətta **Şeyx Süleyman ibni Sahman** ona həsr edərək qəsidə yazıb. Allah rəhmət etsin! *(T.e)*

***müsəlman çəkişməz. Onların təkfirində və cəhmiyyələrin təkfirində iki görüş yoxdur.***[220]*”*

**- 7)** *“əd-Durərus Səniyyə, 10/434”*-də Şeyx Muhəmməd ibni Abdulvəhhabın dəvət edincəyə kimi Kəvvazın türbəsi üzərində dua edənin təkfirində dayanmasını və bütpərəsti təkfir etməməsini açıqlamışlar: ***“Şeyx (rahiməhullah) hüccət və dəvət çatdırılmadan, başlanğıc olaraq insanları təkfir etmir. Çünki o kimsə fətrət və risalətin izlərinin bilinmədiyi bir zamandadır. Buna görə onların cahil olduqlarını və xəbərdar edən kimsənin olmadığını demişdir. Ancaq hüccət çatdırılarsa, hətta anlamasalar belə artıq onların təkfirinə bir əngəl olmaz.”***

Sözün təkfirin (inkarı) barəsində olmağına diqqət yetir! Onlardan İslam hökmünün nəfy edilməsinə gəlincə isə onları təkfir etməsə də bunu nəfy edir. Çünki onlar şirk edirlər və onun ismi onları əhatə edir, üzərilərində doğrulanır və şirk ismi onlara aiddir.

**- 8) Şeyx Abdullatifin** oğulları **Abdullah və İbrahim və Suleyman ibni Sahman** *“əd-Durərus Səniyyə, 10/432, 435”*-də demişlər:

***“Cəhmilər və qəbrlərə ibadət edənlər isə onlar barəsində bu kimi nasslarla dəlil gətirilməz: "kim bizim namazımızı qılar" Yalnız İslamın həqiqətini və Allahın dəyərli rəsulları vasitəsi ilə göndərdiklərini bilməyən kimsə (bu və digər bənzəri nəbəvi nassları onların təkfirinin olmamasına dair dəlil göstərər.) Çünki onların gətirdikləri və dəvət etdikləri şeyin həqiqəti: heç bir şəriki olmadan sadəcə Allaha ibadət etmənin vacibliyi və əməli Ona xas etmək, yaratdıqlarından heç kimsəni Onun vacib olan haqqına ortaq qoşmamaq və Öz nəfsini vəsfləndirdiyi kamil sifətlər və uca vəsflər ilə vəsf etməkdir. Kim onların gətirdiyi şeyə müxalif olar, onu inkar edər və pozarsa, o kimsə azmış bir kafirdir, hətta Lə iləhə illəllah desə və özünün müsəlman olduğunu zənn etsə də. Çünki şirk olan bir şeyi yerinə yetirmək söyləmiş olduğu kəlimai-tövhidə ziddir. Lə iləhə illəllah sözünü deməsi ona fayda verməz, çünki o, əməl etmədiyi və dəlalət etdiyi şeylə əməl etmədiyi bir şeyi demişdir. Onun: "Sözün küfr olduğunu deyərik, onu deyənə isə küfr hökmünü vermərik"-sözünə gəlincə, bunun mütləq mənada işlədilməsi sırf cəhalətdir.***[221] ***Bu ifadə yalnız müəyyən (şəxsin) üzərinə uyğulanır”***[222]

**- 9) Şeyx Suleyman ibni Sahman** *“Kəşfuş-Şubhəteyn, s.64”*-də demişdir:

***“Allahdan başqasına ibadət etmək və onu (yəni ibadəti) Allah ilə yanaşı peyğəmbərlər, övliyalar və salehlərdən şərik qoşduqları kimsələr üçün sərf***

---

[220] İcma nəqlinə və sələfin yanında cəhmilərin və qəbrə ibadət edənlərin təkfiri mövzusunda xilafın olmadığını vurğulamasına diqqət et!

[221] Buna diqqət yetir!

[222] Bu söz gizli məsələlər barəsindədir. Bunu şeyx nəqlin davamında açıqlamışdır. Nəqlin davamı bu şəkildədir: ***“Müəyyənin təkfiri məsələsi bilinən bir məsələdir. Əgər küfr olan bir sözü deyərsə, deyilər ki: "kim bu sözü desə kafir olar", lakin müəyyən bir şəxs bunu desə sahibinin tərki ilə kafir olduğu hüccət ona çatdırılana kimi onun küfrünə hökm verilməz. Bu isə gizli məsələlərdə olur, hansı ki, bəzən dəlili bəzi insanlara gizli qalır...” (əd-Durərus Səniyyə, 10/433)*** *(T.e)*

***edilməsindən ibarət olan böyük şirkdə kimsənin cəhaləti üzrlü deyil. Əksinə onun bilinməsi və ona iman etmək İslamın (bilinməsi) zəruri (olan) məsələlərindəndir.”***

- **10) Şeyx Suleyman ibni Sahman** şeyxi **Şeyx Abdullatifin** *“Minhacut-Təsis, s.102-105”*-də keçən sözünü nəql edir. Şeyx Abdullatif demişdir:

***“Buna görə də dəlillərin aydınlığı və sübutların açıqlığı səbəbi ilə ümmi[223] ərəb cahiliyyələrindən olan müşriklərin müəyyənləri barəsində hökm verilmişdir. Bəni əl-Muntəfiq hadisində[224] buyurulmuşdur: "Dusi və ya Qureyşi birisinin qəbrinin yanından keçsən de ki Muhəmməd səni atəş ilə müjdələyir" Bu, onların fətrət əhli olmaları halındakı hökmdür, bəs bu ümmətdən olub (yaşayıb) böyüyən və tövhidin vacibliyi, əmr edilməsi və şirkin haramlığı, qadağan olunması barədə Quran ayələrini, nəbəvi hadisləri və fiqhi hökmləri eşidən kimsə haqqındakı hökm necədir?”***

- **11)** *“Fətava əl-Əimməti-n-Nəcdiyyə, 3/195-196”*- da olduğu kimi şeyxlərindən onlara müvafiq olaraq sözlərini nəql etmişdir:

---

[223] Ümmi (أمي) ərəb dilində "ana" mənasına gələn "ümm" (أم) sözündən olub, "anadangəlmə" mənasını ifadə edir. Ümmi, anasından doğulduğu kimi qalan, heç bir şey öyrənməyən kimsəyə deyilir. Buna görə də ərəblər yazıb-oxumaq bilməyən adama da "ümmi" deyirlər. Yazıb-oxumaq sonradan əldə olunan bir bacarıqdır və heç bir insan anadangəlmə bu bacarığa sahib deyil. (Bax: *"Lisanul Arab"*) Allah azzə və cəllə peyğəmbərimiz (səllallahu aleyhi və sələmi) də ümmi olaraq göndərmişdir. Çünki ərəb qövmü yazıb oxumaq bilməyən bir toplum olduğu üçün peyğəmbərimiz (səllallahu aleyhi və səlləm) də yazıb-oxuma bilmədiyi bir halda göndərilmişdir. Bunu Allah azzə və cəllə ayələrdə bu cür bildirmişdir: ***«Ümmilərə içlərindən onlara (Allahn) ayələrini oxuyan, onları (günahlardan) təmizləyən, Kitabı və hikməti öyrədən bir peyğəmbər göndərən Odur. Həqiqətən də onlar əvvəllər açıq-aşkar azğınlıq içərisində idilər. »*** **(Cumuə, 2)** ***«O kəslər ki, əllərindəki Tövratda və İncildə (vəsflərini) yazılmış gördükləri rəsula, ümmi peyğəmbərə tabe olurlar.»*** **(Əraf, 157)**

Peyğəmbərimiz Muhəmməd (səllallahu aleyhi və səlləmin) ümmi olaraq göndərilməsi onun möcüzələrindən biridir.

***«Sən bundan əvvəl nə bir kitab oxumusan, nə də onu əlinlə yazmısan. Əgər belə olsaydı, onda batilə tabe olanlar (onun barəsində) şübhəyə düşərlərdi.»*** **(Ənkəbut, 48)**

***«Sənə də beləcə əmrimizdən olan bir vəhy göndərdik. Sən (bundan əvvəl) kitab nədir, iman nədir bilməzdin. Lakin Biz onu bəndələrimizdən dilədiyimizi haqq yola qovuşdurmağımız üçün bir nur etdik. Sən (onunla insanları) düz yola yönəldirsən.»*** **(Şura, 52)** *(T.e)*

[224] **İbnul Qayyim** *“Zadul Məad, 3/588-591”*-də “Bəni əl-Muntəfiqdən rəsulullaha gələn heyət fəsli”-ndə **Abdullah ibni Əhmədin** atasının müsnədindən rəvayət etdiyi uzun bir hədisi qeyd edir. Bəni əl-Muntəfiqdən Rəsulullahla görüşməyə gələn **Laqit** adlı birisinin Allah rəsulundan (səllallahu aleyhi vəsəlləm) soruşur:

***“Bizdən (ölüb) gedənlərdən cahiliyyələrində bir xeyri olan kimsə varmı?***
***Qureyş əhlindən olan biri dedi ki: "Vallahi, atan əl-Muntəfiq atəşdədir"***
***Laqit dedi ki: İnsanların yanında atam haqqında belə deməsindən dolayı sanki üzümün dərisi ilə əti arasına istilik girdi və "Bəs atan, ey Allahın rəsulu?" demək istədim. Sonra isə başqa cür soruşmaq daha gözəldir dedim və soruşdum:***
***"Ey, Allahın rəsulu bəs ailən necə?" dedi ki: "Allaha and olsun ki, mənim ailəm də (o cürdür) Əgər Amiri və ya Qureyşi müşrik birisinin qəbri yanından keçsən de ki: Məni sənə Muhəmməd göndərdi. Səni üzəcək şeylə müjdələyirəm, üzün və qarnın üstündə atəşə sürüklənirsən!"”***

Ancaq hədis, sənədində yer alan **Abdurrahman ibni Ayyaş əs-Səm'i** ilə **Dəlhəm ibni Əsvədin** məçhul olması səbəbi ilə bəzi hədisçilər tərəfindən isnadı zəif olaraq qəbul edilmişdir. Allah ən doğrusunu biləndir! *(T.e)*

***“Qəbrlərə ibadət və Allah ilə yanaşı onlara dua etmək məsələsi haramlığında ittifaq edilmiş, günah olmasında və qadağan edilməsində icma edilmiş bir məsələdir. Bürhanın açıqlığı, dəlillərinin aydınlığı və şübhənin etibarsızlığı səbəbiylə (bu məsələ) şeyxin (İbni Teymiyyənin) sözünə daxil deyil."***

Və demişdir: ***“Daha öncə keçdi ki, Nuh (aleyhissəlam)-ın zamanından bu vaxta kimi kafirlərin və müşriklərin hamısı cahil olmuşlar və təvil etmişlər: İbni Arabi, İbnul Fariz və Tilmisani kimi Hulul və İttihat əhli təvil etmişlər, onlardan başqa sufilər də təvil etmişlər, çəkişmə mövzusunda olan qəbrə ibadət edənlər və müşriklər də təvil etmişlər.”***[225]

Davam edərək demişdir: ***“Və nəsranilər də təvil etmişlər”***

Və demişdir: ***“Dində bilinməsi zəruri olan məsələlərdəndir ki: İslam ilə şirk bir-birinə zidd şeylərdir, bir yerdə cəmləşə bilməzlər və (birlikdə) ortadan qalxmazlar.***[226] ***Buna görə də müşrikin hər hansı bir şübhə səbəbiylə müsəlman olması imkansızdır.***[227] ***Çünki bu, iki zidd şeyin bir yerdə cəmləşməsinə və imkansız olanın baş verməsinə aparıb çıxarır.”***

**- 12) Şeyx Suleyman ibni Sahman** *“Kəşfuş-Şubhəteyn, s.92”*-də şeyxi Abdullatifdən ona müvafiq olaraq sözünü nəql edir.:

***“Allaha, mələklərinə, kitablarına, peyğəmbərlərinə və axirət gününə imanın olmamasında heç kim üzrlü deyil. Bundan sonra onun üçün cəhaləti üzrlü deyil.***[228] ***Allah subhanəhu təala kafir olduqlarını açıq şəkildə bildirməsi ilə yanaşı kafirlərin çoxunun cahil olduqlarını xəbər vermişdir... ”***

**- 13)** Və *“Kəşfuş-Şubhəteyn, s.93-94”*-də demişdir:

***“Allahı birləmək və ibadəti Ona xas etmək məsələsində isə, nə İslam əhlindən, nə həva əhlindən,***[229] ***nə də onlardan başqası çəkişməyib və bu dində bilinməsi zəruri olan məsələlərdəndir. Risalətin çatdığı və onu olduğu kimi təsəvvür edən hər kəs, eləcə də sələfin əksəriyyətinin yetmiş iki firqədən çıxartdığı cəhmiyyələr də...”***

---

[225] Nuh (aleyhissəlam)-dan bəri icma nəql etdiyinə və cəhalətin üzrlü olmadığına və sələfin bu beş tayfanın cəhalətini üzrlü saymadığına diqqət yetir!

[226] Yəni bir şəxsdən həm şirk və həm də İslam hökmü ikisi birlikdə ortadan qalxmaz. Birinin ortadan qalxması digərinin də ortadan qalxması mənasına gəlmir. Əgər şəxsdən İslam hökmü ortadan qalxarsa, şirk hökmü də ortadan qalxmaz və yaxud əksinə şirk hökmü ortadan qalxarsa islam hökmü də ortadan qalxmaz. Birinin varlığı digərinin yoxluğunu, birinin yoxluğu isə digərinin varlığını gərəkdirir. Bu mənada İslam və şirk kimi iki zidd şeyin bir arada olması və birlikdə yox olması imkansızdır. *(T.e)*

[227] Diqqət et! Müşrikin müsəlman olmasının mümkün olmadığını dedi və buna görə də qəbrə ibadət edənlərin müsəlman olması şər'ən imkansızdır. Hətta onlar şəhadət kəliməsini nutq etsələr, namaz qılıb, oruc tutsalar da. Bəs kim Allahdan başqasına qurban kəsən və ya Allahdan başqasına dua edən cahil müsəlmandır deyən kimsə necə?! Bunun iki zidd şeyi bir arada cəm etmişdir.

[228] Onlar və Allahın ilahlığına iman etməyən bənzəriləri haqqında cəhalətin üzrlü olmadığına diqqət et!

[229] Bu, həva əhlinin tövhidə bağlılıq göstərdiyinə və rafizilərdən öncə Allaha şirk qoşmağın onların məzhəbindən olmadığının dəlilidir. Çünki onlar (yəni rafizilər) həva (bidət) içərisində tövhidə bağlılıq göstərməyən yeganə tayfadır və onlarda böyük şirk var.

Davam edərək demişdir: ***“Əgər müəyyən bir şəxsdən - Allah subhanəhu təaladan başqasına ibadət etmək, yaratdıqları üzərində Allahın ucalığını inkar etmək, zati və fe'li olan kamil sifətlərini və uca vəsflərini, hadisələri və baş verənləri olmazdan öncə bilməsi məsələsinin inkarı kimi - İslam dinində bilinməsi zəruri olan şeylərdən küfrünü gərəkdirən bir şey ortaya çıxarsa, bunların hamısında təkfirin və xəta ilə günahlandırmanın əngəllənməsi Allahın zatını inkar edəni, rübubiyyətini inkar edəni, isim və sifətlərini inkar edəni, Allahu Təalanın uluhiyyətinin birlənməsini inkar edəni,[230] Qədəriyyələrin ğulatları kimi "baş verənlər olmazdan öncə Allah olacaqları bilməz" deyənləri, hadisələri yüksək ulduzlara isnad edənləri və iki əslin işıq və zülmətdən ibarət olduğunu deyənləri[231] təkfir edənləri rədd etməkdir. Bunların hamısına bağlı qalan kimsə yəhudi və nəsranilərdən daha azğın və daha kafirdir.”***

**- 14)** Və *“Kəşfuş-Şubhəteyn, s.95”*-də demişdir:

***“Şeyxül-islamın sözlərini yalnız onun sözləri ilə məşğul olan və üsulunu bilən kimsə anlar. Belə ki, o bir çox yerdə açıq şəkildə bildirmişdir ki, əgər bacardığı qədər Allahdan qorxar və gücü çatdığı qədər səy göstərərsə şəriətin çatmadığı və hüccətin iqamə edilmədiyi bəzi kimsəyə xüsusi məsələlərdə (içinə düşdüyü) xəta bağışlanar. Qəbrlərə ibadət edənlərin və ölülərə, qeybdə olanlara dua edənlərin, yaratdıqları üzərindəki Yaradanın ucalığını inkar edənlərin və Onun isim və sifətlərini, uca vəsflərini inkar edənlərin təqvası və səy göstərmələri hardadır?!”***

**- 15) Şeyx Suleyman ibni Sahman** *“Kəşfuş-Şubhəteyn, s.79-80”*-də **İbni Teymiyyənin** hüccət iqamə edilincəyə kimi təkfirin olmaması barəsindəki məzhəbindən danışarkən bunun xəfi məsələlərdə olduğunu, ancaq dində bilinməsi zəruri olan, açıq və zahir olan məsələlərdə (küfr) söyləyənin təkfirində durulmayacağını demişdir.[232]

---

[230] İnkarçılar beş qisimdilər, cəhalətin üzrlü olmamasında onların hökmləri birdir: 1) Zatı inkar edənlər 2) Rübubiyyəti inkar edənlər 3) İsim və sifətləri inkar edənlər 4) İbadətin birlənməsini inkar edənlər və (burada) qəsd olunanlar bunlardır 5) Allahın elmini inkar edənlər

[231] Onlar məcusilərdir. Kainatdakı bütün işlərin iki əsldən ibarət olduğunu və bu iki əslin üzərində döndüyünü iddia edirlər. Həmin iki əsl xeyir və şər, fayda və zərər kimi qisimlənir. *(T.e)*

[232] Şeyx Ali Xudayr bu risalədə nəcd alimlərindən **Həmd ibni A'tiq**in sözlərindən sitat gətirməsə də tövhid dəvətinin yayılmasında həmin alimin də böyük təsirinin olduğunu nəzərəq alaraq onun həyatı və elmi fəaliyyəti haqqında qısa bilgi verməyin faydalı olacağını düşünürəm.

Fəzilətli və araşdırmacı alim olan **Şeyx Həmd ibni Əli ibni A'tiq** h.1227-ci ildə Nəcdin əl-Zülfi adlanan bölgəsində doğulmuşdur. Elm əhli olmayan kiçik bir ailədə böyüsə də Şeyx Həmdin elmə olan düşkünlüyü onun dünya və axirət yurdunun izzəti olan bu yolu axtarmağa sövq etmişdir. Hələ uşaq ikən Quranı xətm edib əzbərləmişdi. Bundan sonra isə şeyx bu yoldakı əzmini daha da artıraraq öz doğulduğu bölgəni tərk edib elm ardınca yola çıxmağa qərar verdi. H.1235-ci ildə İmam Faysal ibni Turki ibni Abdullahın zamanında Riyad şəhərinə getdi. Həmin dövrdə Nəcd bölgəsi İbrahim Paşanın oranı işğal etməsindən və viranə qoymasından sonra İmam Faysalın bölgənin istiqrarını yenidən bərpa etdiyi və dirçəltdiyi bir zaman idi. Nəcd artıq alimlərlə dolmuşdu və onların başında Şeyx Abdurrahman ibni Həsən ibni Şeyxul İslam Muhəmməd ibni Abdulvəhhab gəlirdi. Şeyx Həmd ibni Atiq 9 ilə yaxın Riyadda qaldı və **Şeyx Abdurrahman ibni Həsənə** bağlılıq göstərdi. Fiqh, əqidə, üsuluddin və tövhidə dair oxudu, ustalaşdı. Bununla yanaşı **Şeyx Abdullatif**, **Şeyx Əli ibni Hüseyn** və Riyadın qazisi **Şeyx Abdurrahman ibni A'dvanın** yanında elm almışdır.

İmam Faysal onu əl-Xarac bölgəsinə sonra isə əl-Halva bölgəsinə qazi olaraq təyin etmişdir. Daha sonra isə əl-Əflaca qazi olaraq təyin edildi və həyatının sonuna qədər orada qaldı. Şeyx orada təlim-tədris işləri də məşğul oldu, onun əli ilə bir çox alim və tələbələr yetişdi. Onlardan,

**- Şeyx Abdullah ibni Şeyx Abdullatif,**

**- 16)** *"Fətava Şeyx Muhəmməd ibni İbrahim***"** onun fətvalarını toplayan fihrist bölümündə bu cür (başlıq) yazmışdır: "Tövhiddə cəhalət üzrlümüdür?" sonra isə demişdir:

**"Şeyx Muhəmməd ibni İbrahim[233]dən soruşuldu: "Cahil olsa beləmi? (cəhaləti üzrlü olmaz?) Şeyx dedi ki:** ***"Tövhiddə cəhalət yoxdur, bu, cahil qalınacaq şeylər***

---

- Oğlu **Şeyx Sa′d ibni Həmd ibni A′tiq,**
- Oğlu **Şeyx Abdulaziz ibni Həmd ibni A′tiq,**
- **Şeyx İshaq ibni Abdurrahman,**
- **Şeyx Süleyman ibni Sahman** və başqaları

**Şeyx Həmd ibni A′tiq** bir çox əsərlərin və fətvaların sahibidir. Bunlardan,

- *"İbtalut-təndid şərhu kitabut-tövhid"* – Şeyxül-islam Muhəmməd ibni Abdulvəhhabın *"Kitabu Tövhid"* kitabının şərhidir.
- *"Bəyanun-nəcat val-fikək min muvalətil-murtəddin va əhlil-işrak",*
- *"əl-Furqanul-mubin beynə məzhəbis-sələfi va ibni səbi'in",*
- *"əd-Difau' a'n əhlis-sunnəti val-ittiba'"*

Bunlarla yanaşı şeyx bir çox risalə və fətvalara sahibdir ki, onları nəcd alimlərinin fətva və risalələrinin toplandığı kitablarda görmək mümkündür. Bunlardan biri də Şeyxin Hindistanlı alim **Siddiq Həsən Xana** yazdığı məşhur risaləsidir. Orada Şeyx Hamd ibni A′tiq ona gözəl sözlərlə nəsihət edərək yazdığı təfsirdə isim və sifətlər mövzüsunda yol verdiyi bəzi xətalara qarşı onu xəbərdar etmişdir. (Bax: *"Məşahiru uləmai nəcd va ğayrihim, s.245-253"*)

Şeyx Həmd ibni Atiq h.1306-ci ildə əl-Əflacın əl-A′mar kəndində vəfat etmişdir və geriyə 10 oğlan övladı buraxdı. Bunlardan adları məlum olanlar: Şeyx Sad, Şeyx Abdulaziz, Şeyx Abdullatif və Şeyx Abdullahdır. Allah hamısına rəhmət eləsin! *(T.e)*

[233] O, **Şeyx Abdurrahman ibni Həsənin** nəvəsi **Şeyx İbrahim ibni Şeyx Abdullatifin** oğludur. Nəsəbi bu cürdür: **Şeyx Muhəmməd ibni İbrahim ibni Abdullatif ibni Abdurrahman ibni Həsən ibni Muhəmməd ibni Abdulvəhhab ən-Nəcdi əl-Hənbəlidir**. H.1311-ci ildə (m.1893) Riyadda doğulmuşdur. Atası Şeyx İbrahim aluş-şeyxin riayətində böyümüşdür və 8 yaşına çatınca atası onu **Şeyx Abdurrahman ibni Mufayric** adlı qarinin yanında Quranı hifz etməsi üçün mədrəsəyə yazdırdı. 16 yaşına çatanda şeyxin gözləri tutuldu və yenidən Quran qiraətinə başladı, onu qəlbi ilə hifz etdi. Daha sonra Şeyx Muhəmməd ibni Abdulvəhhabın yazdığı müxtəsər mətnləri əzbərlədi, nəhv, fəraiz kimi bir çox elmlərin əsasını atasının yanında əzbərlədi. Həmin vaxtlarda atası **Şeyx İbrahim** Riyad şəhərinin qazisi idi. Bundan sonra şeyx Muhəmməd əmisindən və bir çox alimlərdən elm almaya başladı. Bunlardan,

**- Şeyx Abdullah ibni Şeyx Abdullatifin** yanında *"Kitabut-Tövhid"*-i, **Şeyxül-islam İbni Teymiyyənin** *"A'qidatul-Vasitiyyə"* və *"A'qidatul Hamaviyyə"*-kitablarnı, təfsir üsulu və hədisə dair kitablar oxudu.
- **Şeyx Sad ibni Şeyx Həmd ibni A′tiqin** yanında hədis, fiqh və mustalahul-hədisə dair kitablar oxudu və ona tam bağlılıq göstərdi.
- **Şeyx Həmd ibni Farisin** yanında *"Əlfiyyə"*-ni və nəhv elmində təlif edilmiş digər əsərləri, habelə fiqh elmindən kitablar oxudu.
- Riyad şəhərinin hakimlərindən olan **Şeyx Abdullah ibni Calu′udun** yanında fəraiz elminə aid oxudu.

H.1339-cu ildə əmisi Şeyx Abdullah ibni Abdullatifin vəfat etməsinin ardınca Kral Abdulaziz ibni Abdurrahman onu əmisinin yerinə imam və mufti təyin etdi, həyatının sonuna kimi bu vəzifədə çalışdı.

Şeyxin əli ilə bir çox alim və tələbələr yetişmişdir. Bunlardan,

- Qardaşı **Şeyx Abdulmalik ibni İbrahim ibni Şeyx Abdullatif,**
- Əmisi oğlu **Şeyx Abdullah ibni Abdurrahman ibni Şeyx Abdullatif,**
- Məscidul Haramın imamı və dini işlər üzrə rəisi olmuş **Şeyx Abdullah ibni Muhəmməd ibni Humeyd,**
- Şeyx **Abdulaziz İbni Baz,**
- Məkkənin Böyük Məhkəməsinin rəisi olmuş **Süleyman ibni Ubeyd alu Salmi,**
- **Şeyx Abdurrahman ibni Faris,**
- **Şeyx Abdurrahman ibni Sa′d,**

***kimi deyil. Bu, yalnız dindən üz çevirən kimsədir. Heç insan günəşdən cahil qalarmı?""*** *"əl-Fətava, 12/195"*

## Daimi Fətva Komitəsi və digərlərinin sözlərindən nəqllər:

**- 1) Komitənin (1/220)** fətvasında bu cür deyərək cavab vermişlər:

***"Peyğəmbərimiz (səllallahu aleyhi vəsəlləmin) risalətinə və şəriətdə gətirmiş olduğu digər şeylərə iman edən hər kəs əgər bundan sonra Allahdan başqa övliya, qəbr sahibi və ya təriqət şeyxindən kiməsə səcdə edərsə, səcdə vaxtı iki şəhadəti nutq etsə belə ibadətdə Allah ilə yanaşı başqasını Ona ortaq qoşan, İslam dinindən çıxmış bir kafir sayılar. Çünki onun Allahdan qeyrisinə səcdə etməsi (nutq etdiyi) sözünü pozur. Lakin o bəzən cəhaləti səbəbiylə üzrlü olar və (haqqı) bilincəyə, üzərinə hüccət qaldırılıncaya kimi ona cəza endirilməz. Özünə gəlməsi üçün üzr olaraq ona üç gün möhlət verilər, ola bilsin ki, tövbə etsin. Əgər bəyandan sonra Allahdan qeyrisinə səcdə etməkdə israr edərsə riddəti səbəbiylə öldürülər... Bəyan və hüccətin iqamə edilməsi onun üzərinə cəzanın endirilməsindən qabaq üzrləri səbəbiylədir, yoxsa bəyandan sonra kafir adlandırılması üçün deyil. O, Allahdan qeyrisinə səcdə etmək və ya qurban nəzir etmək və ya məsələn Allahdan qeyrisinə qoyun kəsməsi kimi ondan ortaya çıxan əməllərlə artıq kafir olmuşdur."***[234]

---

- **Şeyx Həmd ibni A'tiqin** nəvəsi **Şeyx Muhəmməd ibni Abdulaziz,**
- Oğlanları **Şeyx İbrahim ibni Muhəmməd ibni İbrahim** və **Şeyx Abdulaziz ibni Muhəmməd ibni İbrahim,**
- **Şeyx Muhəmməd ibni Şeyx Adurrahman ibni Qasim** və s. qazilər və alimlər onun elmindən faydalanıb.

H.1369-cu ildə **Şeyx Muhəmməd ibni İbrahim** Kral Abdulaziz ibni Abdurrahmana Riyad şəhərində elmi mərkəzlərin tikilməsi təklifini irəli sürdü və kral onun təklifini dəyərləndirdi. Riyad şəhərində bir çox elmi mərkəzlər tikildi və tələbələr üçün xüsusi mükafatlar təyin edildi. Bununla yanaşı bir çox İslami universitetlər tikdirdi. Bunlardan Mədinə şəhərindəki İslam Universitetidir ki, Abdulaziz ibni Bazı ora müdir olaraq təyin etmişdi. Digəri isə İmam Muhəmməd ibni Səud İslam Universitetidir ki, ilk olaraq oğlu Abdulaziz ibni Muhəmmədi ora müdir təyin etmişdi.

Bundan başqa Şeyx Dini işlər və fətvalar idarəsi müəssəsəsini və bir çox dini idarə və müəssəsələri inşa etdirib.

**Şeyx Muhəmməd ibni İbrahim** bir çox kitab, risalə və fətvaların sahibidir.
- *"əl-Cavabu-l-Mustaqim",*
- *"Tahkimul-Qavaniin",*
- *"Məcmuat'u min əhadisi-l-əhkam",*
- *"Şərhu Kitabu Ədəbil-məşyi iləs-saəti əv əl-i'badəti",*
- *"Şərhu kəşfuş-şubuati",*
- *"Fətava var-rasailu şeyx Muhəmməd ibni İbrahim ibni Abdullatif aluş-şeyx"* bunu **Şeyx Abdurrahman ibni Qasim** fətva və risalələri tərtibləyərək bir yerdə toplayıb.

Şeyx Muhəmməd ibni İbrahim alu-ş-şeyx h.1389-cu ildə (m.1969)-cu idə Riyadda vəfat etmişdir və cənazə namazını Şeyx Abdulaziz ibni Baz qıldırdı. Geriyə 4 oğul və bir qız buraxdı: Abdulaziz, İbrahim, Əhməd, Abdullah və Cəvhərə. *(T.e)*

[234] Komitənin sözü –Allah onları müvəffəq etsin və ölənlərinə rəhmət etsin!- günəşin aydınlığı kimi aydındır. **Şeyx Abdulaziz ibni Bazın** bundan sonrakı sözü də həmçinin aydındır.

**- 2) Şeyx İbni Baz** demişdir**:** ***"Məsələlər iki qisimdir: cəhalətin üzrlü olduğu qism və cəhalətin üzrlü olmadığı qism: bunları işləyən kimsə əgər müsəlmanların arasında olar və Allaha şirk qoşmaq, Allahdan qeyrisinə ibadət etmək kimi şeyləri edərsə, o üzrlü olmaz. Çünki o, ehmalkardır, dinində səy göstərmədi  və diqqətlə baxmadı. Buna görə də Allahdan başqasına olan ibadətində üzrlü deyildir."*** *"Fətava İbni Baz, 4/26-27"*

**- 3)** Bu, həmçinin şeyximiz **Şeyx Hamud ibni U'qla əş-Şuaybinin** görüşüdür. Allah onu hifz etsin və qorusun !

# 7-ci FƏSL :

## (Bu məsələyə dair) Qiyasın[235] dəlalət etməsinin qeydi haqqında

Böyük şirkdə cəhalətin üzrlü olmaması barədə Kitab, Sünnə, icma və elm əhlinin sözlərinin qeydindən sonra bunda qiyasın nəyə dəlalət etdiyini qeyd edirik. O, isə iki cürdür: **qiyasul-əvla** və **qiyasuş-şəbəh**

**Birinci: Qiyasul-əvla**[236]

**- 1)** Səhabənin **Museyləmənin** və ona tabe olanların müəyyən olaraq küfrünə icma etmələri və onun peyğəmbərlikdə rəsula ortaq olduğunu iddia etməsinə görə cəhalətlərini üzrlü saymamaları. Qiyas yönü budur ki, bu (peyğəmbərlikdə) ortaqlıq (iddiasında) cəhalət üzrlü olmadı, bəs ibadətində Allaha ortaqlıq iddia edən kimsə ilə ona tabe olanlar necə?! Onların üzrlü olmaması daha uyğundur.

**- 2)** Peyğəmbərlikdə ortaqlıq iddia etməsinə görə **Muxtar əs-Saqafinin** və ona tabe olanların küfrü üzərindəki icma. **Museyləmə** və ona tabe olanlar barəsində dediyimiz kimi, burada da (deyirik) onların üzrlü sayılmaması daha uyğundur.

**-3)** Zəkatı verməkdən imtina edənlərin cəhalətlərinin üzrlü olmaması üzərində səhabənin icması. Çünki onlar Lə iləhə illəllahın haqqlarından olan bir haqqdan imtina etdilər. Bundan daha uyğun olanı isə lə iləhə illəllahdan imtina edənin (cəhalətinin üzrlü olmamasıdır), hansı ki, o əsldir.

**-4)** Atasının xanımını nigahlayanın cəhalətinin icma ilə üzrlü olmaması. Hətta ondan açıqlanma tələb olunmaz, çünki bundakı iş eynidir. Çünki o, heç lə iləhə illəllahın haqqlarına bağlı deyil, bəs, lə iləhə illəllaha necə bağlı olsun?!

---

[235] *Qiyas:* Kitab, Sünnə və İcmadan sonra şəri dəlillərin dördüncü qismidir. İstilahi olaraqdan qiyasın tərifi: Kitab, Sünnə və ya icmada hökmü olmayan bir məsələyə, aralarında ortaq illətin olması səbəbi ilə həmin qaynaqlarda olan məsələnin hökmünü verməkdir *(Üsulul Fiqh, Zəkiyuddin Şaban)* və yaxud: Nasslarla hökmü bildirilmiş bir məsələnin hökmünü əsas alıb, onun misli və bənzəri olan digər bir məsələ haqqında hökm verməkdir. Hökmü nasslarla bildirilən məsələyə əsl (və ya əl-maqis aleyh), nasslarla hökmü bildirilməyən məsələyə isə fər′i (və ya əl-maqis), iki məsələ arasında olan ortaq özəlliyə isə illət deyilir. Beləliklə də qiyas ilə fər′in aralarındakı toplayıcı və ya bənzəri illətin olması səbəbi ilə fər′in əslin hökmünə daxil edilməsi, yəni bərabər tutulmasıdır. *(Bax: Şərhu əl-Kəvkəbul Munir, 4/6) (T.e)*

[236] *Qiyasul-əvla:* hökmdə fər′inin əsldən daha qüvvətli olduğu bir qiyasa deyilir. Məsələn, Allah azzə və cəllə İsra surəsi 23-cü ayədə valideynlərə "uf" deməyi qadağan etmişdir: ***"Rəbbin yalnız Ona ibadət etməyi və ata-ana ilə yaxşı davranmağı buyurmuşdur. Əgər onların biri və ya hər ikisi sənin yanında qocalıq yaşına dolarsa, onlara: "Uf!" belə demə, üstlərinə qışqırma və onlara xoş söz söylə!"*** Valideynlərə pis söz demək, onların üstlərinə qışqırmaq bu ayənin bildirməsi ilə haramdır və bu əsldir. Əgər onlara "uf" demək haramdırsa, onları vurmaq və əziyyət etmək daha öncəliklə haramdır və bu da fər'idir. Haramlıq fər'idə (yəni valideynləri döyməkdə) əslə (yəni onlara "uf" deməyə) nisbətən daha qevvətlidir. Bu şəkildə edilən qiyasa qiyasu-əvla (yəni daha öncəlikli) qiyas deyilir.

Burada böyük şirk məsələsi fər′idir, misal çəkilən məsələlər isə əsldir. Hökm isə cəhalətin üzrlü olmamasıdır. *(T.e)*

**İkinci: Qiyasu əş-Şəbəh**[237]

**-1)** Sələf hulul və ittihad əhlinin küfrü üzərində icma etmişdir. Çünki onlar Allahın bəzi məxluqlarının (daxilinə) yerləşdiyini iddia edirlər, Allah bundan ucadır! Eləcə də ilahlığın salehlərdə yerləşdiyini iddia edib onlara ibadət edənlər buna bənzəməkdədir.

**-2)** Sələf Allahı isim və sifətlərdə məxluqa bənzədənlərin küfrü üzərində icma etmişdir. Allahın məxluqlarından birisini ilahlıq sifətində Ona bənzədərək, Allahdan qeyrisinə ibadət edən kimsə də bunun kimdir.

**-3)** İnkarçı cəhmiyyənin küfrü, inkarçı qədəriyyənin və Allah üçün elm sifətini inkar edənlərin küfrü üzərində sələfin icması. Allahın uluhiyyət sifətini inkar edənlər və onu Allahın bəzi məxluqlarına verənlər də bunlar kimidir.

**-4)** (Böyük şirk işləyən kimsənin) Allah ilə istehza edən kimsənin üzərinə qiyas edilməsi qiyasu əş-şəbəhdir.**[238]** Belə ki, o (yəni istehza edən) icma ilə kafirdi və cəhaləti ilə üzrlü deyil. Müşrik də sələfin dediyi kimi şirk qoşması ilə Allah ilə istehza edir. Allahu Təala demişdir: ***"Allah pakdır, müqəddəsdir və mən müşriklərdən deyiləm!"***[239]

---

[237] *Qiyasuş Şəbəh:* Fər'in hökmdə fərqlənən bir neçə əslin arasında tərəddüd etməsi və onların hər birinə bənzər illəti özündə daşıması halında, onlardan ən çox bənzədiyi əslə qiyas edilməsidir. Burada böyük şirk məsələsi misal çəkilən məsələlərə ən çox bənzəməsi etibarı ilə qiyas edilir. *(T.e)*

[238] Yəni bənzədilərəkdən edilən qiyasdır. *(T.e)*

[239] Yusuf, 108

## 8-ci FƏSL :

## Batil (nəticələri) gərəkdirici şeylər haqqında

Böyük şirkdə cəhalətin üzrlü olması görüşü batil nəticələri gərəkdirir. Bunlardan:

-1) Yəhudi, nəsrani və onların avamlarının üzrlü sayılmasını gərəkdirir. Bu isə icmaya müxalifdir

-2) Fətrət əhlinin və ya onların bəzisinin üzrlü olmasını gərəkdirir. Bu isə icmaya müxalifdır.

-3) Münafiqlərin və avamlarının cahilliyinin üzrlü olmasını gərəkdirir. Bu isə sələfin icmasına müxalifdir.

-4) Cahil olaraq Allahın rübubiyyətini inkar edən hər kəsin üzrlü olmasını gərəkdirir. Bu isə sələfin icmasına müxalifdir.

-5) Allahın elmini cahil olaraq və ya təvil edərək inkar edənin üzrlü olmasını gərəkdirir. Bu isə sələfin icmasına müxalifdir.

-6) Cəhmilərdən Allahın isim və sifətlərini cahil olaraq inkar edənin üzrlü olmasını gərəkdirir. Bu isə sələfin icmasına müxalifidir.

-7) Bu sözün üzərinə[240] bu ümmətdən heç kimə nə rəsul tərəfindən, nə də Quran ilə hüccətin çatmadığını (deməsi) gərəkdirir.

**Şeyx Suleyman ibni Sahman** öncə keçən gərəkdirici şeylərin batilliyinin izahı barədə *"Kəşfuş-Şubhəteyn"* kitabında demişdir: "***bunların hamısında (yəni böyük şirkdə) təkfirin əngəllənməsi və xəta ilə günahlandırılması Allahın zatını inkar edəni, rübubiyyətini inkar edəni, isim və sifətlərini inkar edəni, Allahu Təalanın uluhiyyətinin birlənməsini inkar edəni, Qədəriyyələrin ğulatları kimi "baş verənlər olmazdan öncə Allah olacaqları bilməz" deyənləri, hadisələri yüksək ulduzlara isnad edənləri və iki əslin işıq və zülmətdən ibarət olduğunu deyənləri[241] təkfir edənləri rədd etməkdir. Bunların hamısına bağlı qalan kimsə yəhudi və nəsranilərdən daha azğın və daha kafirdir"***

Aləmlərin Rəbbinə həmd olsun! Peyğəmbərimiz Muhəmməd (səllallahu aleyhi və səlləm)-in, ailəsinin və bütün əshabının üzərinə salat olsun!

[240] Yəni böyük şirkdə cəhalətin üzrlü olduğunu iddia edənin həmin sözünün üzərinə. *(T.e)*
[241] Onlar məcusilərdir. Kainatdakı bütün işlərin iki əsldən ibarət olduğunu və bu iki əslin üzərində döndüyünü iddia edirlər. Həmin iki əsl xeyir və şər, fayda və zərər kimi qisimlənir. *(T.e)*

# Fihrist

Şeyx Muhamməd ibni Abdulvəhhabın risalələri və mətnləri şeyxin cəhaləti üzrlü saymadığını göstərir və şirk işləyən kimsəni müşrik adlandırır, müşriklərdən olduğunu bildirir. Şeyx Muhammədin yanında bəzən küfr ismi ilə hüccət iqamə edilmədiyi zaman şirk mənası qəsd olunur. Ancaq hüccət iqamə edilmişsə o zaman müşrik kafir olaraq adlandırır. Burada hüccət iqaməsindən öncəki isimlər ilə sonrakı isimlər arasındakı fərqə bəlkə təəccüb edərsən, lakin bu haqqdır və əhli sünnənin məzhəbidir. Necə ki, bunu İbni Teymiyyə (Fətava, 20/37-38)-də nəql etmişdir. Hansı ki, həmin iki səhifə boyunca necə deyərlər qızıl suyu ilə yazılmış incilər vardır. Bu, həmçinin İbnul Qayyimin və dəvət imamlarının yoludur. Onların hamısı bunun üzərində icma nəql etmişlər. Necə ki, bunu inşəallah (irəlidə) dəvət imamlarının sözlərini axıra kimi oxuyub bitirdiyin zaman çox görəcəksən.